# BİSMİLLAHİR-RƏHMANİRRƏHİM

# MƏXZƏNÜL-ƏSRAR

**Fars dilindən tərcümə edəni:** ***Mircəlal Zəkiyev***

**Redaktoru:** ***Əhmədağa Əhmədov***

**Naşir:** ***Hacı Kamal Novruz***

**Korrektor:** ***Məryəmxanım Mircəlal qızı***

**Kompyuterdə yığdı və səhifələdi:** ***Polad Zərbəliyev***

## MÜTƏRCİMDƏN

Hələ əsrimizin əvvəllərində Nizami əsərlərinin doğma dilimizə tərcümə olunmasını arzu edən mərhum Firidun bəy Köçərli deyirdi:

«Şeyx Nizami böyük şairlərdən biri olub, onun kimi fəsih, rəvantəb' və şirinzəban dünya üzünə az gəlibdir. Onun cümləyə məşhur olan «Xəmsə»si ki, ona «Pənc gənc» deyirlər, bimisl və binəzirdir...

İnsaf deyil ki, onun mö'cüznüma kəlamları Avropa dillərinə tərcümə olunub intişar tapsın, bizlər isə onu öz dilimizdə mütaliə edib feyzyab olmaqdan məhrum olaq».[1]

Mə'lum olduğu kimi, artıq böyük şairin əsərlərinin elmi-tənqidi mətnləri tərtib olunmuş və həmin mətnlər əsasında alimlərimiz bu poemaların filoloji tərcümələrini hazırlamışlar. Əlbəttə, hörmətli alimlərimizin ağır zəhmət tələb edən gördükləri bu iş Nizami irsinin tərcümə və tədqiqi sahəsində qiymətli və təqdirəlayiqdir.

Lakin, bu poemaların ayrı-ayrılıqda hər birinin tərcüməsində istənilən qədər nöqsanlar vardır və bu nöqsanlar əsasən tərcümə edən alimlərin ehtiyatsızlığı və diqqətsizliyi üzündən baş vermişdir. Biz bu barədə geniş bəhs etmək fikrində deyilik və məqsədimiz mövcud filoloji tərcümələrin ümumi mənzərəsini qeyd etməkdir.

Qeyd edək ki, bu vəziyyət bu və ya digər şəkildə Nizami haqqında yazılmış tədqiqat əsərlərində də mövcuddur. Hörmətli nizamişünas alim R.Azadə xanım «Nizami Gəncəvi, həyatı və sənəti» adlı monoqrafiyasında ilk səhifənin yuxarısında fars əlifbası ilə yazır:

Babel-e mən Gənce-ye Harutsuz[2] - və aşağısında həmin misranın tərcüməsini verir:

Gəncə mənim Harutu yandıran Babilimdir

Misranın bu şəkildə tərcüməsindən bir məzmun hasil etmək olmur və oxucu Nizaminin nə demək istədiyini dərk edə bilmir.

---

[1] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı tarixi materialları. I cild. Bakı, 1925, səh. 68.

[2] R.Azadə. Nizami Gəncəvi, həyatı və sənəti. «Elm» nəşriyyatı. Bakı-1979, səh.3.

Təəssüf ki, çox kəslər böyük şairin yüzlərlə beytini oxuyur və güman edir ki, başa düşür.

Bu misranın mə'nasını anlamaq üçün şairin Gəncədə şəhrbənd (dustaq) olduğunu xatırlamaq lazımdır. Şair «Məxzənül-əsrar» («Sirrlər xəzinəsi») məsnəvisinin «Məlik Fəxrəddin Bəhramşahın mədhi» fəslində deyir:

Mən ke dər in daere-ye dəhrbənd
Çon gereh-e noqte şodəm şəhrbənd
*Mən dəhrin bağladığı bu dairədə*
*Nöqtənin düyünü kimi dustaq olmuşam.*

Həmçinin, «Bülbül və şahin» dastanında deyir:

Bər məkəş avaze-ye nəzm-e bolənd
Ta ço Nezami nəşəvi şəhrbənd
*Gözəl şerinin avazını bülənd etmə,*
*Yoxsa, Nizami kimi dustaq olarsan.*

Nəhayət, bu kitabın sonunda:

Gənce gereh kərde geriban-e mən
(Gəncə mənim yaxama dügün vurmuşdur)

– deyə nalə edir. Şair ömrünün axırına qədər bütün əsərlərində Gəncədə şəhər dustağı olmasından şikayət edir və «Şərəfnamə» məsnəvisində Peyğəmbər əleyhissəlama xitabən deyir:

Nezami ke dər Gənce şod şəhrbənd
Məbad əz səlam-e to nabəhremənd

*Gəncədə dustaq olan [bu] Nizami*
*Sənin səlamından bəhrəsiz olmasın!*

Bunları bildikdən sonra şairin fikrini anlamaq və onun nə demək istədiyini başa düşmək olur:

Allah-təalanın fərmanı ilə yerə göndərilən Harut və Marut adlı iki mələk Zöhrə adlı bir qadınla nalayiq hərəkətlər edirlər və yer üzündə cadugərliyi yayırlar. Bu və digər bəd əməllərinə görə onlar Qiyamət gününə qədər Babil quyusunda başı aşağı asılmış vəziyyətdə qalacaqlar.

Nizami kimi bir söz sehrkarının yaşadığı Gəncə şəhəri Harutu yandırır, yə'ni Harut öz-özünə yanır və həsəd aparır ki,



Gəncə şəhərində Nizami kimi söz sehrkarı olan bir şair vardır. Nizami isə fəryad edib deyir ki, Gəncə mənim üçün Babil və Babil quyusu kimidir:

Harutu yandıran Gəncə mənim Babilimdir

– yəni mən bu şəhərdə dustaq olmuşam və bir yana çıxa bilmirəm. Misranı məhz belə tərcümə etdikdə şairin nə demək istədiyini anlamaq və sözdə olan rəmz və mənanı başa düşmək olur.

Nizami kimi böyük bir şairin sən'ətindən bəhs edərkən daha ehtiyatlı və diqqətli olmaq lazımdır. Başqa sözlə, əgər şerin tərcüməsində təşbih, məcaz, kinayə və s. bədii ifadə vasitələri qorunmasa, onun bədii xüsusiyyətlərindən danışmaq mümkün deyildir.

Azadə xanım yuxarıda adını çəkdiyimiz monoqrafiyasında Nizami şe'rinin üslub xüsusiyyətləri, bədii obrazlar aləmi və onların təqdimindən bəhs edərkən şairin «Məxzənül-əsrar» məsnəvisindən aşağıdakı parçanı misal gətirir:

Sər nəkəşəd şax-e nov-e sərvbon
Ta nəzəni gərdən-e şax-e kohon
Ta nəşəvəd bəste ləb-e cuybar
Pənce-ye də'vi nəqoşayəd çenar
Ta nəkoni rəhqozər-e çeşme pak
Ab nəzayəd ze delo çeşm-e xak[1]

– və tərcüməsini aşağıdakı kimi verir:

Köhnə budaqları kəsib atmasan
Köklü sərvin yeni şaxəsi göylərə baş qaldırmaz.
Arxın qabağı tutulmazsa
Çinar qol-qanad atmaz
Çeşmənin gözünü arıdıb təmizləməsən,
Torpağın qəlb və gözündən (təmiz) su gəlməz.

Hər bir mülahizə edən kəs diqqət etsə görər ki, bu tərcümə elmi-filoloji yox, mənsur tərcümədir və deyilməsə də aydındır ki, sən'ət və sən'ətkarlıqdan bəhs edərkən mənsur tərcümə me'yarı ilə danışmaq olmaz.

---

[1] R.Azadə. Göstərilən əsəri, səh. 109.

Əvvəlcə qeyd edək ki, alim birinci misranın axırında olan «sərvbron» ifadəsini «sərv-e bon» kimi oxumuş (və. başa düşmüşdür) və «köklü sərv» kimi quraşdırıb tərcümə etmişdir. Halbuki, «sərv-e bon» mə'nasız söz birləşməsidir və fars dilindən az-çox xəbəri olan hər bir kəs bu izafəti qəbul etməz.

Sərvbon – sərv ağacı deməkdir və klassik ədəbiyyatda gözəl qamətin sərv ağacına təşbih olunması məşhurdur. Firdovsi deyir:

Ço əz xab bidar şod sərvbon
Be Sindoxt boqşad ləb bər soxon

Elə ki [o] sərv [qamətli] yuxudan oyandı,
Ağız açıb Sindoxt ilə sözə başladı.

Burada isə Nizami «sərvbon» ifadəsi ilə cavan şahzadənin məmləkətinə işarə edir və demək istəyir ki, məmləkətin əmin-amanlığını, sərv kimi təravət tapmasını və ucalmasını tə'min etmək üçün bir neçə təcavüzkarın (köhnə budağın) boynunu vurmaq lazımdır.

İkinci beytin birinci misrasında arxın qabağının tutulmasından yox, arxın ağzının bağlanmasından söhbət gedir və şair səltənətə müxalif olan təcavüzkarların e'tiraz ağzının bağlanmasının (yə'ni, öldürülməsinin) zəruri olmasına eyham edir. Bu beytin ikinci misrasında isə çinarın qol-qanad atmasından yox, də'va (iddia) pəncəsi açmasından bəhs olunur. (çinarın yarpaqları insan pəncəsi şəklindədir)

Üçüncü beytdə isə şair çeşmənin gözündən yox, çeşmənin yolundan danışır, çeşməni və onun yolunu torpağın ürək və gözünə təşbih edir.

Gördüyümüz kimi, alimin etdiyi bu tərcümə ilə Nizami şe'rinin üslub xüsusiyyətləri, bədii obrazlar aləmi və onların təqdimindən bəhs etmək mümkün deyildir. Əlbəttə, Azadə xanım bəlağət elmlərinə az-çox bələd olsaydı, misal gətirdiyi parçanı dürüst tərcümə edərdi və Nizami sən'ətindən elmi şəkildə bəhs edərdi.

Alimin yuxarıda misal gətirdiyi parçanın filoloji tərcüməsi aşağıdakı kimi olunmalı idi:



Köhnə budağın boynunu vurmasan,
Sərv ağacının yeni budağı [yuxarı] baş çəkməz.
Arxın ağzı bağlanmasa,
Çinar də'va (iddia) pəncəsi aça bilməz.
Çeşmənin yolunu təmizləməsən,
Torpağın ürək və gözündən su çıxmaz.

«Xəmsə»nin bədii tərcümələri daha aşağı səviyyədədir. Mə'lum olduğu kimi, bu tərcümələr mövcud filoloji tərcümələr əsasında olunmuşdur. Mütərcimlər orijinaldan istifadə edə bilmədikləri kimi bu poemaların əruz vəznində olan bəhrlərini də saxlamamış, heca vəznində tərcümə etmişlər və ümumiyyətlə bu tərcümələr haqqında yüksək fikir söyləmək mümkün deyildir. Başqa sözlə, şairlər tərcümədə xeyli təhrif və sərbəstliyə yol vermiş, hətta əksər hallarda misraları qafiyələndirə bilməmişlər.

Bu baxımdan «Məxzənül-əsrar» məsnəvisinin tərcümələri (bu əsər müxtəlif dövrlərdə bir neçə şair tərəfindən tərcümə olunmuşdur) daha acınacaqlı vəziyyətdədir.

Bu poemanın tərcümələri içərisində eləsi vardır ki, onu oxuduqda xəcalət çəkməmək olmur və buna nə tərcümə, nə iqtibas, nə də şe'r demək mümkün deyildir.

Maraqlıdır ki, belə bir tərcümə müəllifi öz tərcümə etdiyi əsərə müqəddəmə yazır (əslində bu, müqəddəmə yox, tərcümə olunan əsərə yazılan «gözəlləmə»dir) və bu müqəddəmədə xəcalət çəkmədən özünü iste'dad və şəxsiyyətcə Nizamiyə tay hesab edir. Halbuki, müqəddəmədə özünü Nizamiyə tay edən mütərcim son dərəcə şit, bayağı, bəzən gülünc, poeziyadan uzaq və bir ovuc söz yığınından başqa bir şey olmayan misraları Nizami adı altında oxucuya təqdim etməklə Nizamini öz tayı edir!! Bu tərcüməni oxuduqda xalqımızın böyük şairi M.Ə.Sabirin «Öylə bir tərcümə ki. .» taziyanəsi yada düşür.

Təəssüf ki, bəhs etdiyimiz bu tərcümə haqqında (hərçənd ki, buna tərcümə demək olmaz) yüksək fikirdə olan nizamişünas alimlərdən biri hətta vaxtilə «Ədəbiyyat və incəsənət» qəzetində məqalə ilə çıxış da etmişdir.

Şairin «Məxzənül-əsrar» mənzuməsinin bu günə qədər ayrı-ayrı alimlər tərəfindən bir neçə elmi-tənqidi mətni hazırlanmışdır. Bunlardan bizə məlum olan – Azərbaycan alimi Ə.Ə.Əlizadənin, məşhur nizamişünas İran alimi Vəhid Dəstgirdinin və digər

görkəmli nizamişünas İran alimi Behruz Sərvətiyanın hazırladığı mətnlərin adlarını çəkə bilərik.

Qeyd edək ki, bir neçə il əvvəl məşhur şərqşünas professor Rüstəm Əliyev «Məxzənül-əsrar» poemasının iki qədim əlyazma nüsxəsini aşkar etmişdir ki, bunlardan biri London muzeyində saxlanılır və alimin dediyinə görə, şairin vəfatından 37 il sonra yazılmışdır. Digəri isə Leninqradın Ermitaj kitabxanasında olan və alimin qeyd etdiyinə görə indiyə qədər elm aləminə məlum olmayan əlyazma nüsxədir. (710-cu il. h.q.)

Professor Rüstəm Əliyev bu nüsxələri əsas mə'xəz kimi qəbul edib, yuxarıda adlarını çəkdiyimiz Ə.Ə.Əlizadə və Vəhid Dəstgirdi mətnlərini də tədqiqata cəlb edərək müqayisə aparmış (bə'zi qədim sözlərin və çətin beytlərin bərpasında Behruz Sərvətiyanın mətnindən də istifadə etmişdir) və həmin mətnlərlə fərqini göstərərək gələcək tədqiqatlarda çox qiymətli ola biləcək bir mətn hazırlamışdır. Bu kitab alimin vəfatından sonra (1374-cü il. h.ş.) Tehranda çap olunmuşdur.

Professor Rüstəm Əliyevin hazırladığı bu mətn həqiqətən qiymətli mənbə'dir və bizim istifadə etdiyimiz (və aşağıda adını çəkəcəyimiz) mətnə xeyli yaxın olmasına baxmayaraq, bə'zi məqamlarda onunla ayaqlaşa bilmir və nisbətən aşağı səviyyədədir.

Biz bu əsərin tərcüməsində İran alimi Bərat Zəncaninin tərtib etdiyi mətni[1] daha e'tibarlı mənbə' kimi qəbul etdik və onun əsasında bu poemanı bilavasitə orijinaldan tərcümə etdik. Tərcümədə əsərin məzmununa və bədii xüsusiyyətlərinə mümkün qədər sadiq qalmağa cəhd etdik. Bu işdə nə qədər müvəffəq olduğumuz barədə danışmaq bizə münasib deyil və az-çox nə hasil etmişiksə onu ğənimət hesab edirik. Başqa sözlə, bu böyük şairin əsərini tərcümə etməkdə cəsarət etmişik və bu tərcümədə bizim cəsarətimiz qədər xəcalətimiz vardır.

Nizaminin əsərdə işlətdiyi Qur'an ayələrindən və hədislərdən edilən iqtibaslar ərəbcədir və biz də tərcümədə onları olduğu kimi saxladıq ki, tərcümə etməyə ixtiyarımız yox idi və kitabda verdiyimiz şərhlərdə izah etdik.

[1] Əhval o asar o şərh-e Məxzən-ül əsrar-e Nezami Gəncəvi. Tə'lif: Doktor Bərat Zəncani. Tehran, 1368. h.ş.



Kitabda verdiyimiz şərhlər əsasən istifadə etdiyimiz mətndən və qismən, zəmanəsinin yeganəsi və mə'rifət dəryasının dürdanəsi, riyazi və ədəb elmlərinin, təbiət və şəriət elmlərinin kamil bilicisi, universal alim Əhmədağa Əhmədovun «Nizami-elmşünas» kitabındandır. Qeyd edək ki, hələ bu günə qədər heç bir məmləkətdə Nizami sən'ətindən belə əhatəli, yüksək səviyyədə və elmi şəkildə bəhs edən bir əsər yazılmamışdır.

Bə'zi hallarda şərhlərdə biz də iştirak etmişik; amma, bunlar nəzərə alınacaq dərəcədə çox deyildir. Qeyd edək ki, istifadə etdiyimiz mətndəki şərhlərdə olan bə'zi yanlışlıqları və nöqsanları islah etdik; həmçinin, bə'zi şərhlər Nizami əqidəsinə tamamilə yad olduğundan onları bu kitabda vermədik.

Biz Nizaminin son dərəcə yüksək bəlağət və fəsahətlə qələmə aldığı bu əsəri böyük şairin sən'ətinə olan sonsuz məhəbbətlə tərcümə etdik. Tərcümədə klassik şe'rimizin xüsusiyyətlərinə müvafiq və Nizamiyə layiq olmaqdan ötrü bə'zi müasir sözlərə və yazı qaydalarına (orfoqrafiyaya) riayət etməyi münasib bilmədik.

**Mircəlal Zəkiyev**
**18 mart-1999**

# MÜQƏDDİMƏ ƏVƏZİNƏ

Şeyx Nizami Gəncəvi dünya ədəbiyyatı səhifələrində özünə şərəfli yer tutmuş bir simadır ki, səkkiz əsrlik bir müddətdə bu şərəf və şöhrət onun adının bu mövqeyə layiq olduğunu sübut etmişdir.

Əsərlərinin müxtəlif illərdə çap olunmuş nüsxələrində onu «Həkim Nizami» adlandırırlar. Bu rütbə ondan yaranmışdır ki, Nizami sadəcə bir şair deyil, hikmət əhlidir, filosofdur, müxtəlif təbiət elmlərinin və dəqiq elmlərin, eləcə də bütün humanitar elmlərin, hətta təbabət elminin də kamil bilicisidir.

Nizami islam dini fəlsəfəsinə, onun «üsul» və «füruatı»na, Qur'an, hədis və fiqh elmlərinə tam müsəllət olan nadir bir şəxsiyyətdir. Onun şəxsində «elmi-ədyan» ilə «elmi-əbdan» mərkəzləşərək xariqül'adə bir ustad, sən'ət, söz, şer və elm dahisi vücudə gəlmişdir.

Dünya korifeyləri cərgəsində olsa da, Nizami ilk növbədə bizimdir; o, Gəncə torpağında dünyaya gəlib, azərbaycanlıdır. Biz onunla fəxr etməliyik, onu hamıdan yaxşı tanıyıb qiymətləndirməli, tükənməz irsindən bəhrələnməli, həm də onu gənc nəsillərə iftixarla öyrətməliyik, bu şəxsiyyətdən ibrət almalıyıq.

Amma çox təəssüf ki, səkkiz əsr müddətində öz soydaşları Nizami haqqında ona layiq olan heç bir iş görməmişlər; adına muzeylər, xiyabanlar, bağlar salınmış, heykəli ucaldılmışsa da, onun haqqında «Nizami böyük dahi şairdir» sözlərindən artıq bir şey deyilməmişdir. Onun yubileyləri ümumi sözlər, quru tə'riflərlə başa vurulub yola salınır, ancaq onun elm və sən'ətinə aid olan sanballı bir əsər nümunəsi nümayiş etdirilmir. Onun «dahi şair» olmasının sirri açılmır ki, açılmır.

Bunun səbəbi nədir?

Adətən, Nizami tədqiqatçıları, onun əsərlərini orijinalda oxuyub tərcümə və təhlil edənlər filoloqlardır; onlar isə Nizaminin yuxarıda adı çəkilən elm sahələrinə aid sözlərindən – hey'ət, nücum, kosmologiya, geologiya və s. məsələlərindən xəbərsizdirlər. Həmçinin, müasir nizamişünas filoloqlarımız Kommunist rejimi illərində formalaşmış, din, islam, Qur'an, hədis, Peyğəmbər sözlərini işlətməkdən qorxan, çoxları isə belə şeylərə nifrət edən kəslərdir. Təbiidir ki, belə kəslər Nizami



əsərlərində «əridilmiş» Qur'an ayələrini və hədisləri, onların necə məharətlə işlədilməsini dərk edə bilməzlər, buna heç meyl də göstərməzlər.

Nizaminin elm dəryasında araşdırdığı məsələləri təbiət elmləri sahəsində çalışan mütəxəssislər daha yaxşı dərk edərlər. Təəssüf ki, onlar da ədəbiyyat və şe'r aləminə biganədirlər, belə məsələlərlə maraqlanmırlar. Maraqlansalar da, Nizami əsərlərinin tərcüməsini oxuyacaqlar; mütərcimlər isə özləri də bu elmlərdən xəbərsiz olduqları üçün Nizaminin elmi məsələlərini dərk etməyib, böyük təhriflərə yol verərək, Nizaminin qoyduğu elmi mətləbi tərcümə mətnində oxucuya çatdırmırlar.

Bu cəhətlərdir Nizamini öz soydaşlarından ayırıb biganə edən, onu qədrsizləşdirən!

Nizami əsərlərindəki elmi məsələlərin nəsrlə edilmiş filoloji tərcümələrində rast gəldiyimiz nöqsanlar və nadürüst ifadələr həddən artıqdır. Əsərlərin poetik tərcüməsinə gəldikdə, dözülməz mənzərəyə rast gəlirik.

Nizaminin hər poemaya münasib, onun məzmununa müvafiq olan bir bəhrdə, əruzun gözəl bir vəznində yazdığı əsəri mütərcim heca vəznində tərcümə edərək, onun bütün ruhunu öldürür. Bundan əlavə, bu poemaları nəzmə çəkənlər orijinaldan deyil, təhriflərlə dolu olan sətri tərcümədən istifadə edərək, özləri də istənilən qədər təhriflər edirlər.

Hələ «yaxşı» hesab etdikləri «Leyli və Məcnun» poemasının poetik tərcüməsində nə biabırçılıqlar var! Bu tərcümə Nizami adına böyük bir ləkədir. Nizaminin digər əsərlərinin poetik tərcümələri də bu vəziyyətdədir.

Nizami «Xəmsə»sinin ilk mənzuməsi olan «Məxzənül-əsrar» bu əsərlər çələngində bir dəstə yaraşıqlı qızılgülmü deyim, ya ki «Xəmsə» boyunbağısında parlaq bir qaşmı deyim, tərcümə mətnində heçə endirilmiş, böyük təhriflərlə o möhtəşəm bina viyran edilmişdir.

Bütün bunlar Nizami pərəstişkarlarını, onun qədrini bilənlərin qəlbini incidir, yaralayır. Belə tərcümələrin olmaması olmasından yaxşıdır, çünki belə mətnlər Nizamini təhqir etməkdən başqa bir şey deyildir.

Təhriflərlə dolu belə tərcümə mətnləri bizim müasir üzdəniraq «peşəkar» filoloq şairlərimiz tərəfindən meydana çıxarıldığı halda, Nizamini qiymətləndirən, onun qədrini bilən və sən'ətinin

qarşısında baş əyən Mircəlal Ağa Nizamiyə olan hörmət və səmimiyyət, eləcə də öz xalqına və dilinə olan məhəbbət və ehtiram əlaməti olaraq «Məxzənül-əsrar»ın yeni poetik tərcüməsini təqdim etmişdir. O, nə peşəkar filoloqdur, nə də peşəkar şairdir, texniki təhsili olan təvazö'kar, sadə bir şəxsdir. Lakin Nizami sən'ətinin vurğunu olmaqla fars dilinə, onun incəliklərinə tam müsəllətdir, bəlağət elmlərinin, bədiiyyatın, şe'r mühəssənatı və rümuzatının bilicisidir.

O, uzun illər boyu böyük zəhmətə qatlaşaraq bu məs'ul işə başlamış, məqsədi də bu olmuşdur ki, Nizaminin bu əsərini onun adına layiq şəkildə nəzmlə tərcümə etsin, onda olan sən'ənkarlığı, eləcə də orijinaldakı vəzni saxlamaqla öz soydaşlarına çatdırsın.

Nizami fars dilinin geniş imkanlarından və eləcə də söz üzərində apardığı əməliyyatlardan istifadə etdiyi kimi, mütərcim də Nizami şiyvəsini rəhbər tutaraq azəri dilinin bütün imkan və xüsusiyyətlərini səfərbər etməklə öz məqsədinə nail olmuşdur.

Şe'r haqqında Nizaminin beytlərini mütərcim belə ifadə edir:

Şər' ilə hazir elə əvvəl hüzur,
Şe'r ilə et Ərş tərəf sonra şur!
Şər' ilə şe'rin elə mə'va tutar
Ki, kəmərin sayəsi Cövza tutar.
Şe'r sənə Sidrədə dövlət verər,
Mülki-məanidə səadət verər.
Şe'r qılır hasil əmirlik, məqam,
«K-əşşüəraü ümərаül-kəlam.»

Sonuncu misra Rəsuli-Əkram(s) cənablarının kəlamıdır.

Nizami bildirir ki, öz şerlərini Qur'anın «Şüəra» surəsində məzəmmət etdiyi müşrik şairlərin şiyvəsində deyil, Rəsuli-Əkrəmin (s) buyurduğu kəlama müvafiq surətdə qurur.

Beləliklə, Nizami şairin rolunu və şe'rin yolunu istiqamətləndirir və ədəbiyyatın nəyə xidmət etməli olduğunu müəyyənləşdirir.

Böyük şair şe'r xirmənini yeldən-yelə verməməyi və söz (şairlik) riştəsini əldən-ələ salmamağı tə'kidlə tövsiyə edir:

Vermə bu xirmən gedə yeldən-yelə,
Qoyma bu riştə düşə əldən-ələ!

Şair bu fikri «İskəndənamə» məsnəvisində belə ifadə edir:



Soxən qoftən-e bekr can softən əst
Nə hər kəs səza-ye soxən qoftən əst

Tərcümə:

Bikr söz demək can [dürrünü] deşməkdir,
Hər kəs söz deməyə layiq deyil.

Nizami sözə çox yüksək qiymət verdiyi üçün onun qorunmasını və dəyərsiz sözlərin şe'rə yol verilməməsini tapşırır. Bu tapşırıq mütərcimin ünvanına da şamildir. Odur ki, mütərcimin bəlağət elmlərinə, söz sən'ətinə kifayət qədər bələd olması tərcümənin bədii keyfiyyətinin yüksək olmasına öz tə'sirini göstərir.

Misal üçün, Nizami deyir:

Kist dər in dəstgəh-e dirpay
K-u «limənil-mülk» zənəd coz Xoday

Mütərcim bu beyti belə ifadə edib:

Baqi bu mülk içrə Xudadən səva
Kim «limənil-mülk» desə, olmaz rəva.

Orijinalın birinci misrasında «mülk» sözü olmadığı halda, mütərcim beytin zahiri gözəlliyini və bədii tə'sirini artırmaq xatirinə həmin sözü, sanki, şe'rin «tələbinə» görə işlədir.

Bu mə'nada başqa bir beytə nəzər salaq:

Fetne foru koştən əz u delpəzir
Fetne şodən niz bər u naqozir

Tərcümə:

Fitnə yatırmaq ona rəftardır,
Fitnə olanlar ona naçardır.

İkinci misrada «fitnə olanlar» – «məftun olanlar» mənasındadır; odur ki, «fitnə» sözü beytdə cinas kimi işlənmişdir. Burada mütərcim poetika qanunlarına müxalif hərəkət etməmiş, beytin gözəlliyini saxlamışdır.

Mütərcim hər yerdə Nizami şe'rinin səbkini, ruhunu və ahəngini saxlamağa cəhd etmiş və demək olar ki, həmişə müvəffəq olmuşdur.

Nizami deyir:

Əcz-e fələkra be fələk vanomay
Eqd-e cəhanra ze cəhan vaqoşay

Nəsx kon in ayət-e əyyamra
Məsx kon in surət-e əcramra
Hərf-e zəbanra be qələm baz deh
Vam-e zəminra be ədəm baz deh

Bu beytlər belə tərcümə edilib:

Poz bu fələkdən bu fələk tağını,
Aç bu cahandan bu cahan bağını.
Əyyam əlamətlərini pünhan et,
Ulduz iqamətlərini viyran et.
Dildə ki söz var, qələmə tuş qıl,
Gildə ki borc var, ədəmə tuş qıl.

Burada mütərcim Nizami məzmununa sadiq qalmaqla bərabər şe'rin ahəngini və beytlərdə olan «tərsi» sən'ətini də saxlaya bilmişdir.

Nizami şe'ri nəzirsiz fəsahət və nadir sən'ət nümunəsidir. Böyük şair bə'zən elə kinayələr işlədir ki, onları tərcümədə vermək mütərcimdən böyük hünər tələb edir. Qeyd edək ki, mütərcim nadir hallarda Nizaminin işlətdiyi tərkib və bədii ifadələri saxlaya bilməmişdir. Amma bu qəbildən olan beytlərdə də müvafiq ifadələr tapıb işlətmiş və tərcümənin öhdəsindən məharətlə gəlmişdir.

Nizami «Me'rac» bəhsinin əvvəlində deyir:

Nimşəban k-an məlek-e nimruz
Kərd rəvan məş'əl-e gitiforuz
Xod fələk əz dide əmariş kərd
Zohre vo məh məş'əledariş kərd
Kərd rəha dər hərəm-e kaynat
Həft xət o çar həd o şeş cəhat

Tərcümə:

Yarı gecə ki o günüz sərvəri,
Etdi rəvan nur saçan gövhəri,
Oldu rəvan təxti fələklər gözü,
Məş'əl idi Zöhrə özü, Ay özü.
Çıxdı yətim dürr, qalıb boş sədəf,
Yeddi fələk, altı cəhət, dörd tərəf.

Sonuncu beytin orijinalında «yətim dürr» sözü yoxdursa da mütərcim birinci misrada Peyğəmbər əleyhissəlamın cavanlıqda «yətim Mühəmməd» adı ilə məşhur olmasına işarə edərək bu gözəl bədii ifadəni yaratmışdır.



Mütərcim bə'zən beytin məzmununu tam əhatə etsə də, onda olan gözəlliyi verə bilmir və əlbəttə, burada hər iki dilin xüsusiyyət və imkanlarını nəzərə almaq lazımdır:

Dər təbəq-e məcmər-e məclesforuz
Ud şəkərsaz o şəkər udsuz

Tərcümə:

Ud təbəqdə qarışıb şəkkərə,
Şəkkəri ud ilə yaxır məcmərə.

Bu beytin tərcüməsində Nizami şe'rində olan gözəllik olmasa da, beytdə «müra'atün-nəzir», «rəddül-əruz ələl-ibtida» sən'əti işlənmişdir və elə ardınca gələn beytlərin nə qədər yüksək sən'ətkarlıqla tərcümə olunmasının şahidi oluruq:

Şişe ze collab qohər mifeşand
Şəm' be dəstarçe zər mifeşand
Əz pey-e noqlan mey-e busexiz
Çeşm o dəhan şəkkər o badamriz
Şəkkər o badam behəm noktesaz
Zohre vo Mirrix behəm eşqbaz
Və'de be dərvaze-ye quş aməde
Xənde be dəryuze-ye nuş aməde

*Tərcümə:*

Şişə gülab-qənd ilə gövhər səpir,
Şəm' də əmmamə ilə zər səpir.
Meylə noğul busə üçün can atır,
Gözlə dodaq şəkkərə badam qatır.
Şəkkər uzun nüktədə badam ilə,
Zöhrə uyub eşqdə Bəhram ilə.
Və'də qulaq üstə gəlir müjdəyə,
Xəndə dodaq üstə gedir sədqəyə.

Nizaminin təsvir təxəyyülü çox qüvvətli olduğundandır ki, şe'rə yüzlərlə yeni təşbih, istiarə və tərkiblər gətirmişdir. Bu xüsusiyyəti bə'zən mütərcimdə də görürük və bu baxımdan aşağıdakı beytə diqqət yetirək:

Hər ke neqarənde-ye in peykər əst
Bər soxənəş zən ke soxənpərvər əst

*Tərcümə:*

Kim ki bu cür nəqş ilə peykər çəkər,
Tə'rif et o lə'li ki, gövhər çəkər.

Mütərcim orijinalda olan «soxənpərvər» (şair) sözünü tərcümədə «gövhər çəkən lə'l» kimi işlətmiş və bədii dilimizə yeni tərkib gətirmişdir.

Həmçinin, mütərcim doğma dilimizin imkanlarından bacarıqla istifadə etmişdir:

Xiz Nezami ze həd əfzun geri
Bər del-e xunab-şode xun geri

*Tərcümə:*

Qalx, Nizami kimi ol ağlağan,
Bağrı qan olmuşlar üçün ağla qan.

Mütərcim orijinalda olan «ze həd əfzun geri» (həddən artıq ağla) ifadəsini tərcümədə «ağlağan ol» ifadəsi ilə vermiş və bununla da beytdə cinas yaratmışdır.

Yaxud:

Seydgəri bud əcəb tizbin
Badiyepeymayo mərahelqozin

*Tərcümə:*

Vardı bir ovcu, dolanan düzləri,
Həm özü ovçuydu, həmi gözləri.

Burada Nizami ovçunun gözlərinin iti olmasını «tizbin» (iti görən, yaxşı görən) sözü ilə ifadə edir. Əlbəttə, bu sözün hərfi tərcüməsini şe'rə gətirmək yaramaz; odur ki, mütərcim dilimizdə olan «gözün ovçu olması» ifadəsini işlədərək, dilimizin imkanlarını nümayiş etdirmişdir.

Tərcümədə bu və digər qəbildən olan nümunələrə kifayət qədər rast gəlirik.

Tərcümədə təhrif və sərbəstliyə qət'i olaraq yol verilməmişdir. Mütərcim əvvəldən axıradək hər beytin tərcüməsinə məs'uliyyətlə yanaşmış, orijinalın səbkini, ruhunu və ahəngini saxlamağa, Nizaminin işlətdiyi zərif, bədii obrazları azəri dilində verməyə müvəffəq olmuşdur. Əsərin zəngin dilini, təşbih, istiarə, kinayə və s. bədii ifadə vasitələrini verə bilmiş və azəri bədii dilinin leksikasını zənginləşdirmişdir.

Bu tərcümə azəri dilinin mükəmməl, zəngin və poetik bir dil olduğunu nümayiş etdirir və insafən, bədii tərcümə ədəbiyyatımıza çox qiymətli və nümunə ola biləcək bir hədiyyədir.

Əsəri bu səbkdə tərcümə etməklə mütərcim çox nəhəng bir problemi həll etmiş, bədii tərcüməçilik sən'ətində yeni bir çığır



açmışdır. Arzu edirik ki, gələcəkdə «Xəmsə»nin digər məsnəvilərini də bu cür canfəşanlıqla tərcümə etməyə təşəbbüs göstərsin; ta ki, Nizami sən'əti qabarıq şəkildə zahirə çıxsın və Nizami şəxsiyyəti tam görkəmi ilə xalqımızın nəzərində təcəssüm etsin.

Bu yolda mütərcimə uğurlar arzulayırıq.

**Əhmədağa Əhmədov**
**21 iyul, 1999**

Bismillah-ir rəhman-ir rəhim
Layiq olur ki, aça gənci-həkim.

Fikrə həm ağaz, sözə həm xitam
Allahın adı ilə xətm et kəlam.

Mövcud olanlardan ən əvvəl olan,
Baqi qalanlardan ən axır qalan.

Köhnə cahanın əzəli sərvəri,
Xaməyə peyvənd eləyən gövhəri.

Cümlə kərəm çeşməsin abad edən,
Cümlə vücud həlqəsin icad edən.

Pərdəli göylərdən açar pərdələr,
Pərdə biləndən özünü pərdələr.

Gün belinə ləl ilə ziyvər düzən,
Torpağa xəl'ət, suya gövhər düzən.

Alimə elm, arifə irfan verən,
Ruzini günlərlə firavan verən.

Mislsiz əqlin telinə dür düzən,
Türfə bəsirət gözünə nur süzən.

Paklərin alnına dağ nəqş edən,
Təxtə çıxan kəslərə tac bəxş edən.

Xam eləyən, püxtə nə tədbir var,
Əfv eləyən, cümlə nə təqsir var.

Vəhm edənin şihnəsi ğovğa günü,
Fəhm edənin çeşməsi səhra günü.

Ondadır əvvəl vücud, axır həyat,
Həm var edən, həm yox edən kainat.



Bil iki dünyanı cəlalıyla kəm,
Əvvəlimiz, axırımız bircə dəm.

Baqi bu mülk içrə Xudadən səva
Kim «limənil-mülk» desə, olmaz rəva.

Vardı yox ikən hələ alt, üst nə var
Var olacaq olsa da alt-üst nə var.

Ən əzəli tə'lim alanlar belə,
Düşdü bu sözdən ötəri müşkülə:

Ta əzəli elmi nə dərya imiş?!
Ya əbədi mülkü nə səhra imiş?!

Əvvəli – bir əvvəli yox ibtida,
Axırı–bir axırı yox intiha.

Keşməkeş içrə nə qədər canlı var,
Bəndəlik eylər Ona biixtiyar.

Hər nə vücud varsa, bəqa onda yox,
Tək Odur ülvi ki, fəna Onda yox.

Üzdə həya, gözdə su, bir lütf bu,
Bu – soyuq atəş verər, o – isti su.

Tərkibinin rövzəsinə hurbəxş,
Gözlərinin nərgisinə nurbəxş.

Min ətək ehsan eləyib lütf əli,
Zahir edir torpaq üzü, dağ beli.

Ta kərəmi pərdədə abad idi,
Xar gülə, ney şəkərə yad idi.

Ta kərəmi səpdi kərəm gövhəri,
Oldu vücud bəndi ədəmdən bəri.

Qurmaq üçün bir-iki viranə kənd,
Çərxin işi düşmüş idi bənd-bənd.

Oldu dügünlər açılınca əyan,
Gündüz üzündən gecənin zülfü yan.

Qırdı boyunbağını çərxin, o dəm
Şanəyə çəkdi gecə zülfün ədəm.

Çəkdi fələkdə iki-üç çənbərə,
Yeddi dügün vurdu dügün tək Yerə.

Bu iki sultanə bir ağ, bir qəra,
Həm Günəşə, həm Aya kəsdi qəba.

Dürr alıb Ondan buludun köynəyi,
Nizəli-qırmaclı edib şimşəyi.

Əbr ödünü bəhr ürəyindən açıb,
Xizr suyun daş dodağından saçıb.

Tökdü səhər camını şəbrəng gilə,
Saldı daşın ağzına həm bir gilə.

Su ilə oddan ki, edibdir calağ,
Yaqut olub qırmızı, dürdanə ağ.

Lə'l cigərin açdı külək böhranı,
Qoydu cigər rəngli torpaq qanı.

Verdi səfa bağına pərvaz, əcəb!
Söz quşun etdi fələkavaz, əcəb!

Verdi dilin nəxlinə söz xurması,
Aldı sözün dürrü qulaq sırğası.

Pərdədə qoydu başını uyqu xoş,
Cisminə can paltarı geydi su xoş.



Atdı zəmin türrəsini aləmə,
Qoydu «əsa» möhrəsini Adəmə.

Xarlıq üzün zərrdən asan yudu,
Aybaşı gül qanını neysan yudu.

Ulduza sildirdi həva cəngini,
Reyhana tapşırdı meh ahəngini.

Gil cigərində qanı peyvənd edib,
Nəbzini əqlin ürəyə bənd edib.

Qoydu dodaqda gülüşü mehriban,
Zöhrəni etdi gecəyə nəğməxan.

Nafə gecə müşkünün əttarıdır,
Həlqəsi Ondan hilalın varıdır.

Vəhm ki, çox döydü bu yolda ayaq,
Gəldi, ələ gəlmədi heç bir soraq.

Söz ayağı ki, əluzundur bir az,
Vurdu hərəm daşı başından qapaz.

Getdi yol, amma zəmirin görmədi,
Gəzdi göz, amma nəzirin görmədi.

Əql də yetdi, Onu etdi tələb,
Qıldı ədəb tərkini, verdim ədəb.

Hər nə ki çıxmışdır o pərgardən,
Cümlə o pərgarı gəzir vardən.

Sidrənişinlər də qanad çaldılar,
Ərşgəzənlər də düşüb qaldılar.

Gərçi fələk boynu kəməndindədir,
Şövq ilə gil nəbzi də bəndindədir.

Can tək ürək ki, özünü pak bilər,
Dərgəhinin torpağı olmaq dilər.

Bitki ki, bağından Onun danədir,
Bağı gülündən İrəm əfsanədir.

Torpağıyam gərçi, Nizami, məni
Bil yenə tovhid tumunun xirməni.



## BİRİNCİ MÜNACAT

Ey törədən varlığı, surət verən!
Ey bu zəif torpağa qüvvət verən!

Bayrağın altında bu aləm enən,
Biz Sənə, Sən öz-özünə söykənən!

Varlığının surəti, peyvəndi yox,
Heç kəsin əslən Sənə manəndi yox.

Sənsən o təğyir qəbul etməyən,
Sənsən o daim yaşayan, getməyən.

Biz hamımız fani, bəqa Səndədir,
Ülvi, müqəddəs o bina Səndədir.

Əmrin ilə tapdı bu torpaq sükun,
Etdin o göy günbəzi Sən bicütun.

Əyri Sən etdin fələkə dövranı,
Cism qazanında duz etdin canı.

Əbləqə vursan qədəmin ilə hay,
Kimdir «ənəlhəq» deyə Səndən səvay?!

Eşqə Sən ən'am elədin qüvvəti,
Olsun adın cəzbəsinə taqəti.

Ta kərəmin tutdu bu aləm bağın,
Düşdü ağır yük belinə torpağın.

Lütf belindən törənibdir zəmin
Ki, göbəyi yoxsa düşərdi həmin.

Səcdə boyunbağına verdin nizam,
Özgəsinə səcdəni qıldın həram.

Lal ola dindirməsə hər kim Səni!
Yad ola yad eyləməyən kimsəni!

Saqi gecə dövr ilə camın dilər,
Sübh quşu şövq ilə namın dilər.

Pərdə at, ey vəhdət ilə var olan,
De: – «Mənəm o pərdədən aşkar olan!».

Poz bu fələkdən bu fələk tağını,
Aç bu cahandan bu cahan bağını.

Əyyam əlamətlərini pünhan et,
Ulduz iqamətlərini viyran et.

Dildə ki söz var, qələmə tuş qıl,
Gildə ki borc var, ədəmə tuş qıl.

Zülmətilər varına tutma çıraq,
Cövhərilərdən ərəzi tut iraq.

Altıbucaq kürsüyə sal vəlvələ,
Doqquzayaq minbəri alt-üst elə.

Ay daşını sal bu gilin başına,
Zöhrə camın çal Zühəlin daşına.

Səp gecəni gündüz edən gövhərin,
Qır gecə-gündüz quşunun şəhpərin.

Yerdəki torpaq təpəni həm silib,
Saxlama kərpiclik üçün bir qəlib.

Çərxin üzündən gecənin cəngin al,
Əxbiyəni, Cəbhəni et payimal.

At bu zamanın yeni hər rəngini,
Tut o qədim pərdənin ahəngini.



Nəqş ilə çək boyunu çərxin, çıxar
Dövr ilə aramdan, et aşikar.

Zülm odu üstündə suyu etrəvan,
Torpağın altında yelə ver məkan.

Odla münəccim bəzəyən dəftəri,
Tik Günəşə səcdə edən gözləri.

Sal hilal övcündə olan dəstəni,
Al xəyal ovcunda olan pərdəni.

Ta Səni bilsin hamı pərvərdigar,
Öz ədəmi şahidi olsun nə var.

Gər ğəzəbin tutsa da hər dəm bizi,
Kimsəmizin yoxdu şikayət üzü.

Asdığına yoxdur «əvəz» istəyən,
Kəsdiyinə «qanbahası ver» deyən.

Nurunu əqlin cana bəxş etmisən,
Zövqünü qəlbin dilə nəqş etmisən.

Səndən uzun mənzilə yetmiş gecə,
Döndü gedən Gün geri, getmiş necə.

Çərxə yeriş, qütbə səbat vermisən,
Sən bu bağa abi-həyat vermisən.

Nəsrinə ğəmzə verə bilməz səba,
Asitanındandır ona tutiya.

Ğönçə kəmərbəstə Sənə bəndədir,
Gül bədəni can ki, canı Səndədir.

Etdi Nizamini də tovhid dağı,
Hər iki aləmdə qapın torpağı.

Xatirini mə'rifətabad elə,
Ğəm qəfəsindən onu azad elə.

## İKİNCİ MÜNACAT

Ey yox ikən biz, əzəli var olan!
Ey var ikən, biz əbədi xar olan!

Dövr əgər əmrin yedəyindən çəkər,
Çərx də Rəxşin çuluna bir nökər.

Həlqə vuran dərbədərik sərsəri,
Həlqə vurulmuş qapının bənzəri.

Özgəyə ümmid yox, iqrar yox,
Özgə nəvaziş eləyən yar yox.

Səndən ikən qorxu, ümid, ey rəhim!
Bəxş elə öz rəhmətini, ey kərim!

Kimsəsizik, Sənsən olan çarəmiz,
Qovsan əgər, kimdən umaq çarə biz?!

Bizdə dağın var Sənin aşkara,
Dağlı it ovda nə gərək şahlara!

Sən qəbul et ki, itiyik dağının,
Həlqəli bir qümrisiyik bağının.

Bu necə dildir, nə fəsahət çəkər!
Çəkməsə, ya çəksə nədamət çəkər!

Əql hara, qol-qanad hardan yetə,
Mən hara, tə'zim hara ülviyyətə?!

Canı bu bəhrə nə ürək tuş edər?
Bəs ürək o bəhri necə nuş edər?



Gər sifətində tutulub nitqimiz,
«Mən ərəfəllah» oxuyanlar da biz.

Olduq əgər xam sözümüzdən xəcil,
Etmə bizi Sən kərəmindən zəlil.

Dərgəhinə gəldik əliboş Sənin,
Tanrılıq ümmidin ilə xoş Sənin.

Munis ol, ey ğəm çəkənin məhrəmi!
Çarə qıl, ey çarəsizin mərhəmi!

Biz geri qaldıq, çəkilir karivan,
Bir nəzər et, kimsəsiz olduq yaman.

Sənsən edən hifz ki, yox bənzərin,
Döyməyə dəyməz qapısın digərin.

İstəmərik qiblə qapından səva,
Ğeyr nəvaziş bizə görməz rəva.

Qarşına kim əl açar, ağlar belə?
Naləsi-əfğanı kimin var belə?

Yalvarırıq, keç ki, çox etdik günah,
Səndə görüb çarə, gətirdik pənah.

Tapdı Nizami adı səndən məqam,
Bir ağadır ki, Sənə olmuş ğulam.

Şə'ninə şükrü dilinə bəxş elə,
Mə'rifətindən canına nəqş elə.

## RƏSULİ-ƏKRƏMİN (S) NƏ'Tİ

Nəqş ki tutdu «əlif» ilk lövhədə,
Saxladı Əhməd qapısın pərdədə.

Həlqəli «ha»ya «əlif» iqlim verib,
Tövq ona «dal», «kəmər» «mim» verib.

«Mim» – onun dairə tək dövləti,
«Dal» – kəmalat ilə hüccət xəti.

Tazə turuncuydu Behişt bağının,
Kərpici–firuzə fələk tağının.

Gör ki turuncun necə ruzgarı var –
Meyvə verər, sonra çiçəklər bahar.

«Kuntu nəbiyyən» elədi ta qiyam,
Oldu Məhəmmədlə nübüvvət təmam.

Ay bir üzükdür ki, zəbərcəd-nişan,
Olmuş onun möhrü Məhəmməd-nişan.

Həlqədir aləm qulağında «mim»i,
Hər iki aləm «mim»inin təslimi.

Məshə odur xacə, Məsiha – ğulam,
Ki, o – pəyambər, bu – verəndir pəyam.

Ümmi idi, amma fəsahət dili –
Adəm, «əlif», «mim», Məsih təhlili.

Əhdinə etmiş düz «əlif» tək vəfa,
«Əvvəl», «axır» bilmiş onu ənbiya.

Parlayan «Ol!» pərgarının nöqtəsi,
Sözlərin ən pərgarının nüktəsi.



Baş çəkib aləmdə özün öymədi,
Aləm üçün aləmə baş əymədi.

Bəs ki, sözündən ədəb avazədir,
Həm kəmərindən fələk əndazədir.

Pərdəsi – ismətlilərin xəlvəti,
Tərbiyə etmişdir özü isməti.

Türbəti gözdən ki cinayət silər,
Ğürbəti həm Məkkə xəracın dilər.

Xamuş olur–qəlbə fərəh tək axır,
Mehr qılır–eybi hünər tək yaxır.

Fitnə yatırmaq ona rəftardır,
Fitnə olanlar ona naçardır.

Cümləyə sərvər, əzəli xeyr idi,
Cavid ağırqütb, yünülseyr idi.

Var ürəyi şəm'i-ilahi kimi,
Almış əzəldən əbədi tə'limi.

Gün bulağı ki, ona möhtac idi,
Parə hilal tək şəbi-Me'rac idi.

Təxtə oturdu gecə Me'rac ilə,
Təxt elədi bəxş kəmər, tac ilə.

Ta ki açılsın nəfəsi, təng idi,
Ağ ata nal vurdu, şəbahəng idi.

Ta qayıdınca dayanıb intizar,
Sübh süvariləri əbləqsüvar.

Sübh vurunca başa əbləq yolu,
Çəkdi Nizami də dalınca çulu.

## ME'RAC HAQQINDA

Yarı gecə ki, o günüz sərvəri
Etdi rəvan nur saçan gövhəri,

Oldu rəvan təxti fələklər gözü,
Məş'əl idi Zöhrə özü Ay özü.

Çıxdı yətim dürr, qalıb boş sədəf,
Yeddi fələk, altı cəhət, dörd tərəf.

Sübh – ayağında edirdi vida',
Şam – sorağında qılırdı səma'

Uyqudan əğyar gözündə xumar,
Göz yumub-açınca olub şah süvar.

Oldu bu tordan qəfəs ilə rəvan,
Can quşu aramgaha atdı can.

Mürğ qanad tökmədə, yə'ni mələk,
Xirqə cırıb-sökmədə, yə'ni fələk.

Oldu qəfəs can quşunun şəhpəri,
Qaldı bu dəm qəlb qəlibdən geri.

Hər qədəmində belə tə'cil ilə,
Yetdi təbərrük ona hər mil ilə.

Hər iki aləm ona açmışdı göz,
Səcdəyə tə'zim ilə baş əydi tez.

Yetdi ayağə başı tə'zim ilə,
Getdi o yüz mənzili bir mənzilə.

Hündür-axur Rəxş atınca palan,
Çiyninə aldı onu orda qalan.



Bəhrü zəmin kan idi, o – gövhəri,
Etdi fələk öz tacının ziyvəri.

Aldı gecə gövhərini gör necə,
Çərx Öküzü Yer öküzündən gecə!

Eylədi peşkəş belə bir xoş səfər,
Bəs Sərətan tac ona, Cövza kəmər.

Xuşə ki, ondan tər idi sünbülü,
Səpdi Əsəd üstünə sünbül gülü.

Bu gecədə ta nə qədər qədr var,
Zöhrə Tərəziylə çəkir intizar!

Açdı süsənbər nəfəsiylə ləbin,
Neştərinə nuş töküb Əqrəbin.

Ta ki Kəmandan hədəfə atdı ox,
Süfrədən Oğlaq zəhəri oldu yox.

Dəlvdə yusiflik olub munisi,
Oldu su Dəlvində Balıq Yunisi.

Ta Quzuda təxt elədi Ülkəri,
Çöldə çadır qurdu gülün ləşgəri.

O uca firdovs gülündən məgər,
Tapdı bahar rəngi bu Yer yerbəyer.

Sübhə yetib şam, əcəb olmuş bahar!
Sərvə yetib gül, əcəb olmuş süvar!

Orda ki gül, nərgis olan bağ idi,
Nərgisinin sürməsi «ma zağ» idi.

Yeddi səmayə oxudu on dua,
Etdi təvazö'lər ona ənbiya.

Pərdəsini açdı fələklər hamı,
Bayrağını çəkdi mələklər hamı.

Etdi gecə nafəsinə müşk bəxş,
Tökdü həm Ay nə'lini atəşlə Rəxş.

Sanki, gecəylə eləyib ittifaq,
Bərq ayağıyla yeriyirdi Büraq.

O yerişi kəklik, o şahin kimi,
Fərri-Hümay ilə göyərçin kimi,

Gül kimi göy fərşdən etdi xüram,
Ərş ayağın əlbəəl etdi məqam.

Sidrə idi Ərşdə pirahəni,
Ərş yaxasında idi damənı.

Həmqədəmi cümlə ayaq çəkdilər,
Həmsəfəri cümlə qanad tökdülər.

Onda ğərib yolçu kimi qaldı tək,
O qapının həlqəsini çaldı tək.

Pərdə tutanlar ona pişva hamı,
Tutdu kəcavə ona tənha hamı.

Bir yol ilə getdi ki, yox həmsəfər,
Bir qədəmindən o biri bixəbər.

O qapıya yetmədi ondan səva,
Oldu o həm onda özündən cüda.

Məqdəmi varlıq başına tac idi,
Ərş hərim ne'mətə möhtac idi.

Can dəmi vurduqca vücud peykəri,
Yol bədənə verdi canın sərvəri.



Vardı nə ki hərf, qələm çəkdi bəs,
Ərş tağından tək ələm çəkdi bəs.

Çıxmaq ilə Ərş tağından yana,
Can ürəyə yetdi, ürək həm cana!

Əsl evinə etdi bədən intiqal,
Göz elə gördü, görə bilməz xəyal!

Rövşən olan göz əzəli nur ilə,
Təslim olurmu xəyala zur ilə?!

Ta qədəm atdı qədim ahəng ilə,
Getdi vücud pərdəsi bu rəng ilə.

Gərçi çox oldu bu yolun yoldaşı,
Çıxdı təbiət yaxasından başı.

Himməti sonsuz pak olan fəhm ilə,
Gəldi o mənzilsiz olan mənzilə.

Ğeyrət o mənzildə hicabın tutan,
Heyrət o xəlvətdə rikabın tutan.

Getdi, vəli yoxdu ayaq zəhməti,
Yetdi, vəli yoxdu məkan rüxsəti.

Oldu mücərrəd öz-özündən təmam,
Onda olundu qəbul ondan səlam.

Atdı, o həngam ki əl verdi hal,
Pərdə cəlalət qapısından vüsal.

Ta ki ayaq ilə başa yetdi seyr,
Can gözü bu mənzərəni etdi seyr.

Gördü o nuru ki, zəval onda yox,
Gördü o gözlə ki, xəyal onda yox!

Layiq olur görməyə mütləq belə,
Gördü Xudanı, görünür həq belə!

Görməyə yoxdur ərəzi, cövhəri,
Gör Onu cövhərlə ərəzdən bəri!

Layiqi yoxdur ola gözdən nihan,
Kordur o göz ki, görə bilmir əyan.

Mə'budu görmək görüləndir rəva,
Ki, görüləndir, görüləndir Xuda!

O yeri görməkdə məkan yoxdu, yox!
O yolu getməkdə zaman yoxdu, yox!

Kim ki, bu xəlvət yerə etdi nəzər,
Etdi cəhətsiz cəhətə bir səfər.

Kafir olur rəddi-sifatın edən,
Cahil olur vəsfi-cəhatın edən.

Yoxdu qərar etdiyi yer, amma var,
Kim belə olmazsa, nə Pərvərdigar!

Gördü Məhəmməd bu göz ilə, məgər
Ki, olur əsrarı görən göz digər!

Mey ki, Xuda verdi ona lütf ilə,
Tökdü o meydən bu gilə bir gilə.

Lütfi-həq ilə nəfəsi həmnişin,
Naz çəkən – rəhməti, o – nazənin.

Tökdü şəkərlər ki, təbəssümlə ləb,
Ümmətini etdi Xudadan tələb.

Oldu bu gənc ilə qəvi himməti,
Oldu muradı nə idi, qisməti.



Tapdı o dərgahdə himayət, şərəf,
Naz ilə üz tutdu vilayət tərəf.

Etdi o yerdən ki, Xuda verdi xeyr,
Bir nəfəsə eşq qanadında seyr.

Ey sözü ilə bizi xamuş edən,
Ətrini can, can suyu tək nuş edən!

Xətm elə dövr ilə səxa camını,
Saxla Nizamiyə söz əncamını!

## RƏSULİ-ƏKRƏMİN (C) BİRİNCİ NƏ'Tİ

Yeddi-sitarə çadırın əfsəri,
Xatəm ilə xətm bu peyğəmbəri,

Əql ki, yanında olur kəm onun,
Tapqırına bənd iki aləm onun.

Sünbül o səhradən, o ki nazdır,
Gövhər o dəryadən, o ki razdır.

Sünbülü bir Sünbülədir nur süzən,
Gövhəri Gün tacına ziyvər düzən.

Tökməz onunçün dodağı şəkkəri
Ki, tökər abrın sədəfin gövhəri.

Gövhəri sındırmadı daş tək sədəf,
Daş neçin o gövhəri etdi hədəf?!

Bağrı daş idi ki, bu peyda idi,
Qəsd eləyən bir quru sövda idi.

Ta ki o daş oldu müfərrih gəzən,
Oldu odur dürr qıran, lə'l əzən.

Seçdi məlamət daşı o gövhəri,
Yoxdu o gövhər kimi bir digəri.

Çıxdı o dürr, açcaq o dar mücrü ləb,
Daşdan əgər dürr çıxır, yox əcəb.

Sim daş üçün diyət idi məgər,
Verdi o dür mücrüsünə dərdisər?!

Daşda olan dürr, olurmu rəva,
Olsun o diş, o dodağa qanbəha?!

Mə'dən o dürrə ki zəmindir, fəqət
Olmaz o diş gövhəri üçün diyət.

Fəth, diyət olmaq üçün can çəkən,
Olmuş idi can ilə dəndan çəkən.

Ağzını daşdan yudu qan ilə tam,
Oldu kəramət adı ondan təmam.

Tərk elədi axır o dürdanəni,
Amma ki, tərk etmədi şükranəni.

Arzu dişində ki, çəkib möhrədən,
Heç nə yox idi hər iki süfrədən.

Cəngdə səf çəkdi haçan ləşgəri,
Bayraq əli oldu, dili xəncəri.

Xəncəri etməkdə idi diş fəda,
Xəncərə, əlbəttə, deyil diş rəva.

Bu hamı nəydi? – Kərəmindən əsər!
Ta ki, görə xar gülündən səmər!

Gül doludur bağ, demə xardən!
Riştə dolu möhrə, demə mardən!



Təb'i-Nizami ki, açan güldür o,
O gülə xoş nəğməli bülbüldür o.

## RƏSULİ-ƏKRƏİMİN (S) İKİNCİ NƏ'Tİ

Ey bədəni paklığı candan da pak,
Ruhə verən tərbiyə, «Ruhi fidak»!

Nöqtə sən oldun evinə «rəhmət»in,
Nöqtə evin ğarət edib «zəhmət»in.

Sübhdəmin yolçusuna mahsən,
Həm əcəmin yolsuzuna şahsən.

Sən demədən sənlə düşüblər yola,
Kətxudasan, kənddə deyilsən nola?!

Sən kimi comərd ki, təmaşa edir,
Halvaya meyli gecə tənha edir?!

Süfrədə ki xurma nuş etdin, həman
Ərməğan etdin bizə həm, çox güman.

Aç dodağın ki, hamı şəkkər yesin!
Tər dodağın xurmasını tər yesin!

Ey gecə zülfün bizə ruzi-nicat!
Atəşi-eşqin bizə abi-həyat!

Əqli sən aşiq elədin hüsn ilə,
Hər telin aşiqlərə bir silsilə.

Çərx – dügün tək kəmərin bəndəsi,
Sübh – Günəş tək üzünün xəndəsi.

Paklığı cəhl aləmi səndən qapıb,
Nafəni Yer nafəsi səndən tapıb.

Müşk saçır torpağın ilə ğübar,
Torpağın o yurdu edib müşkbar.

Xakinə kim badi-Süleyman deyər?!
Rövzənə kim rövzeyi-Rizvan deyər?!

Kə'bə ki, təkbirinə səccadədir,
Təşnə təbaşirinə amadədir.

Tacın ilə təxtini saxlar cahan,
Təxt – zəmin, yə'ni ki tac – asiman.

Sayə yoxundur ki, nəzir Ayəsən,
Nuri-ilahidən olan sayəsən.

Dörd ələmin – rüknü müsəlmanlığın,
Beş nəmazın – növbəti sultanlığın.

Sənsən əsir torpağı gülşən qılan,
Sənsən əziz gözləri rövşən qılan.

Zülfü dağılmış gecədə sən o dəm,
Ta ki, fələk başına qoydun qədəm,

Oldu odur dürrü-zəri bir qucaq,
Köynəyinin qoltuğu zərrin-zolaq.

Saçmada sübhün sədəfindən səba,
Ğaliyə ətrin ki, əliydi vəfa.

Çəkdi o yerdən ki səba ləşgərin,
Ləşgəri atdı ələmi ənbərin.

Ənbərinə vermə ucuz dəm belə,
Ki, ona dəyməz iki aləm belə.

Ziyvərinə haşiyə tək Sidrə fərş,
Eyvanına kürsü qoyanındır Ərş.



Sübhə ki, ruhun bacası verdi dəm,
Zərrə tək Ərşi o Günəş etdi kəm.

Sübh əli ayinə tutandan bəri,
Nurun ilə tutdun əcəb hər yeri!

Ey iki aləm, bu nə torpaq qəfəs?
Xəznə deyilsən, niyə torpaqda bəs?!

Ta ki bu torpaqda tutursan qərar,
Xəznəyə bu torpaq olur xəznədar.

Xəznənə fəqrin kimi viranə bəs!
Şəm'inə sayən kimi pərvanə bəs!

Çərx sənə bir təpəcik qum yolu,
Bu quyunun kəndiri çənbər dolu.

Bu iki hakim – qara-ağ müxbiri,
Yolda yolun qasididir hər biri.

Əql şəfa istər əgər, sən təbib!
Mah səfər eylər əgər, sən ğərib!

Qalx, nigəranlar gecəsin rövşən et!
Təb'i-Nizami ki coşubdur, şən et!

## RƏSULİ-ƏKRƏMİN (S) ÜÇÜNCÜ NƏ'Tİ

Ey mədəni pərdəli, məkki-niqab,
Kölgədə çoxmu qalacaq afitab?!

Aysan, o Gündən bizə nur bəxş elə,
Gülsən o bağdan, bizə bir ətr ələ.

Can dodağa gəldi, hamı müntəzir,
Yolların üstündə düşübdür əsir.

Durma Ərəbdə, Əcəm ahəngi tut,
Dur, bu kürən, ya ki bu şəbrəngi tut.

Gəl təzədən tazələ dünyanı sən,
Sal hər iki aləmə ğovğanı sən.

Sikkəni sən vur, üməra xar ola,
Xütbəni sən de, xüləfa zar ola.

Qoydu vilayətdə ətir türbətin,
Qoymadı badi-nifaq o nikhətin.

Sal yerə, kim təxt ilə asudədir,
Ğüsl elə bu minbəri, aludədir.

Divlərə mənzil olub, xali et,
Etsən, ədəm anbarının mali et.

Əcri kəm et, israf əyan etdilər,
Mülkü geri al ki, talan etdilər.

Biz hamımız cism, yetiş can sən ol,
Biz hamımız div, Süleyman sən ol.

Şihnə özün, qafilə tənha neçin?!
Qəlb özün, bayrağı yağma neçin?!

Dinə salır rəxnə salanlar belə,
Pusqu qurur pusqu quranlar hələ.

Ya bir Əli yolla bu meydan tərəf,
Ya bir Ömər göndər o şeytan tərəf.

Çək yəməni mahə gecə zülfü tök,
Çıx yəməni cübbədən o mah tək.

Qalx, iki-üç məhbus ilə bağla bel,
Bir neçə xar olmuşu xar eylə gəl.



Uyquda bu beş yüz ilə əlli bəs,
Məclisə gəl, keçdi axı gün, tələs.

Dur, buyur avaz ilə İsrafili,
Püfləyə ta bu iki-üç qəndili.

Sirlərə xəlvətdə xəbərdar sən ol,
Biz uyuyaq, amma ki, bidar sən ol.

Afət ilə eyləyir ülfət fələk,
Sən tut əlindən hamının, et kömək.

Razı edir işdə həqiqət səni,
Etməz odur kimsə məzəmmət səni.

Gər nəzərin bir yol inayət qılır,
Cümlə mühüm işdə kifayət qılır.

Barmaq ilə dairə çək aşikar,
Ta ki, sənə bəxş oluna hər nə var!

İşlərinə kim qarışar iş çağı,
Əfv eləməkçün bir ovuc torpağı?!

Çəksən üzündən sən əgər pərdəni,
Hər iki aləm soyunar xirqəni.

Ta ki, Nizami səni eylər sorağ,
Ğaliyə ətrinlə olur xoşdimağ.

Nola, vəfa ətri ilə yadə sal,
Bu fəqiri eylə firidun-cəlal.

## RƏSULİ-ƏKRƏMİN (C) DÖRDÜNCÜ NƏ'Tİ

Ey nəbilər tacına dürri-Ədən,
Pakizələr dürrünə tac bəxş edən!

Taət edən tayfa da, biganə də,
Mehmanın olmuş hamı bu xanədə.

Beytin əgər əvvəlinə bənd adın,
Qafiyə tək axırə peyvənd adın.

Ta bu xərab kənd işarət tapıb,
Adəm ilə səndən imarət tapıb.

Xanə ki, bünyad eləyirlər onu,
Kərpic olur əvvəli tək həm sonu.

Adəm ilə Nuhu tutub ziyvərə,
Bir dügün oldun iki bağ gövhərə.

Adəmi ishal elədi danə gər,
Tövbə ona oldu şirin gülşəkər.

Ətrin, ürək tövbəsi üçün – bağı,
Gülşəkəri – kandarının torpağı.

Səndən ürək tövbə yedi gülşəkər,
Gülşəkərə tövbə dedi gülşəkər.

Top ki «qəbul» idi, əzəl aldılar,
Bir səf ürək meydanına saldılar.

İstədi əvvəldə ki, cövlan ilə,
Adəm aparsın topu çovgan ilə.

Amma ki, meyl etdi atı xuşəyə,
Atdı topu, getdi uzaq guşəyə.



Nuh ki, təşnəydi bu dəstərxana,
Saldı bu çeşmə onu həm tufana.

İbrahimin rə'yi həm aciz qalıb,
Yolda rəvan təxti neçə yol salıb.

Davuda ki, onda nəfəs təng idi,
Pərdə bəm ikən o, zil-ahəng idi.

Gərçi ədəb tutdu Süleyman, fəqət,
Tacı atıb, tutdu o həm məmləkət.

O suyu Yusif də əyan görmədi,
Dəlv idi, ip; özgə nişan görmədi.

Xizr cilov çəkdi səfərdən quru,
Daməni yaş, tapdı bulaq dumduru.

Cam ilə Musa ki, əliboş qalıb,
Turə vurub şişəni, sərxoş qalıb.

Yoxdu Məsih istəyi bu danədə,
Töhmət içindəydi o bu xanədə.

Sən məlik aldın bu uca payəni,
Əzm ilə saldın bu işə sayəni.

Naməyə möhr oldu sənin ünvanın!
Xütbəni xətm etdi sənin dövranın!

Qalx, fələkdən yuxarı gərdiş et,
Görmür o iş, sən bir işə vərdiş et.

Çərx atı meydanın ilə yerbəyer,
Yer topu çovganın ilə yerbəyer.

Yoxdu fəna toz tək ədəmdən hələ,
Meydana cövlan ilə sal vəlvələ.

Kimdir, aparsın su camından, fəna?
Nakəs ədəm silsin adından səfa?

Bağla fəna ilə fəna qolların,
Yoxluq ayağıyla ədəm yolların.

Ey nəfəsin nitqi dili bağlının!
Mərhəmi sövdalı cigər-dağlının!

Qan dənizindən çıxaran əql ilə,
Şər'in olub can gəmisin sahilə.

Yeddi fələk qibləsi kuyin sənin,
Altı günün vergisi muyin sənin.

Mülk saçın tək qarışar, bircə dəm
Başdan əgər bircə telin olsa kəm.

Hərf oxuyan üzdə qələmdən rəvan,
Məğz içinə əqldən artıq bəyan.

Hərfə ayaq vurdu sənin barmağın,
Dəyməyə ta barmağı hər sarsağın.

Hər sözə barmaq qoyulur, bu əyan,
Bir sözünə yox hələ barmaq qoyan.

Tozlu qovut-şəkkər ilə məzhərin,
Püstədir, innab sənin şəkkərin.

Bir ovuc ondan götürər kim əgər,
Eşq təmaşasına qırx gün yetər.

Sən təzə-tər sübhi-nicatsan mənə,
Torpağınam, abi-həyatsan mənə.

Canıma cənnətdir o pak torpağın,
Canü cahandır mənə qürbət bağın.



Mən o bağ üstə ki, o pak ruh tək,
Gah oturan toz, gəhi qalxan külək,

Sürmə Nizami gözünə ta çəkim,
Qul kimi Rəxşin çulunu ha çəkim!

Başlarına düşsə, böyüklər, həman,
Torpağımı ğaliyə eylər, güman!

## MƏLİK FƏXRƏDDİN BƏHRAMŞAHIN MƏDHİ

Dairə tək dəhrdəyəm bənd mən,
Nöqtə kimi şəhrdəyəm bənd mən.

Yox ayağım açmaq üçün iqtidar,
Sayə, Hüma fərri deyil, gərçi var.

Torpağa hərçənd ayağım oldu bənd,
Tapqırına çərxin əlimdir kəmənd.

Başımı qoydum dizim üstə, bu dəm
Mən dizimin başını etdim qədəm.

Nur ilə oldu elə rövşən üzüm
Ki, ürək ayinəsi oldu dizim.

Mən ki, bu ayinəyə verdim cila,
Bəlkə, göz ayinəsi tapsın səfa.

Ta mənə bir ayinə rövşən görüm,
Ya mənə– bir atəşə su mən görüm.

Əql gözü ta ki dürüst rə'y ilə,
Seyr elədi aləmi çox sə'y ilə,

Gördü ki, bir mayəsi himmət olan,
Payə verən, həm vəline'mət olan,

Fəth ilə xoşbəxt şahı ruzgarın,
Gülbünü firuzeyi bu gülzarın,

Xizr-rə'y İskəndərü çeşmə saçan,
Qütbi-rəsədbənd, Məcəsti açan.

Cümlə vücud məqsədinin əvvəli,
Məqsəd olan ayə onun mənzili.

Şahi-fələktac, Süleyman-nigin,
Fəxrdir afaqə məlik Fəxri-din.

Var yeri, Davudə ki var nisbəti,
Var Süleyman şərəfi, şövkəti.

İshaqın ondan ələmi alidir,
Varsa əgər ziddi, simailidir.

Altı cəhət, yeddi bu iqlim hamı,
Dairəyə nöqtə bilir Bəhramı.

Var yeri, bəhramlığı etcək zühur,
Bəhrəsi Bəhram-Gurun olsa gur.

Qüdrət ilə şahlara sərvər odur,
Elm ilə dövranına rəhbər odur.

Xas edib ondan bu cahanı ümum,
Mülkü həm Ərmən o şahın, həm də Rum.

Səltənəti təxti – xəlifə-məqam,
Ki, Rumu fəth eyləmiş, Əbxazı ram.

Cümlədən alimdir, ədalətlidir,
Türfə cavanmərd, səxavətlidir.



Din – fələk, dövləti Ülkər onun,
Mülk-sədəf, torpağı gövhər onun.

Çeşmə, dənizdir, balığı, dürrü var,
Çeşmədir – aram, dəniz – biqərar.

Çeşmə ki, simab dəmadəm saçar,
Daima simab tək əlindən qaçar.

Saf kəməri lə'li edər məsxərə,
Gün kəməri lə'linə yerdən-yerə.

Pəncə bu göy pəncərə daim ona,
Pəncə vurar, pəncə atar kim ona.

Zəngi fələk təblini bikar elər,
Ay şüşəsin həm nəfəsi parələr.

Xürrəm olub əvvəli, əyyamı xoş,
Eylər ona ədl sərəncamı xoş.

Əldə səxavət camı ki, saqidir,
Daimi olsun, fəqət o baqidir.

## BƏHRAMŞAHA SİTAYİŞ

Ey şan olan gövhərinə adəmin,
Ey nur olan kəs gözünə aləmin!

Çərx – zəfər saz eləyən bir yarın,
Hamilə bir nazına doqquz qarın!

İki balıq tapdı qulaqla şərəf,
Oldu qılıncın gühəriyçün sədəf.

Çəksə qılınc Ay gecə, yox imkanı,
Görsə qılıncın, atacaq qalxanı.

Abi-Fərat tək qılıcın çeşməsi,
Tökdü yerə abi-həyat şişəsi.

Kim ki bu tufanda edir uyqunu,
Nuh həm olsa, aparır su onu.

Xosrovi Cəm huşlu camın iftixar,
Gün vuranı sayən edib bəxtiyar.

Şir ürəyin var ki, cahangirsən,
Şir yıxansan, demirəm şirsən.

Bu meşənin şirləri tək çərx həm,
Vahimən içrə dolaşır qəddi xəm.

Cəngdə kimdir ki ola cür'əti,
Laf edə qarşında ki, var qüdrəti?!

Hər nə ki mavi fələk altında var,
Əzm əlin altında tutubdur qərar.

Var əlin altında neçə kəs sənin,
Var əlin üstündə mələk bəs sənin.

Dövr sənə xatəmi-dövran yazıb,
Torpağına bad «Süleyman» yazıb.

Tanrı verib mülk, cavanlıq, həmən
Yar ola daim sənə; o mülk, o sən.

Torpağı iqbalın edir zər sənin,
Yadın ilə zəhr də şəkkər sənin.

Sənlə Firidun şərab etməzsə nuş,
Zöhhak ianıyla olur bəlkə tuş.

İç meyi, mütrib ki sənə saqidir,
Ğəm yemə, dövlət ki sənə baqidir.



Şahlara da, mülkə də sənsən pənah,
Şəmşir ilə müddəi, tac ilə şah.

Sərt qılıncınla, deyildir yalan,
Oldun əgər təxt tutan, tac alan,

Dürr səpirsən xüləfa tək bəha,
Tac verir, təxt qılırsan əta.

Şəmşirin altında olur, olsa tac,
Verməyəcəkmi sənə şahlar xərac?!

Bəxtəvər o baş ki, ayağındadır,
Şad o ürəkdir ki, sorağındadır.

Bayquş dövründə hümalıq edir,
Baş da hüzurunda ayaq tək gedir.

İnsaf əlindən ki, inayət qılır,
İndi şikayət də şikayət qılır.

Köhləninin dırnağı altda sənin,
Çarmıxa nal tək çəkilib düşmənin.

Gövhərinin hoqqəsidir yeddi tağ,
Bayrağının şəqqəsi – səkkiz bağ.

Olmasa hökmündə başı hansı kəs,
Noxta olur öz başına tacı bəs.

Ey hamı fənlərdə olan ünvanı,
Bir bədən içrə iki aləm canı!

Badi-səbayə nola tənbeh sən et,
Söz çırağında nəfəsi rövşən et!

Xəl'ət ilə ver bu ğulamə şərəf,
Yolla qəbul ətri Nizami tərəf.

Gərçi sözüm qüvvədə can bəxş edər,
Süfrənə yetdikdə özündən gedər.

Lə'li, dürü bu dənizin, mə'dənin,
Lə'l dilin, dürr əlindir sənin.

Qəhr ilə bədxahə də ehsan elə,
Dürrü – qılınc, lə'li də peykan elə.

Verdi sənə bəxt fələk kam ilə,
Xeyr tapa işlərin əncam ilə!

Naz edənin, həm yananın var sənin,
Naz edənin – mən, yananın – düşmənin!

Fəthin ucaldıqca, ələm tək başı!
Düşmən əyildikcə, qələm tək başı!

## KİTABIN NƏZMİNƏ SƏBƏB HAQQINDA

Bu gülə xoş nəğmə deyən dil mənəm,
Bağına xoş nəğməli bülbül mənəm.

Eşqin ucundan sözə verdim nəfəs,
Dərgəhinə saldım o zəng ilə səs.

Borc nə aldım, nə qəbul eylədim,
Hər nə ürək ki dedi: - De! Söylədim.

Bir yeni hoqqənin olub maili,
Tazə qəlibdən tökürəm heykəli.

Sübhsifət çox ədəb öyrətmişəm,
Pərdə səhər sehrin ona etmişəm.



Mayəsi şahlıqla gədalıq onun,
Məxzəni-əsrarı Xudalıq onun.

Şəkkərinə qonmadı milçək əgər,
Milçəyi həm dadmadı digər şəkər.

Nuh bu bəhr içrə atar qalxanı,
Xizr bu çeşmədə qırar dolçanı.

Atdım hamı şahların adına fal,
Düşdü sənin adına bu gül cəmal.

Gəldi iki namə şərəf şanına,
Hər biri bir Bəhramın ünvanına.

Safdır əgər köhnə o mə'dən zəri,
Bu təzə bəhr içrə saçır gövhəri.

Ğəznədə qaldırmış idi o ələm,
Vurdu bu rum sikkəsi üstə rəqəm.

Gərçi söz o sikkədə zər nəqşəsi,
Yaxşıdır ondan zərimin sikkəsi.

Görmə kəm ondan yükümü, barımı,
Yaxşı gör ondan bu xəridarımı.

Keçmə ki, bu şivə ğəribdir görüb,
Görsə nəvaziş əgər, olmaz ğərib.

Nəqşi əgər olsa da bağ tək onun,
Nuru deyil borc çırağ tək onun.

Süfrən üçündür bu iki söz tikəm,
Dəyməyib əl, sən əl uzat, tutma kəm.

Gər duzu varsa ye, nuş olsun sənə,
Yoxsa, yadından çıxar əlbət yenə.

Çərx ilə həmsüfrə olan axşamı,
Bəndəyə həm süfrədən et ən'amı.

Bəndəliyindən vururam dəm sənin,
Dəbdəbədir bəndəliyin həm sənin.

Şahlar içindən ki, vəfa görmüşəm,
Bənd sənə olmağı rəva görmüşəm.

Xidmətim axır ki sədaqət çəkər,
Ta bu ipin axırı nüsrət çəkər.

Gərçi neçə mədh deyən hər zaman,
Bu əbədi qəsrə qoyur üz, həman,

Hamı Nizamini görən dəm durar,
Özgədir o, özgəsi nə dəm vurar?!

Mən ki, həmin mənzili tərk etmişəm,
Mənzilə bir mərhələ tez yetmişəm.

Burda söz əlması ilə durmuşam,
Kim gəlib ardımca, başın vurmuşam.

Yoxsa da bu payədə həmta mənə,
Payəm ayağı alacaq baş yenə,

Ta uçam o övcə ki, olmuş bülənd,
Ta ki, bu himmətdən olam bəhrəmənd!

Vardır ümidim, ola rə'yin çıraq,
Baş qoyaram mən, qoy ora sən ayaq!

Başına döndüm ki, yetəm göylərə,
Tutsan əlimdən, yetərəm bir yerə.

Bu bir-iki ayda, deyirdim gedim,
Şahın önündə yenə tə'zim edim.



Amma, bu həlqə elə peyvənd idi,
Çıxmağa bir yol yox idi, bənd idi.

Ta ki hüzurunda tapım qədr bəs,
Bəlkə çıxırdım əridən hər nəfəs.

Yolları gördüm ki, dolu şirdir,
Hər tərəfim xəncərü şəmşirdir.

Çəksə də bu yerdə qılınc həlqəni,
Xətm, adınla edirəm xütbəni.

Saçdı qapında suyunu saf sözüm,
Qum tək əgər daimi qaldım özüm.

Zərrəsifət sən tərəf, ey Gün, gedən
Sübh duamı qəbul etsin edən.

Saçdı səninçün ürəyim gövhəri,
Qurşağın üstündə canım cövhəri.

Sübhü şam olduqca, şamın sübh ola!
Hər gecə şahlıq gühərin nur sala!

Bəxtin olubdur bu saray içrə yar,
Ol o sarayda daha da bəxtiyar!

### SÖZÜN FƏZİLƏTİ HAQQINDA

Cünbüşə əvvəl ki Qələm başladı,
Öz sözünü sözdən o dəm başladı.

Xəlvət olan dəmdə əyan pərdədən,
Cilvəyə söz gəldi həman pərdədən.

Sözdür ürək söz deyən ünvan ilə,
Torpağa avazə verən can ilə.

Başladı öz get-gəlini ta Qələm,
Sözlə cahanın gözünü açdı həm.

Sözsüz olammazdı bu «aləm» sözü,
Çox dedilər, olmadı heç kəm, sözü.

Eşq dili şərh verir «can» bizə,
Biz – sözük, uçmuş saray – eyvan bizə.

Hər nə fikir xətti ki peyvənd olur,
Söz quşunun şəhpərinə bənd olur.

Yox hələ bu pöhrələnən cəngəlin,
İncə görən söz kimi hər cəncəlin.

Düşsə də söz axırə, fikr əvvələ,
Tut bu sözü, vəsf eləyim qoy hələ!

Sərvər olanlar onu sərvər dedi,
Digər olanlar onu digər dedi.

Gah müzəffər aləmə çəkdilər,
Gah müzəyyən qələmə çəkdilər.

O eləyən fəthi ələm etmədi,
O yetən iqlimə qələm yetmədi.

Hər kəsə ərz etsə əgər söz cəmal,
Bəndəsi eylər bir ovuc boş xəyal.

Biz ki, sözün aşiqiyik, huşyarıq,
Həm ölüsüyük, həm onunla varıq.

Süst-qədəmlər odu ondan qapıb,
Tünd-yerişlər suyu ondan tapıb.

Köhnə bu kəndi edən abad odur,
Çərxdən əvvəl, təzə icad odur,



Bir nişanı var ki, onun rəngi yox,
Bir dili var, heç dilə ahəngi yox.

Harda ki söz qaldırıb açdı ələm,
Orda nə dil yoxdu, nə hərf oldu kəm?!

Eşməsə idi söz əgər can telin,
Can bu telin tapmaz idi əvvəlin.

Sözlə təbiət diyarın qurdular,
Sözlə şəriət möhürün vurdular.

Mə'dən alıb öz zərini, həm sözü,
Eylədi söz sərrafına ərz özü

Ki, təzə söz yaxşıdı, ya köhnə zər?
Sözdü gözəl – söylədi, sözdür, nə zər!

Yolda sözün peykinə başdır ayaq,
Kim başa vurmuş yolu sözdən qabaq?!

Vur sözə sikkə ki, nə itdir dirəm?
Ahu tək olmuş şikarı zərr həm!

Söz kimi yox sidrənişin qeyri kəs,
Varı bu mülkün deyirəm sözdü bəs.

Sözdən ürək tək olan agah yox,
Şərhi özündən də sözün çoxdu, çox!

Söz nə qədər var, ona avazədir,
Sözlə Nizami adı həm tazədir!

## MƏNZUM SÖZÜN MƏNSUR SÖZDƏN ÜSTÜNLÜYÜ

Söz yox, əgər olsa da söz sərsəri,
Bil onu gövhər satanın gövhəri.

İndi gör o nüktə ki, mövzun olur,
Nüktə görənlərdə nə məzmun olur!

Kim ki çəkər qafiyəyə söz, həmin
Sözlə çəkər gəncin iki aləmin.

Xəznə kilidin ki olur gözləyən,
Öz dili altında tutur söz deyən.

Kim sözə mizanı qurub mö'təbər,
Bəxtəvəri sözlə edib bəxtəvər.

Bülbül olur Ərşə söz əfsungəri,
Heç ona bənzərmi olur digəri?!

Fikrət odundan ki pərişan olur,
Xas mələklər ona heyran olur.

Pərdə ki şairlik üçün mayədir,
Mayə nübüvvətdən olan sayədir.

Boş-dolu etdi bu səfi kibriya,
Boş – şüəra gəldi, dolu – ənbiya.

Dustdu bir bu iki məhrəm-nəzər,
Oldu biri məğz, qabıqdır digər.

Xurma ki, bu süfrədə həmvarədir,
Xurma deyil, candan olan parədir.

Ki, canı gil dimdiyi didmiş təmam,
Fikri ürək dişləri çeynər müdam.



Söz ki, o hikmət bulağıydı duru,
Bir neçə acgözdən olub qupquru.

Kim ki bu xoş pərdədə tutmuş nəva,
Var ona bu hücrədən artıq səra.

Kim ki dizi üstə vilayət alar,
Hər qapıya sanma qoyar baş, qalar.

Oldu dizi üstə ürək mənzili,
Hər iki dünyayə həmail əli.

Baş əyər etməkçün ayağə səlam,
Baş-ayağın həlqə tək eylər təmam.

Hər necə bu həlqəni ki xəm qılır,
Gah şikəst, gah da möhkəm qılır.

Gah başında dizini həlqələr,
Çərx qulağından asar həlqələr.

Gah bu hoqqəylə çıxar hoqqədən,
On çıxarar gah o bir möhrədən.

Söz atı hərgah elədi cövlanı,
Can dodağı övdü, dodaq həm canı.

Mə'dən ona lə'l verər ta, o dəm
Rəxnə görər çərx yumurtası həm.

Var isə hər beytin oğul nisbəti,
Təb' atasındandır onun qüdrəti.

Ta ki, fələk çənbərin eylər nökər,
Xidmət edib çəkməz özü dərdisər.

Həm cana rahət nəfəsi bəxş edər,
Həm dodağa möhr sözü nəqş edər.

Kim ki bu cür nəqş ilə peykər çəkər,
Tə'rif et o lə'li ki, gövhər çəkər!

Sən o kəsi Müştəri bu sehrə bil,
Harutu Babildən asan Zöhrə bil!

Çoxları bu mayə ki, etmiş süvar,
Bir neçə xar olmuş onu etdi xar.

Etdi bu söz rə'yimi yerdən yaman –
Söz suyunu tökdü yerə sözqoşan.

Canla ki, meyvə ürəyə verdilər,
Bu nə sudur ki, çörəyə verdilər?!

Ey fələk, asudə olan dəstədir,
Bunca dügünlər ki, kəmərbəstədir.

Getdi iş əldən, ayağınla özün,
Bu dügünü aç ayağından sözün.

İsraf edənlər zər üçün öldülər,
Zərlə sözün sikkəsini sildilər.

Gün kimi bir nüktə verən kəs daşa,
Şəbçırağı eylər əvəz bəs daşa!

Bunlar əgər çəksə də baş payə tək,
Torpaq ayağında olur sayə tək!

Sultan əlindən o ki zərbaf geyər,
Axırı bir parça dəmir həm yeyər.

Zər qəmi simab kimi kim yemir,
Səncər əlindən dəmir o sim yemir.

Bir belə kəm eyləmə söz şəkkərin,
Milçəyə yem eyləmə söz şəkkərin.



Verməsələr alma, vəfa olsa həm!
Sormasalar dinmə, dua olsa həm!

Şər' ilə hazir elə əvvəl hüzur,
Şe'r ilə et Ərş tərəf sonra şur!

Şər' ilə şe'rin elə mə'va tutar
Ki, kəmərin sayəsi Cövza tutar.

Şe'r sənə Sidrədə dövlət verər,
Mülki-məanidə səadət verər.

Şe'r qılır hasil əmirlik, məqam –
«K-əş şüəraü üməraül-kəlam».

Ta verər əl, çəkmə fələk tək ayaq,
Söz de ki, versin o fələkdən soraq.

Şəm' kimi ol, başını sal yana,
Gündüzü can ver, gecəni gəl cana.

Fikr atı qızdıqca ki ahəng edir,
Çərxi-fələk tünd yerişin ləng edir.

Hər nə ki bu pərdə sənə göstərər,
Xoşlamasan, xoşladığından verər.

Sinəni çox gərmə gühər versə əl,
Sinədən istə, verər ondan gözəl.

Söz xoş olar etsən əgər gec pəsənd,
Ki, sözü bu tövr edərsən bülənd.

Kim ki bu yolda ələm e'lan edir,
Gündən alır top, Ayı çovgan edir.

Tünd-nəfəs olmasa həm bir nəfəs,
Tünd yerişin etməz o kəm bir nəfəs.

Fikr atı aramsız olur ta çapır,
Ki, fələki ötcəyin aram tapır.

Şəhpəri Cəbrail ona Rəxş edir,
Yelpiyi İsrafil ona bəxş edir.

Vermə bu xirmən gedə yeldən-yelə,
Qoyma bu riştə düşə əldən-ələ!

Süfrəsini əncərin eylərdi yox,
Quşların əncir yeyəni olsa çox.

Mən ki bu fənn ilə çəkilmiş yayım,
Göz görə bu şivədə yoxdur tayım.

Şe'rim əcəb sovmiə bünyad edib,
Şairi myexanədən azad edib.

Zahidü rahib yügürür mən tərəf,
Xirqəni, zünnarı ediblər tələf.

Ğönçə qızıl gül kimiyəm mən hələ,
Müntəzirəm yüngül əsən bir yelə.

Cilvəgər etsəm təzə söz şur ilə,
Bəlkə, Qiyamət qoparar Sur ilə.

Hər nə vücud var, təzə, ya köhnədir,
Mən sözü caduyə hamı fitnədir.

Sən'ətim əfsundan alıb aramı,
Sehrimə məftundu mələklər hamı.

Babilim – Harut yaxan Gəncədir,
Xatirim – ulduzlara nur Zöhrədir.

Məntəqə ki, Zöhrəsi Mizanidir,
Məntiqi əlbəttə ki, ruhanidir.



Nuş həlal sehrim olur sübhdəm,
Nəsx qılır nüsxeyi-Harutu həm.

Şəkli-Nizami ki, xəyalımdadır,
Canlı mənim sehri-həlalımdadır.

## ÜRƏYİ DƏRK ETMƏK VƏ HƏQİQƏTLƏR TƏLƏBİNDƏ

Onda ki atdı Günəş öz qalxanın,
Atdı zəmin həm suya tez qalxanın.

Etdi cahanı nəfəsi təng onun,
Qalxanı surətdə sarı-rəng onun.

Qalxanı ta atdı, onun ləşgəri
Başına qəsd etdi, çəkib xəncəri.

Muncuq öküz boynuna kimlər çəkir,
Ta ki yıxıldı, hamı xəncər çəkir.

Dayəyə ta atdı gecə tifli çəng,
Gündüz ayağında onun oldu zəng.

Ta gecə sövdasına etsin əlac,
Gördü fərəh mə'cununa ehtiyac.

Torpaq olub xoşnəfəs İsa yeli,
Səpdi su sövda oduna lütf əli.

Şərbət ilə xəstə edib ittifaq,
Çəkdi o sövdanın evindən ayaq.

Xəstə bu dəm tökdü ki bir teşt qan,
Tüstü kimi rəngi qaraldı, həman

Batinini çəkdi üzə zahirin,
Hökm dedi: – «Kanə min əl kafirin».

Şuxluğu hərdəm gecənin var idi,
Bir gecə ki, yüz oyun oynar idi.

Ay kətanından gəhi şəbrəm tökür,
Zöhrə dəfindən gəhi dirhəm tökür.

Bir gecədəydim, çırağım yox mənim,
Bir bağa bülbül ki, bağım yox mənim.

Sözlə qarışdı cigərim qanı, gör!
Saçdı nə atəş cigər ümmanı gör!

Fikrim ilə az-çox apardım güman,
Bu dügün ardınca tək oldum rəvan.

Xəlvəti hatifdən eşitdim səda:
«Hər nə ki borcun var, ol ondan cüda.

Atəşinə bu suyu tökmək nədir?
Torpağına yel atı çəkmək nədir?

Təb gətirən torpağı tabutə ver,
Nur saçan atəşi yaqutə ver.

Rə'yini etdikcə hədəf ox az at,
Qamçını çox vurma, ayağındır at.

Ğafil oturma, bu qədər çəkmə can,
Qəlb ayağında suyunu et rəvan.

Mavi bu küp içrə ki, xoş rəngi var,
Nəql et ürəkdən ki, xoş ahəngi var.

Tərk elə beş yolvuran o əntəri,
Tək ürəyi tut bu yolun rəhbəri.

Hansı ürək Ərşdə pərvaz edir,
Cəbrəilin şəhpərinə naz edir.



Kim iki aləmdən üzün döndərir,
Qəlb ona ruzi sədəqə göndərir.

Göz, qulaq etməz bu yola iştiyaq,
Zahir olan pərdəyədir göz-qulaq.

Pambığı gül tək qulağa qoyma, çək!
Huşuna göz nərgisin olmuş çiçək!

Bu gülə, nərgisə pərəstiş nədir?
Səndən olub dağ, bu vərdiş nədir?

Göz ki, yetən nakəsə ayinədir,
Atəşi gənclik suyudur, gör nədir!

Təb' ki, dəllallıq edir əql ilə,
İstər ala yığdığını qırx ilə.

Cəm' qılır nəqd, yetir qırx yaşa,
Ta ki, vurur nəqd səfərlər başa.

İndi nə əfsun, sənə həmdəm gərək,
Qırx yaşının dərsi hələ kəm gərək.

Çək o belindən əlini, çarə gəz,
Parə ürəkçün ürəyi parə gəz.

Ğəm yemə, hərgah ki ğəmxar var,
Vur bu ğəmin boynunu, gər yar var.

Kim ki, ğəm içrə kəsilir taqəti,
Yar ona yar olsa, tapır qüvvəti.

Həmnəfəs olsa iki kəs bir nəfəs,
Yüz ğəmi yox etməyə bəs bir nəfəs.

İlk səhər yetsə nəfəs bir yerə,
Sonrakı avazə salar Ülkərə.

İlk səhər bəlkə görər xarlıq,
Sonrakı etməzsə ona yarlıq.

Tək sənə səndən nə gəlir hasilə?
Yar tələb qıl ki, gəlir yar ilə!

Gərçi hamı mülk deyil xar tək,
Yaxşı nəzər qıl ki, nə var yar tək?!

Yarə hamı kəsdə olur ehtiyac,
Həm də elə yarə ki, eylər əlac.

Bir-iki aludə bu dostun ki, var,
Həlqə tək etmiş qapı üstə qərar.

Əl at, ürək tapqırının ol bağı,
Ol bu su ilə ürəyin torpağı.

Tanrı yaratdıqda cahan mülkünü,
Xəlq elədi surətü can mülkünü.

Etdi bu tərkibə kərəm bir gilə,
Qatdı canı surət ilə bir gilə.

Bu – o ürəkdir ki, bu fitrətdədir,
Bu – o xələfdir ki, xilafətdədir.

Gərçi ürək xütbəsi sultanidir,
Mayəsi cismanidə ruhanidir.

Nur ədimində Süheyli onun,
Surət ilə can da tüfeyli onun».

Yetcək ürək ətri dimağım tərəf,
Yetdi beyin yağı çırağım tərəf.

Gövhərə bu həlqədə oldum sədəf,
Hatifi-canə canı qıldım hədəf.



Tökdü o yağdan bu dilim şəkkəri,
Təb' fərəhdən dolu, ğəmdən bəri.

İsti bulaq etdi soyuq su rəvan,
Qaynar idi bağrım odundan qazan.

Əltutan o həlqəni qırdım, həmən
Yolvuran aciz hamı, qüvvətli mən.

Bir nəfəsə çapdım iki mənzilə,
Yetdim ürək mənzilinə mən belə.

Can dodağa yetdi, ürək sarı mən,
Yarı gecə ömrü edib yarı mən,

Ruh tağında elədim taətim,
Döndü topa çovgan olan qamətim.

Əldə top idi, demə çovgan idi,
Ki, ətək ilə yaxa yeksan idi.

Gah ayağım baş, başım gah ayaq,
Gəh topabənzər, gəhi çovgansayaq.

Getdi iş əldən, mən özümdən, bu dəm
Yüz – biri gördüm, yüzü – bir, görmə kəm!

Həmsəfərim cahilü mən novsəfər,
Təklik acı, ğürbətim ondan betər.

Nə qapını açmağa bir qüdrətim,
Nə geriyə dönməyə bir niyyətim.

Təng bu yolda tutulurdu dilim,
Rəhbər olub tutdu bu dəm eşq əlim.

Həlqəni vurdum, dedi: – Kimdir? – Dedim:
«Adəmidir, ya qəbul et, ya gedim».

Pərdəni çəkdi qapının hacibi,
Pərdədən azad elədi tərkibi.

Gəldi bir avaz hərəmdən mənə:
«Durma, Nizami – dedilər, gəlsənə!»

O qapının məhrəmi oldum, bu dəm
Keç – dedi, qoydum içəri mən qədəm.

Bir saray idi ki, tamam çilçırağ,
Pis gözü etmişdi özündən irağ.

Yeddi xəlifə hamı bir xanədə,
Yeddi nağıl cəm' bir əfsanədə.

Mülk - fələkdən uca bir bağdadır,
Dövlət olan mülk bu torpağdadır.

Bu nəfəsabad yarım-isti diyar,
Başda günorta şahı tutmuş qərar.

Qırmızı atlı ona ikram edən,
Lə'lqəbalı – zəfərin ram edən.

Təlx cavan öndə şikar əsgəri,
Xılt yeyən bir həbəş ondan geri.

Əldə kəmənd, pusquya bir qəsd edən,
Simzireh digər igid misbədən.

Bu hamı pərvanə, ürək şəm' idi,
Cümlə pərakəndə, ürək cəm' idi.

Mehman olub qəlbə qənaətlə mən,
Verdim o şahə can əmanətlə mən.

Gördüm ələm çəkdi ürək ləşgəri,
Əhli-cahandan ürək etdim bəri.



Onda dilə gəldi ürək, söylədi:
«Quş tələb et, bu yuvadan uç – dedi.

Yoxdur odum tüstüyə məhrəm mənim,
Duzlu deyil tazə duzum həm mənim.

Sayəmə qüdrətlə yetən sayə yox,
Payəmə rif'ətlə yetən payə yox.

Qarun əlindən çox uzaq məxzənəm,
Sənsiz olan, sənlə yaxın həm mənəm».

İsti dəmi verdi xəcalət təri,
Tökdü dodağım quşu dil şəhpəri.

Yetdi həyadən mənə şərməndəlik,
Həlqə qulaqda ədəbə bəndəlik.

Xacə ürəkdən ki, qərar tazələr,
Tapdı Nizami adı avazələr.

Çarə riyazətdə görürdü yenə,
Xacə rəva gördü riyazət mənə.

## BİRİNCİ XƏLVƏT

Göstərib ustadım ədəb barmağın,
Açdı bağından məni doqquz tağın.

Gərçi dügün idi ipin hər yeri,
Çəkmədi bu ipdən ayaq heç geri.

Bir yerə yetdi ucu bu kəndirin,
Ki, bu dügünlər tutacaq bir-birin.

Xacə ki, əlqissə, bizə bənd idi,
Olmasa da Tanrı, xudavənd idi.

Hər iki aləm yoluna rəhbərim,
Yoxsa ki, çəkməzdi bu dərdi-sərim.

Olmasa bir mənfəəti həm, yenə
Eyləməz öz şəfqətini kəm mənə.

Oldu o mən biədəbə bir ğulam,
Ta ədəb öyrətdi, məni etdi ram.

Keçmədi məndən, əgər o ğəm yedi,
Söhbəti torpaqla ğənimət dedi.

Eylədi bu Misrdə Kən'anı tərk,
Eylədi Yusif kimi zindanı tərk.

Uyquya çəkdi gecə göz gövhərin,
Sübh gözü saçdı çırağ tək zərin.

Sübh çırağı fələkə nur saçan,
Çəkdi gecə sürməsinə zər haçan,

Xacə əlində yaxa oldu, çırağ,
Xacə əlində ətəyim oldu, bağ.

Ğəm tikanından qoparıb damənim,
Ta yaxamaycan bəzədi gül mənim.

Lalə kimi güldüm o gülzarə mən,
Gül kimi etdim yaxamı parə mən.

Lalə – ürəklə canımı dağladı,
Gül – kəmərin qurşağıma bağladı.

Mey kimi gəh qan ilə qəltan idim,
Gül kimi gəh şövq ilə xəndan idim.

Gəh gülə, gəh şaxə, gedib hər yana,
Gah gəlirdim su kimi tüğyana.



Eşq o yerə çəkdi ki axır aləm,
Yetdi vəfa ətri mənə dəmbədəm.

Mehdə olan nüktə ilə incə səs,
Oldu mənim könlümə İsanəfəs.

Ta yerə endirdi kəcavəm mənim,
Verdi səbayə yürüşün köhlənim.

Düş yerə, dəm vurma belə sən – dedi,
Ki, səni səndən alaram mən – dedi.

Mən ki, o suyə düşüb oldum gəmi,
Yetdi mənə onda Behiştin dəmi.

Bir qədər endim o rəvan su ilə,
Yanğı canımda yeridim sahilə.

Gördüm o Gündən daha rövşən bulağ,
Ki nə görüb Xizr, nə bu mavi tağ.

Yasəmən üstə yatağı var idi,
Uyqulayan nərgisi bimar idi.

Çərx ona dairəsiylə məqam,
Cənnət ona ğaliyəsiylə ğulam.

Gül, yaxasında oturub gülşənin,
Xar, ayağı alta çəkib damənin.

Ahu ilə tülkü bu gülzardə,
Nafəsi güldə, göbəyi xardə.

Tuti o güldən ki, şəkərcan idi,
Səbzənin üstündə pərişan idi.

Şir tək əlində şəkər, ot tər-təzə,
Ahu o şəkkərdən edirdi məzə.

Gül çadırından meh olur aşikar,
Ahu budaqlardan edir gül şikar.

Xeyri mixəklə qarışıb yeksərə,
Yelpik olub bağda olan ənbərə.

Nərgisi zahirdə gözün sürməsi,
Zümrüdü əf'i gözünə iynəsi.

Yasəmənü gül dağıdır karivan,
Bülbül ilə qümri qoşur dasitan.

Sübh açıb tər süsən İsa dili,
Sübhə əyan eylədi Musa əli.

Faxtə fəryadı ilə sübhdəm,
Faxtərəng oldu fələk tağı həm.

Yazdı səba ümmid əliylə özü,
Müşk-söyüd yarpağına gül sözü.

Gəldi çəmən təbrikinə gəh bahar,
Getdi gülün tə'ziminə gah xar.

Türk səmən xeyməsi səhradadır.
Ayparası gərçi Sürəyyadadır.

Laləni atəşgaha çəkmişdi raz,
Hindu müğü tək o qılırdı nəmaz.

Laləsifət hindu ilə türk səmən,
O – qara qarğa, bu – Süheyli-Yəmən.

Qaqum idi şəffaf, əgər ab idi,
Türfə idi, qaqumi sincab idi.



Bağ bacası çəkmiş ələm al-sarı,
Pəncərələr açmış idi göy sarı.

Şurə şükufə gətirib çərxi həm,
Sayə ayağına tökürdü dirəm.

Sayə gəlir Gün dodağıyla dilə,
Canə gəlir qum su edən zikr ilə

Dişlədi ğönçə müjəsi gül ləbin,
Nəsrinin etdi yara sünbül ləbin.

Xeyri ki, xardan boş idi oxdanı,
Nə amanı var idi, nə qalxanı.

Sehrdən əsdikcə söyüd peykəri,
Lalə idi tüstü verən məcməri.

Uçmaq üçün cilvələnirdi çəmən,
Nazik idi, rizələnirdi səmən.

Güldə qarışmışdı gülüş şəkkərə,
Gül kürəni nə'li batıb qan-tərə.

Xoş nəfəsindən təbii güllərin,
Qissəsi vardı xoş əsən yellərin.

Gəldi turunc yarpağı tək göy, həman
Əldəki narıncı ilə asiman.

Çərx ələm çəkdi, bu rəftardən
Səbzə mədəd istədi gülzardən.

Süfrəsi göy riştəli bu busitan,
Hər dügünü Ərşə ürək, fərşə can.

Bəlkə də iqbal dedi sübhdəm:
«Ey zəmi, asudə yaşa, çəkmə ğəm».

Ya ki, fələk təşrif edibdir yenə,
Səbzəni səccadə edib gülşənə?!

Çeşmə gözü huri gözündən duru,
Gün bulağından aparırdı nuru!

Səbzə edib ğüsl o bulaq üstə həm,
Şükr ilə durmuşdu ayaq üstə həm.

Güldə Süleyman nəfəsin quş duyub,
Çəkdiyi Davudi nəvadən uyub.

Qırqovulun qanını tökmüş, deyə,
Çəkdi turac sərv ağacın həlqəyə.

Cümlə çəmən qaziləri hökm ilə,
Qarğa qanın etdi həlal bülbülə.

Bayquş o yurdun ki atıb daşını,
Vermiş ürək sirrinə öz başını.

Etdi Süheylin mehi əscək bəri,
Yer dərisindən yəməni bir dəri.

Lalə yügürməkdən olub biqərar,
Bağrı yanıq əsməyə olmuş düçar.

Sayəsi şümşadın atıb lütf əli,
Laləyə xamuş elədi mənqəli.

Sübhsifət yasəmənin dırnağı,
Sildi gözündən gecənin Ay ağı.

Kəndiri zər Yusifin ataş suyu,
Qazdı səmənlər çənəsində quyu.

Gil – sarı köynəkdə yəhudi-sayaq,
Su – «yədi-beyza»nı verirdi soraq.



Gil ki məruz idi, dəva tapdı bəs,
Udduğunu qusdu, şəfa tapdı bəs.

Nur ilə tutduqca səhər sahəni,
Şax ilə gəzdirdi səba sayəni.

Verdi Ayın dişlərinə Gün dodaq,
Çəkdi söyüd tellərinə yel daraq.

Bayrağı altda budağın şur ilə,
Sayə suda rəqs eləyir nur ilə.

Ud idi o xar ki, məqsud idi,
Gül odu məcmərdə yanan ud idi!

Gül budağı minbər idi bülbülə,
Zülfi-bənövşə kəmər idi gülə!

Quşda ki Davud əsəri var idi,
Güldə Nizami şəkəri var idi!

## HƏQİQƏT MÜŞAHİDƏSİNDƏ

Ta ki niqab atdı bir üzdən külək,
Tutdu üz aşiqliyə huşyar ürək.

Gördü şəkər xəndəli bir gülnəfəs,
Ondan alır şəkkər ilə gül nəfəs.

Yığdı kətan geymiş o ay damənin,
Yaxdı kətan tək o Ayın xirmənin.

Zülfü zireh tək kəmərəycən sipər,
Başdan-ayağə duz içində şəkər.

Gördülər o ulduzu duz tökdülər,
Gördülər onda duzu, duz tökdülər.

Duzla qarışmış şəkəri dilbərin,
Tökdü şirin-duzluların şəkkərin.

Tutini etmiş şəkəri şərmsar,
Tuti başı tək çənəsi həlqəvar.

Yumru çənə altda da narınc-sayaq,
Vardı turunc tək gümüşü bir buxaq.

Sərxoşa bostan gülü tək mehriban,
Dost şərabı kimi peyman qıran.

Əldə təbərxun təbəri mərcanı,
Tökdü təbərxunla təbərzəd qanı.

Qırmızı bir gül, təzə-tər neyşəkər,
Saf nəbat, qənd-gülab idi tər.

Ud xalından cigərə dağ çəkər,
Ğaliyə gündüz sədəfindən tökər.

O qara xalından onun danə tək,
Olmuş Ayın çöhrəsi xal-xal çiçək.

Cəz'i – Günəş tək cigəri yandıran,
Lə'li – qəmər tək gecə nurlandıran.

Yol ki, ürəkdən ona fərsəng idi,
Yol yox, ağız meydanı tək təng idi.

O daş ürəkdən ki cigər yarədir,
Yarə cigərdən bu ürək parədir.

Sözdə, dodaqda gülüşü, şəkkəri,
Üzdə dua, ğəmzədə əfsungəri.

Bağlı ağız hoqqəsi ki, möhrə var,
Çıxmağa bir möhrə yolu vardı dar.



Eşq görüb hoqqə ilə möhrəni,
Sərdi oyunbazlıq edib süfrəni.

Açdı belimdən sifətim kisəsin,
Çəkdi canımdan bədənim həlqəsin.

Qaldı nə taqət, nə də ki bir davam,
Abi-həyat aşdı başımdan təmam.

Div görüb əqlimiz əfsungəri,
Zəncirə çəkdi onu axır pəri.

Şadlıq əliylə ki ürək ğəm silər,
Gil ilə Gün çeşməsin örtmək dilər.

Gəm çəkənin ğəmdir olan məhrəmi,
Mey içənin meydir olan mərhəmi.

Alnı, sən ey isti dağımdan mənim,
Bixəbər ey səbzə-bağımdan mənim!

Səbzə fələk idi, nəzər nur ona,
Bağ səhərdi, su gözüm şur ona.

O gözəl üz pərdədə ki xas idi,
Ayinədə əks edən ixlas idi.

Baş dizimin başına qoydum, belə
Gəldi ucu bu ipin axır ələ.

Mən ki, yəqin yolla səfər etmişəm,
Get bu yol ilə, necə mən getmişəm!

Məhrəm olaydın bu yola sən də kaş!
Get, bu Nizami işinə qoşma baş!

## GECƏ İŞRƏTİ VƏSFİNDƏ

Bir gecə xacə keçə ta xoş dəmi,
Etdi təmənna iki-üç həmdəmi.

Sübh kimi bir gecə aşkar idi,
Hər nə dua etmiş idi, var idi.

Novbahar ayinli ziyafətdi bu,
Dövrdən asudə bir işrətdi bu.

Dəm bacasından ki buxur ah edir,
Yusif ilə köynəyin izah edir.

Şihnə gecə tökdü qəravul qanın,
Tökdü qanad milçək, atıb qalxanın.

Pərdə qananlarda nəva heyrəti,
Pərdə tutanlarda vəfa qeyrəti.

Nət' başından ayağıyla Süheyl,
Lə'l, yətim dür başına saçdı leyl.

Şəm' cigər yaxdı cigər şəm'i tək,
Oldu ürək atəşi atəş-ürək.

Ud təbəqdə qarışıb şəkkərə,
Şəkkəri ud ilə yaxır məcmərə.

Şişə gülab-qənd ilə gövhər səpir,
Şəm' də əmmamə ilə zər səpir.

Meylə noğul busə üçün can atır,
Gözlə dodaq şəkkərə badam qatır.

Şəkkər uzun nüktədə badam ilə,
Zöhrə uyub eşqdə Bəhram ilə.



Və'də qulaq üstə gəlir müjdəyə,
Xəndə dodaq üstə gedir sədqəyə.

Tülkü xəzi altda pələngiydi bir,
Nafeyi-ahu ilə zəncirdə şir.

Naz ilə aşiq yaxasın yar çəkər,
Rəqs ilə qolları cəvahir tökər.

Şəm' tutub əldə qədəh, meypərəst,
Teşt bulaşmış meyə, pərvanə məst.

Uyqu qanad tökmədə pərvanə tək,
Şəm' başın əymədə şükranə tək.

Pərdə tutan Zöhrə nəva ilə xoş,
Pərdə tuturdu xoş əda ilə xoş.

Uyqu aparmaqda dimağdan dimağ,
Nur qoparmaqda çırağdan çırağ.

Hər nə ki yüz ömrdə tapmaz o kəs,
Burda tapar bir nəfəsə həmnəfəs.

Töhfə verir, ən'am edir, ərməğan,
Qəlbə – ürək, cismə – bədən, ruhə – can.

Sanki, bu məclisdən atılmış varı,
Çəkmiş ədəm varını yoxluq sarı.

Bağladı şadlıq quşu xət şəhpərə,
Tökdü Sürəyya quşu şəhpər yerə.

Sübh quşu atəşi, şişdən çəkər
Bağrına xoş-duzluların su tökər.

Quş uyub ağır yuxulu sübh tək,
Əl-ayağı bağlı idi Ay, fələk.

Pərdə – qapı həlqəsi biganəyə,
Həlqə – pəri türrəsi divanəyə.

Qəlbi o çənbərdə olan Müştəri,
Olmuş üzük həlqəsinin çənbəri.

Ğarət edir qəlbi pərizadələr,
Getmiş özündən təmam azadələr.

Qəlb yolunda ki, səmən əkdilər,
Kirpik ucuyla tikanı çəkdilər.

Neyşəkəri üzdə ürək meyvəsi,
Narvəni canə çiçək dəstəsi.

Fındığı şəkkər kimi, badamı təng,
Xətti təzə, püstəsi innab-rəng.

Bu gecə xəttindəki sehri-həlal,
Babili bir ğəmzə idi, hindu xal.

Hər nəfəs o ğəmzə ilə, xal ilə,
Döndü cahan hind elinə, Babilə.

Onda ki xoşlandı nəzərdən, özü
Getdi ürək, etdi ziyarət gözü.

Odlu tikan ğəmzəsinin dilləri,
İşlərimizdən də dügün telləri.

Ğəmzə ki, ox atmağa pərgar idi,
Atdı, nə ki atmadığı var idi.

Gəldi Məsih ətri ürəkdən bu dəm,
Xizr suyu torpağın ağzında həm.

Ğaliyə asmış qulağa gül-çiçək,
Çiynino almış yəhər Ay çərx tək.



Çöhrə, dodaq şəkkərü badam saçar,
Gül pənah üçün şəkər üstə qaçar.

Hər nəzər aləm canı bürhan üçün,
Hər müjə bütxanə idi can üçün.

Ağ gümüş üstə qara tellər gələr,
Müşk-söyüd yarpağına müşk ələr.

Ağ buxağı ki, su idi qurşağı,
Etdi Günəş atəşi göy qurşağı.

Zülfü – Birahim, üzü – atəşgəri,
Çeşmi – Simail, müjəsi – xəncəri.

Atəş ona reyhan idi dəstədə,
Xəncər ona nərgis idi fitnədə.

Busəsi məst etməyə peymanə bəs,
Ləbləri İsa nəfəsi canə bəs.

Tər – yanağında güli-nəsrin idi,
Xirməni – sünbül kimi Pərvin idi.

Ta yaxası düyməsini açdı hur,
Yazdı səhər xəttinə tuğranı nur.

Himmət ilə xas, ürək ilə əvam,
Sərsəm olub düşdü o nurdan təmam.

Susmuş ağız, ğəmzə edir qaş-gözü,
Dil tutulub, göz danışır hər sözü.

Mey bəzədi gül kimi o iqlimi,
Cam zər idi simdə nərgis kimi.

Əql həm o həlqədə sərxoş qalır,
Səbrdən axırda əliboş qalır.

Yol ki, ağızlarda gülüşdən dolur,
Taqətin «ah» taqəti hardan olur?!

Səbrə o pərdədə nəva təng idi,
Fitnəyə şur ilə xoş ahəng idi.

Saz xoş avazı ilə Davudun,
Tapdı hədisin Əyazın, Məhmudun.

Saçdı Nizami sözü həm şəkkəri,
Oldu gözəllər dilinin əzbəri.

## İKİNCİ XƏLVƏT

O əzəli fərşdə bu ömr ilə,
Gəldi nə getmişdi yenə hasilə.

Göz dua etdikcə həmin səcdədə,
Etdi qulaq şükr həmin nüktədə.

Ğüssəli türklər gülüşündən şəkər,
Sürmə çəkən ahu gözündən nəzər.

Ay tək o türküm ki, geyinmiş kətan,
Göz-göz edib bağrımı etmiş nişan.

Ay, gecədən keçsə də mehman idi,
O gecə sübhə kimi heyran idi.

Ğəmzə oxu onda ki pərvaz edir,
Busə üçün can onu pişvaz edir.

Şəm'in o nurdan gözü yaş, bağrı dağ,
Qibtə çırağın gözünə saldı ağ.

Hər sitəm ilə ki, cəfa başladı,
Qəlb vəfa ilə onu xoşladı.



Gah o su idi, mən isə busitan,
Gah o Günəş, mən isə paltar yuyan.

Mən o gecə xurma ki daddım şəkər,
Yox xəbərim, gərçi varımdır xəbər,

Nur kəmərli o təzə ay nədən,
Təzə ayı gizlədi divanədən.

Aşiqinə aşiq imiş xəlvəti,
On dəfə məndən çox imiş rəğbəti.

Gündüzə eylərdi təmənna ürək,
Yaxmaya pərdə bu gecə sübhədək.

Bu gecə olsaydı səlamətlə sübh,
Həmnəfəs olsaydı Qiyamətlə sübh!

Gün tək o rövşən gecədən yox əsər,
Axtarıram, uyquda tapdım məgər.

O gecədən sonra nə təskin mənə!
Ta ki «gecən xoş» dedi, nə gün mənə!

«Yarəb, yarəb!» deyirəm hər gecə,
Şayəd, olur bir belə digər gecə!

O – nə gecə, Gün ona möhtac idi,
O – gecə idi, vəli me'rac idi!

Ay ki, fələk lə'li üçün kan qazar,
O gecədən hər gecə bəs can qazar.

Gündüz ilə məzhəbi düşmən gecə,
Həm edir arzu belə rövşən gecə.

Sübh ki asudə idim, bixəbər,
Girdi qılınc əldə qapımdan səhər.

Düşdü Günəş atəşi müjganıma,
Çeşmə rəvan eylədi eyvanıma.

Gəldi bulud rəqs ilə bu bağ sarı,
Oldu pak ondan Günəşin paltarı.

O Günəşin çeşməsi, bir hövzə su,
Gör nə qədər qırdı bizim tək səbu!

Çərx gümüş sikkə vurub bir təbəq,
Çəkdi Günəşdən ona zərrin vərəq.

Sübh yünül durdu ağır uyqudan,
Xəncəri qan tökməyə doymuş sudan.

Qalxanı atdım bu döyüşdə yerə,
Qalxan edib canımı o xəncərə.

Sübh canım qəsdinə durdu, həman,
Görpünü qırdı, verirəm təşnə can.

Naləyə gəldi bu xərabatımız:
«Bu deyil, ey sübh, mükafatımız.

İndicə ki, həmnəfəsim var idi,
Şamıma şəm'imlə kəsim var idi.

Getdi, nə şəm'im, nə şamım qalmadı,
Sanki yox imiş, elə yox olmadı.

Vur şəkərindən yeyənə neştəri,
Çək cigərindən didənə xəncəri.

Xamı, səvabdır, elə büryan yenə,
Yanmışı yaxmaq olur asan yenə».

Qan-yaşımı sübh görən tək rəvan,
Şəfqətim üçün şəfəqə tökdü qan.



Yaxdı günüz xirmənini ğəmlərim,
Sıxdı Günəş çeşməsini dəmlərim.

Vardı bu zəhr içrə fələk müjdəsi,
Verdi gecə əf'isi Gün möhrəsi.

Sübh nurundan necə tapdım əsər,
Bixəbərəm gər, yenə tutdum xəbər –

Bu beşiyə yol tapanın əksəri,
Tapdı səhər nuru ilə rəhbəri.

Ey gecəsi xiclət üzündən qara,
Hər gecən işrət günüzündən qara!

Bu gecədən bir sifət idi, dedim,
Ki bu sifət mə'rifət idi, dedim.

Pərdədə tənhayə bəyandır gecə,
Şəm'i nəzərdir ki, əyandır gecə.

Udu, gülabı ki onun varıdır,
Naləsidir, göz yaşı, bimarıdır.

Ərşdə ki, hüsn ilə tapdı hüzür,
Bu gecə – «Qədr» idi, xəyalatı – nur.

Məhrəm hanı cəngli bu pərdəyə,
Zənci saçı rəngli bu pərdəyə?!

Sübh ki, pərvanəlik eylər, haçan
Şəm'i olubdur belə xoş nur saçan?!

Cəhd elə bu şəm' ilə ol sən də dağ,
Bəlkə, Nizami kimi tapdın çırağ!

## BİRİNCİ MƏQALƏ
## ADƏMİN SİFƏTİ HAQQINDA

Yoxdu bu aşiqlik o dəmdə hələ,
Varlığın avazı adəmdə hələ.

Gəldi ədəmdən yaranıb bir nəfər,
Açdı vücudə qapı o bəxtəvər.

Sonbeşiyi idi pəri nəslinin,
İlki idi həm də bəşər əslinin.

Gəldi, xilafətçün o çəkdi ələm,
Endi ələm tək, ucalıq tapdı həm.

«Əlləmə Adəm» – sifəti-pakıdır,
«Xəmmərə tinə» – şərəfi-xakıdır.

Gövhər ilə həm kədər, həm safdır,
Həm məhək, həm zər, həmi sərrafdır.

Tazə cavandır ki, mələk heyrəti,
Ayinəsində bəşərin surəti.

Qolbağıdır can qoluna bir nigar,
Qolbağıdır yeddi fələk aşikar.

İki beşikdə böyüdüb dayəsi,
İki ilikdən qarışıb mayəsi.

Ondan alıb xəl'əti zindanilər,
Ondan alıb bədəni ruhanilər.

Xilqətə sərhəd kimi bazarı var,
Bakirə qüdrət kimi me'yarı var.

Yox dili, qırx günlük uşaq idi bir,
Tə'lim edirdi ona qırx yaşlı pir.



Eşq xəti etdi gözəl surətin,
Gülbünü idi o gözəl Cənnətin.

Nurdu o gözdən ki, bəsirətlidir,
Quşdu o şax üstə ki, qamətlidir.

Danə fələk quşları ondan yeyib,
Baş hamı torpağə onunçün əyib.

Etdi kərəm, atdı o bir danəni,
Verdi libası, bəzəyi, xanəni.

Bir tora saldı onu danə bu dəm,
Dəyməz o şükranə bir avazə həm.

Gəldi dualarla vücudə, odur,
Səcdəyə düşdü bütün aləmdə şur.

Torpağı oldu hamıya qibləgah,
Məğrur olan sandı onu bir günah.

Gül elədi üstünə səkkiz bağ,
Hamıya gül yetdi, tək İblisə dağ.

Sənsiz onun şad olan əndamı yox,
Bir dəm İrəmdə ürək aramı yox.

Qalmadı sultanlığa həm taqəti,
Çünki, ğəmindən yox idi rahəti.

Tazədən arzunla olan bir zaman,
Buğda yemək oldu ona arpacan.

Buğda odu yaxdı onu qorğa tək,
Bağrını parə elədi buğda tək.

Buğda kimiydi, ayağı-başı yox,
Torpağı, azuqəsi, həm daşı yox.

Gəldi atılmaqla ümid hasilə,
Oldu əzilməklə üzü ağ belə.

Oldu saman tək dərisi buğdayı,
Çulğadı kafur ləkə guya Ayı.

Buğda kimi torpağa qatlandı gər,
Buğda qəmiydi tək ona dərdisər.

Ta o rəzildən yedi asan onu,
Buğda kimi eylədi üryan onu.

Gördü o bədxahdan o qəddarlıq,
Buğdaya meyl etmək ilə xarlıq.

Ğayib olub can teli biganədir,
Tor sənə buğda dediyin danədir.

Buğda yeyincə, ye cigər qanını,
Xar eləmə nəfsin ilə canını.

Buğda yeməkçün ağız açdın, o dəm
Başdan-ayağə ağız açdı o həm.

İndi ye arpa çörəyi, yox ğəmi,
Buğda yemə, aldadıb o Adəmi.

Ey ürəyin peyki, burax şeytanı,
Tutma qapı, ey əmirin aslanı.

Ta ki, yuyub çirki dərindən silə,
Tövbə qıl Adəm kimi sən sidq ilə.

Təqsir üçün üzrdür ən xoş məram,
Üzr ilə Adəm də tapıbdır məqam.

Danəyə artdı elə ki rəğbəti,
Oldu bu ğürbət yer onun xəl'əti.



Xam tamahın dərk eləyəndən sora,
Düşdü həmin danə ucundan tora.

Şur ilə verdi su bu solmuş gülə,
Qurdu Sərəndibdə çadır şur ilə.

Gəzdi qara üzlə, ümidlə pənah,
Torpağa tökdü qara, yə'ni günah.

Nil küpü altında o Hindistanın,
Nilçilik ilə yudu öz bostanın.

Çərx nilindən yuyulan tək əli,
Bitdi ayağında onun ot nili.

Oldu Xəta türkü o, Ay tək bu dəm
Qoydu xəta zülfü papaq altda həm.

Tövbə ilə qəlbi lətafət tapıb,
Cümlə vilayətdə xilafət tapıb.

Əkdi vəfa danəsi adil yerə,
O yeri vəqf etdi bizə yeksərə.

Hər nə Behişt xəznədarı etdi bəxş,
Cümlə bu doqquz çadıra etdi nəqş.

Cəhd elə bu mayədən ol bəhrəvər,
Əkdi o, biçməklə də sən gör səmər.

Sızladar udu nəfəsi məcmərin,
Rənc – ulağın, rahəti – palangərin.

Sənsiz işə səhman haçan verdilər,
Onda səni lütfə nişan verdilər.

Dalğalanan gül gəmisi ol bahar,
Ləngər ilə olma bu bostanda xar.

Yol get ürəklə ki, gəlincə xəzan,
Su başa qalxır, qalır atəşdə can.

Şir ürəyin yox, şir ikən surətin,
Var ürəyin, amma ki yox cür'ətin.

Qəsrdə nəqş etsə də şiri qələm,
Tərpənə bilməz o, yüz il keçsə həm.

Sanma münasib bu fələk xəl'ətin,
Torpaq ikən torpaq olur ziynətin.

İşlərinin talei möhkəm deyil,
Kəm ürəyindir ki, ğəmin kəm deyil.

Yoxsa ki, etməzdi bu çərxi-bülənd,
Sən kimi bir şəhriyarı şəhrbənd.

Dairəkirdar, kəmərbəstə ol,
Çərx ilə, əmrindəsən, ahəstə ol.

Tünd yeriş atəşə rəftar olur,
Tünd yerişdən qalana ar olur.

Su kimi yüngül yeri, var saf suyun,
Ağır olur qiyməti şəffaf suyun.

Gövhərini cismə zəiflik verər,
Qiymətini canə zəriflik verər.

Yel ki yünül ruh ilə dövran edir,
Bəs səni Qaf tək nə ağırcan edir?!

Uyma belə xar kimi rəng ilə,
Öz-özünə uydu bənövşə belə.

Cümlə bu saf aynada parlar üzün,
Ki, sənə dikmiş gözünü öz gözün.



Sən qəbul etdin nə qədər hədd var,
Ki, hamıdan «heç» kimi oldun kənar.

Sən özünə, surətə aşiq hələ,
Çərx kimi ayinə aldın ələ.

Arpa qədər dadsan əgər ğəm duzun,
Qalmaz əlində atəyin duzsuzun.

Zülmü kənar eylə vəfadən yapış,
Xəlqi qoy asudə, Xudadən yapış.

Gör səvab işlər, gör Onu xeyrxah,
Boynuna al sən ki, çox etdin günah.

Olsa xəcalətlə nəfəs adətin,
Dadə yetəndən yetəcək rəhmətin.

## ZALİM PADŞAHIN DASTANI

Uyquda görsəndi səvab rə'y ilə,
Surəti bir zülmkarın adilə.

Sordu: – «Səninlə de, Xuda etdi nə?
Zülmünə zülmətdə cəza etdi nə?»

Söylədi: – «Ömrün o yetən son dəmi,
Son nəzərim seyr elədi aləmi.

Kimdən olur ta ki hidayət mənə,
Tanrı hüzurunda inayət mənə.

Nə bir ürək vardı mənə mehriban,
Nə birinin lütfünə az-çox güman.

Əsdi vücudum, necə titrər söyüd,
Üz qara idi, həm ürək naümid.

Girdaba ğərq olmağa verdim qərar,
Eylədim həq rəhmətinə e'tibar.

Əfv elə, yarəbb, zəliləm - dedim,
Keç günahımdan ki, xəciləm - dedim.

Buyruğunu etməmişəm gərçi mən,
Rədd eləyib hamı məni, etmə Sən.

Ya ədəbim odda giriftar elə,
Ya hamının əksinə rəftar elə.

Gördü mənim halımı fəryad edən,
Dadıma yetdi mənim o dad edən.

Rəhmətini etdi pənahım mənim,
Tutdu məni, atdı günahım mənim».

Ömrdə əfsusla keçən hər nəfəs,
Qorxulu Məhşər gününə şihnə bəs!

Sən ki, yel ölçməklə keçib hər dəmin,
Rənc tərəzində çanaqdır həmin.

Doldu çanağın il ilə, ay ilə,
Ötdü ayın, yetdi ilin mənzilə.

Yoxdu tərəzində nə gövhər, nə daş,
Doldu piyalən, çanağın qaldı boş.

Daş bu tərazudə olunmaz pəsənd,
Yer daşını etməginən bazubənd.

Bəndəlik eylər bədənin dirhəmə,
Bağlıdır ömrün də sənin bir dəmə.

Hər nə verib pərdəli ruzgar, ver,
Alma özün, ta ki varın var, ver.



Bir gün olur ki, sənə imdad edir,
Ağzını boş, boynunu azad edir.

Yoxsa, yətimlər ətəyindən çəkər,
Yoxsa, dul arvad yükü boynun bükər.

Dur, bu dağılmış kilimi ver yelə,
Qalx, bu bulaşmış ətəyin pak elə.

Ya bu Nizami kimi bir guşə tut,
Ya ki, ğərib tək yol üçün tuşə tut.

## İKİNCİ MƏQALƏ
## ƏDALƏT VƏ İNSAF HAQQINDA

Ey fikiri canlıların sərvəri!
Ey ayağı taclıların gövhəri!

Cəhd elə şahlıq evinə sərvər ol,
Sə'y et ilahi tacına gövhər ol!

Yol o cahandan yana hərgah yox,
Mən ilə səndən səvay agah yox.

O əzəli nur ki, nəqş etdilər,
Hamıdan artıq sənə bəxş etdilər.

Nəqd əzizsən, sənə aləm diyar,
Nəqd bu aləmdə sənindir nə var.

Mülk bu şə'n ilə sənindir əgər,
Sinə gərib hamı sənə, sinə gər!

Dövrün ötüb dairədən həm sənin,
Payənə yetməz iki aləm sənin.

Ayinə tutmuşdur o üzdən səhər,
Ta görəsən öz üzünü sən məgər.

Bu beşik, ey tifl ki, tağdır sənə,
Yol boyu asudə yatağdır sənə.

Can quşu, həm ruhə Məsihsən, əgər
Sən kimisi var, elə sənsən digər.

Sinəsi atəş dolu Gün xoşdu həm,
Ruyini görməklə sənin dəmbədəm.

Ay ki, telin tək nə zaman incəlir,
Ruyinə etdikcə təmaşa gülür.

Aləmə qul olma, yaşa xoş, nə ğəm,
Kimsədən aləmdə deyilsən ki kəm!

Həm aşağı ol hamıya gil kimi,
Həm əliboş ol hamıdan yel kimi.

Torpaq olur xoş, olur üryan əgər,
Ki, toz olur eyləsə tüğyan əgər.

Tanrıya ver könlünü, dövlət budur!
Var isə pakizə fəzilət, budur!

Dini sorağ et, bu dəyanət hara,
Biz hara, ey vay, əmanət hara!

Hər ürəyə dindən əsər verdilər,
Gör o cahandan nə xəbər verdilər!

Dinə əlac et, cahanın var hələ,
Bəlkə, gətirdin sən onu həm ələ.

Dini bu dünyayə gər alsan yenə,
Divdən «et!», «etmə!» yetişməz sənə.

Cövhər ilə qədrdə bu kəhrəba –
Arpa qədər hər daşı pud kimiya.



Tök ətəyindən bu daşı, gövhər al!
Ver bu Yerin torpağını, sən zər al!

Kim yola azuqə səninçün görər,
İstəyi səndən bir ikən on verər.

Kimsə bu cür mayə güman eyləməz,
Mənfəət eylər ki, ziyan eyləməz.

Dini sənə bəsləməyə verdilər,
Adil olanlar bu cür iş gördülər.

Etsən ədalət, sənə imdad edir,
Xəlqdən artıq səni azad edir.

Xeyrxah olsan şəhərə, ləşğərə,
Xeyrini istər həm olar min kərə.

Zülm ilə viranə olur məmləkət,
Baqi olan dövlət olur mərhəmət.

Aqibəti yad elə əvvəl hələ,
Gör nə edirsən, bir onu fikr elə.

Xəlqə rahatlıq dilə, kəs zülm əlin,
Yoxsa, xəcalət olacaq hasilin.

Əql düşüb məst, xoş uyqudədir,
Ğərqdü tədbir gəmisi, sudədir.

Tut ki, zəif mülkünü saldın ələ,
Ya ki, yətim malı yedin zülm ilə.

Həşrdə ki, qazi olan hökm var,
Varmı bir üzrün, sənə olmazmı ar?!

Arxa çevir sən Günə, üz dinə tut,
Arxa ki zərdüştiliyindir, unut!

Bu sarı top, zərnix oyuncağə bəs
Heyzli arvad kimi etmə həvəs.

Köhnə bu pərdə nə ki eylər əyan,
Zərnix oyuncaqla oyundur həman.

Dəm ver ona məğzdən İsa-sayaq,
Öz yağını et bu çıraqdan iraq.

Sən, necə pərvanə, qanad salma, qalx!
Bir çırağa təslim olub qalma, qalx!

Parələ bu pərdəni İsa tək at,
Ta ki, ayağın ola İsa-qanad.

Can damarın tutsa kim İsa kimi,
İnsaf ucundan tutacaq iqlimi.

Aləmi fəth eyləyə bilməz sitəm,
Mülkü kərəm fəth edər ancaq, kərəm!

Hər nə ədalət ki deyil, yad elə!
Hər nə ki insaf deyil, ver yelə!

Ədl – bəşarətdir, ürək şad edər,
Xidmət odur – məmləkət abad edər.

Məmləkət insaf ilə aram tapır,
İşlərin insaf ilə əncam tapır.

## NUŞİRƏVAN İLƏ VƏZİRİN DASTANI

Ovda idi bir gün Ənuşirəvan,
Bir tərəfə oldu at ordan rəvan.

Şah ki, gəzirdi nəzəri hər yeri,
Şahdı, vəzirdi, yox idi digəri.





Gördü bu ovlaqda xərab kənd var,
Ki, necə düşmən ürəyi, tarümar.

Gəldi iki quş ki, həmahəng idi,
Qafiyəsi qəlbi kimi təng idi.

Sordu vəzirdən ki: – «Nədən dəm vurur,
O nə ulaşdı, bu nədən uydurur?»

Söylədi: – «Ey şahi-zaman, söylərəm,
Alsan öyüd, versən aman, söylərəm.

Bu iki quş şadlıq üçün bəhs edir,
Burda nikah barədə söhbət gedir.

Bu quşa qız vermiş o, istər o həm
Ta ona başlıq verə bu sübhdəm,

Həm bu xərab kəndi ki, var tarümar,
Həm neçə bu kənd kimi viranəzar.

Digəri – bundan güzər et, keç – deyir,
Şahda bu cür zülmü görən qəm yeyir?!

Şah budursa, daha dövran nədir!
Verməyə yüz min belə viyran nədir!»

Hali olub, şahı yaman tutdu söz,
Ah çəkib, vay-fəğan tutdu söz.

Çəkdi elə odlu nəfəs şah bu dəm
Ki, atının nə'lini yumşaltdı həm.

Bir başı oldu məlikin, bir əli,
Gör ki nədir zülm edənin hasili!

Ğüssədən öz barmağını dişlədi:
«Quşlara həm zülmüm əyandır – dedi.

Burda gərəkdi otura ev quşu,
Ev quşuna etdim əvəz bayquşu.

Neyçün olaydım belə ğafil gərək?
Başə ölüncən sovurum kül gərək!

Xəlqi çapıb zülm ilə etdim zoru,
Məhşəri yad etdim, unutdum goru.

Bunca bəs oldum əluzun gör ki mən,
Başıma açdım nə oyun gör ki mən.

Tanrı verib mülk ilə dövlət mənə,
Ta xoş əməllər ola adət mənə.

Ta bu uca payəyə mən yetmişəm,
Daima buyrulmayanı etmişəm.

Zülm ilə etdim adımı zay mən,
Zülm elədim öz-özümə, vay, mən.

Olmalıyam indi həyadən xəcil,
Ya öz-özümdən, ya Xudadən xəcil.

Oldu bu gün zülm təmaşa mənə,
Vay, sabahım baxa rüsva mənə.

İndi səmərsiz bədənim odlanır,
Könlümün əhvalına bağrım yanır.

Qalxdı bu zülmün göyə tufanı çox,
Axdı günahsız ürəyin qanı çox.

Türktazımdan çəkilən gün hesab,
Qorxmayacaqlar, soracaqlar cavab.

Mən ki, varımdır bu xəcalət, bu nəng,
Bu daş olan bağrımı etməzmi təng?!



Gör nə qədər indi məzəmmət çəkim,
Həşrə qədər ta ki xəcalət çəkim.

Yükçəkənim indi olub yük mənə,
Çarəmi biçarəlik eylər yenə.

Bu dolu küpdən ki, gühərdi təmam,
Görmədi bəhrə nə Nəriman, nə Sam.

Gər yetib əmr ilə vilayət mənə,
Nə yetər ömr ilə nəhayət mənə?!»

Şah yetincə aləmə, dəstəyə,
Yetdi nəvaziş qoxusu ölkəyə.

Aldı həmin yerdə qələm, çəkdi xət,
Hər nə ki yazmışdı sitəm, çəkdi xət.

Zülmü atıb etdi ədalət şüar,
Dönmədi ondan nə qədər ömrü var.

Xeyli keçən sonra fələk dövranı,
Getdi o, qaldı yerinə ad-sanı.

Hər pak ürəkdə ki, onun yadı var,
Sikkəsinin «adil» olan adı var.

Döysə ədalət qapısın kim, fəqət
Yaxşı ad ilə tapacaq aqibət.

Qəlbləri məmnun elə bu ömr ilə!
Tanrını məmnun elə bu əmr ilə!

Sayə ona gəz ki, olub Gün süvar!
Dosta rahatlıq ver, özün çək ğübar!

Dərd çək, ol aləmə dərman verən,
Şah tək ol rütbədə fərman verən.

Kini soyuq, isti məhəbbətli ol,
Ay ilə Gündən də səxavətli ol.

Yaxşı əməllər eləyənlər hamı,
Yaxşı əməldən alacaq ən'amı.

Dövrdə günbəz nə qədər vardır,
Yaxşı-yamana özü me'yardır.

Hasili bir saət ikən aləmin,
Cəhd elə taətdə keçə hər dəmin.

Taət elə, etməginən bir günah,
Ta utanıb olmayasan üzrxah.

Hiyləni at, üzrü ora çəkmə gəl,
Sözdü bu, səndən soracaqlar əməl.

Sözlə işin olsa idi sazişi,
Göylərə qalxardı Nizami işi.

## ÜÇÜNCÜ MƏQALƏ
## DÜNYANIN HADİSƏLƏRİ HAQQINDA

Ey ətəyindən yapışan xacə, gəl
Çək bu cahandan nola bir ləhzə əl.

Ğəm çəkənin rahəti ol, çəkmə ğəm,
Dəbdəbəni tərk elə, ey möhtəşəm!

Fikr et, əgər hökm bəsirətdədir,
Dəbdəbə dərvişliyə taətdədir.

Mülki-Süleymanda vəfa yox, tanı!
Mülk həman mülk, Süleyman hanı?!



Gərdək o Əzray qurandır ki var,
Bəzm o Vamiq oturandır ki var.

Bəzm bu, gərdək də bu – tənha, budur!
Vamiqi düşmüş, gedib Əzra, budur!

Bu cahanın xeyli yaşı olsa həm,
Olmadı başından onun tük də kəm.

Torpaq o düşməndir, o boynu-yoğun,
Çərx də zülm ilə vurandır boyun.

Aləmə kimdir eləyən rəğbəti,
Kimlə olub, bizlə ola ülfəti?!

Kim ki bu torpaqda yaşar, xak olar,
Xak bu torpaqda nə bilsin nə var?!

Hər vərəqi çöhreyi-azadə bil,
Hər qədəhi kaseyi-şahzadə bil.

Gənc elədik aləmi təsvir biz,
Olmuşuq ondan, deyilik pir biz.

Oğluna Simurğ idi Samın həyan,
Oğlu qocaydı, özü amma cavan.

Bu dolanan çərx ki möhkəm deyil,
Dövrdə rə'yincə ki bir dəm deyil,

Gah səni canlılara şah edir,
Kuzə düzəldənlərə gil gah edir.

Bu ikirəng fərşə qoyanlar ayaq,
Təngə gəlib işdə hərə bir sayaq.

Söyləyir o dəstə ki dəryadədir:
«Xoş oların halına səhradədir».

Odda yanır nə'li, kim ümmandadır,
Zənn edir aram biyabandadır.

Adəmi ki, hadisədən kəm deyil,
Həm quru, həm sudə müsəlləm deyil.

İndi çəkib karvanı keçmək gərək,
Tərk eləyib bu evi, köçmək gərək.

Kim ki bu həlqədə olub natəvan,
Şəhri qoyub, kəndə olubdur rəvan.

Yolçuya bir dəm ki aman verdilər,
Həm ədəmə yolda nişan verdilər.

Mülkü kənar et ki, qürur artırar,
Zülmət olan sayə nə nur artırar?!

Ömrü başa vurdun oyuncaq ilə,
Başdan aşırdın oyunu bir belə.

Sanma ki, bu günbəz oyuncaq-rəng,
Seyr edir əyləncən üçün bunca ləng.

Əql ki, əvvəl yox idi rütbəti,
Ğəflət içindəydi, xoş o ğəfləti!

Əql gözü görcək əsər, tazədən
Ötdü fərəh dövləti əndazədən.

Ğəfləti fərz eyləmə fərzanəlik,
Ğəfləti zənn et elə divanəlik.

Ğafil oturma, nə edirsən təlaş,
Yazmasan hərgah, qələm et təraş.

Pakürəyin xidmətinə bağla bel,
Bəxtəvərin tut kəmərin, çəkmə əl.



Xar ki, həmsöhbəti olmuş gülün,
Ğaliyə etmiş ətəyin sünbülün.

Həşr gələn dəmdə bərat ilə bir,
Çöllər olan gün ərəsat ilə bir,

Ta ki, olur sorğusu bu sözlərin:
«Ki, ey içən qanını dilsizlərin!

Qum hara, abi-həyat onda hara?!
Çöl hara, feyzi-Fərat onda hara?!»

«Mən ki qan uddum – edəcək qum fəğan,
Qumlamayın, etməmişəm mən ki qan!

Süfrəyə mən gərçi duz atdım bir az,
Ta cigər ilə onu qatdım bir az,

Olmağa ğeyrətlilərin həmdəmi,
Hurilərin qolbağının məhrəmi».

Hökmünə hökm olsa əgər tiynətin,
Mütrib olur xalxalına Cənnətin.

Yaxşı ilə söhbət edən ixtiyar,
Tapdı zərurət gününə yaxşı yar.

Yaxşı, qoyub getdi bu məğrur evi,
Oldu şirin bal şanı zənbur evi.

Dövrə bax, insanlığa bir et nəzər,
Adəmidən adəmi eylər həzər.

Adəmidən mə'rifəti aldılar,
Adəmini ondan uzaq saldılar.

Gör ki, Süleyman zamanından bəri,
Adəmi indi odur olmuş pəri.

Həmnəfəs oldum kimə ki bir nəfəs,
Qaçmağım axırda rəva oldu bəs.

Sayəsinin fərri Hüma kimsə yox,
Söhbətinin ətri vəfa kimsə yox.

Xoşdu ədəb toxmu – vəfa əkməyin,
Xoşdu vəfa həqqi – nazın çəkməyin.

Danə əkən naz ilə zəhmət çəkir,
Bir gün olur naz ilə ləzzət çəkir.

## SÜLEYMAN VƏ QOCA ƏKİNÇİNİN DASTANI

Ta səfərə etdi Süleyman həvəs,
Bir çırağa oldu o gün həmnəfəs.

Məmləkəti çəkdi o, səhra tərəf,
Təxtini həm təxteyi-mina tərəf.

Gördü bu səhradə bir azadə pir,
Bir ürəyi parə olan sadə pir.

Danədən o, xali edib xanəni,
Qupquru torpağə səpir danəni.

Gördü səpir danə ki hər guşəyə,
Səpdiyi hər danə dönür xuşəyə.

Açdı necə pərdəni dehqan ona,
Quş dilini açdı Süleyman ona.

Söylədi: – «Ey pir, cavanmərdlik et,
Səpmə bunu, saxla yeməkçün fəqət.

Tor ki deyilsən, dağıdırsan dəni,
Quş dili ilə çağırırsan məni.



Bel ki yoxundur, nə qazırsan gili?
Su ki yoxundur, nə səpirsən çölü?

Biz ki, o torpaqları əkdik sulu,
Nə tumu gəldi ələ, nə məhsulu.

Bu quru torpaq toxumu zay edər,
Burda susuz çəkmə əziyyət hədər».

Pir dedi: – «Bunda deyil mənlik iş,
Suyə-gilə Tanrı verir pərvəriş.

Nə quru, nə yaşla işim var mənim,
Tanrı kərəmdən yetirir xirmənim.

Su mənə – alnımda düzülmüş tərim,
Bel mənə – torpaq qazıyan əllərim.

Yoxdu mənə mülkü vilayət ğəmi,
Ta ki sağam, bəs bu toxumla zəmi.

Kim mənə bu işdə bəşarət verir,
Bir dənədən yeddi yüz, əlbət, verir».

Şeytan ilə səpmə şərik tum, məgər
Bir dənədən yeddi yüz olsun bəhər.

Yaxşı toxum səp ki, ola hasilin,
Yaxşı açılsın toxumu sünbülün.

Hər nəzəri rövşən edib seçdilər,
Camə bədən ölçüsünə biçdilər.

Qoşma Məsiha yükünə hər xəri,
Dövlətə məhrəm demə hər sərvəri.

Didmədi fil boynunu heç kərgədən,
Murə çəyirtkə ayağı oldu dən.

Yüz çay ilə aram o dəryayə bax,
Bir sel ilə çayda bu ğovğayə bax.

Dövr eləyir ta ki bu göy qübbəsi,
Hər kəsə qədrincə olur rütbəsi.

Səbr ilə hər kimsə ki dövlət tapır,
Dözməyə az bir naza ğeyrət tapır.

Hansı nəfəs nazə edir hövsələ?!
Hansı qarın sirrə olur hamilə?!

«Naz eləyən» yox, bu olur xam sözü,
«Naz çəkən» oldu Nizami özü!

## DÖRDÜNCÜ MƏQALƏ HÜSNİ-RİAYƏT HAQQINDA

Ey qalan aciz, bu nə mərdanəlik
Ki, sənə div oldu bu viranəlik?!

Mülkə öyünmə, nə vəfası onun,
Ömrə güvənmə, nə bəqası onun!

Mey içənin qətrə meyi tapdağı,
Seyr edənin süst düşən torpağı.

Müshəfi,şəmşiri atıb neylədin –
Camə, sürahiyə əvəz eylədin.

Sən ki, götürdün ələ güzgü-daraq,
Zülfə pərəstişdəsən arvad-sayaq.

Bilməz o dördüncü üçün yeddi kəs,
Rabiə öz zülfü ilə netdi bəs?!



Ey hünəri mərdliyə nöqsan tutan,
Barı dul arvad hünərindən utan!

Tərk elə mə'nadə bu şeytanlığı,
Boşla bu zahirdə peşimanlığı.

Bunca igidsən deyə, dəm vurma çox,
Ğeyrətin arvadca yox, uydurma çox.

Boynu hünərdən deyil azad əql,
Xoş o hünərdir ki, edir dad əql.

Tazə olubdur su, bulağında yox,
Göyçək olub xal, yanağında yox.

Yaxşıya yar ol ki, deyilsən fələk,
Qorx bu fələkdən ki, var onda kələk.

Gövhərin ən yaxşısını et əyan,
Xeyr verən mayə gətirməz ziyan.

Yaxşı deyil, etmə sitəm tüğyanın,
Öz suyunu tökmə, bu xəlqin qanın.

Zülmdən əvvəl də şikayət olub,
Birgə olan bir neçə himmət olub.

Himmətini xəlqin elə yad, qorx!
Sübhədək eylər gecə fəryad, qorx!

Himmət o yerdən ki nəzərlər qılır,
Tutma onu xar, əsərlər qılır.

Bir-iki aludə kəsin himməti,
Məhmuda gör verdi nə cür zilləti.

Bir neçə himmətli olan paknəfəs,
Gör ki sənə neyləyər iş görsə bəs.

Pakqədəmlər yola qoycaq qədəm,
Kəşfdə bir tısbağadan sanma kəm.

Zülm qılıncın et o yoldan kənar,
Sübh oxuna olmayasan ta düçar.

Mülkün əgər şərti ədalətdədir,
Mülk sitəm qılmağa adətdədir.

Kim bu gün insaf evi bünyad edir,
Öz sabahı mülkünü abad edir.

## SULTAN SƏNCƏR VƏ QARI DASTANI

Bir qarı görmüşdü sitəm xəncərin,
Tutdu əliylə ətəyin Səncərin.

Söylədi: – «İnsafını kəm görmüşəm,
İl boyu minlərlə sitəm görmüşəm.

Sərxoş ikən şihnə gəlib dün gecə,
Baş-gözümü əzdi mənim gör necə!

Dartdı evimdən bayıra zar-zar,
Çəkdi saçımdan sürüdü xar-xar.

Zülm evinə çəkdi məni aləmin,
Möhrünü vurdu qapıma yüz ğəmin.

Sordu: – Qapında o gecə, ey filan,
Kim filanı qətl eləyib tökdü qan?

Qanlını axtardı evimdən, məgər
Təhqir olur dəhrdə bundan betər?!

Şihnə olur məst ki, bu qan olur,
Bəs qarılarla niyə divan olur?!



Şəhri edir sərxoş olanlar talan,
Amma, günahkar qarılardır qalan.

Kim ki bu cür zülm ilə ğovğa edir,
Bəs səni bədnam, məni rüsva edir.

Bax, yaralı sinəm əzilmiş mənim,
Gör, bədənim, ruhum üzülmüş mənim.

Dadıma gər yetməsən, ey şəhriyar,
Bil ki, Qiyamət günü var, sorğu var.

Səndə ədalətdən əsər görmürəm,
Zülmdən asudə nəzər görmürəm.

Səndə hanı şahda olan yarlıq?
Sən bizə verdin necə gör xarlıq!

Ğəsb yətim malını qüdrət deyil,
Heç bu iş əbxazə də adət deyil.

Sən qarıya çal-çapı gördün rəva,
Barı edəydin ipəyindən həya.

Bəndə ikən vurma ki şahlıq dəmi,
Şah olan etməzdi xərab aləmi.

Şahda vilayətdə himayət gərək,
Hökmi-rəiyyətdə riayət gərək.

Ta ki, baş əysin hamı fərmanına,
Nəqş eləsin mehrini öz canına.

Aləmi sən zirü zəbər qılmısan,
Təxtə çıxandan nə hünər qılmısan?!

Var idi türk dövləti əvvəl büländ,
Mülk nəvazişkar, ədalətpəsənd.

Zülm ilə bu mülkü sən etdin talan,
Hindu tək etməzdi talan türk olan!

Xəlqinə viranə qalıb məskəni,
Kəndliyə bidanə qalıb xirməni.

Fikr elə, bir gün yetəcəkdir əcəl,
Bir həsar et, sanma sənə yetməz əl.

Yandır ədalət çırağı sən bu gün,
Ta ki, sabahın ola rövşən bu gün.

Sən qarıya sözlə fərəh bəxş elə,
Sən bu sözü xatirinə nəqş elə.

Bağrını acizlərin etmə para,
Almayasan ta ki oxundan yara.

Atma ox hər guşəyə bidad ilə,
Əlsiz-ayaqsızları bir yad elə.

Sən açar ol fəthinə bu aləmin,
Vurma ona qıflını zülmün, ğəmin.

Şahsan əgər, mülkdə zülmü kəm et,
Vursa yara özgəsi, sən mərhəm et.

Harda zəif var, ol onun nazı sən,
Eylə nəvazişlə onu razı sən.

Var nə ki biçarə, himayətdə ol,
Bir-iki tənhayə riayətdə ol».

Gör ki Xorasanı tutan Səncəri,
Gördü ziyan, tutmadı bu gövhəri.

Getdi bu dövrandan ədalət, güman –
Eyləmiş Ənqa qanadın aşiyan.



Ərş ilə fərş içrə kərəm görmürəm,
Onda həya, bunda su həm görmürəm.

Qalx, Nizami kimi ol ağlağan,
Bağrı qan olmuşlar üçün ağla qan.

## BEŞİNCİ MƏQALƏ
## ZƏİFLİK VƏ QOCALIQ HAQQINDA

Xoş günə ta yetdi «gecən xoş!» çağı,
Su odu ğərq etdi, külək torpağı.

Yatma belə məst, gəlir sübh əyan,
Aşdı başından divarın Gün, oyan.

İndi nə də'va, nə cahangirlik,
Getdi cavanlıq, yetişib pirlik.

Yox o ürək ki, yara vurmuşdu ğəm,
Yoxdur o duz onda ki, vardı o dəm.

Rə'y xərab, əql həm avarədir,
Əl qabar olmuşdur, ayaq parədir.

Bəlkə, sənə mərhəmət eylər zəmin
Ki, ayağın bir yerə çək, ol əmin.

Bunda ki həm pak, həm aludədir,
Cümlədən asudəlik asudədir.

Aylı bulağın qaralır günbəgün,
Lalə yanağın saralır günbəgün.

Saçlarına indi Həbəş ta Təraz,
Tazi də, türk də eləyir türktaz.

Bu qara-ağ saçlı müəllim sənə,
Verdi cavanlıq çağı tə'lim sənə.

Ki, cahana gərçi cavan gəldi çox,
Pirliyi yad eləyən yoxdu, yox.

Getdi xəzan ilə gülün yarpağı,
Ötdü qocalmaqla cavanlıq çağı.

Yox cavana eyb ilə təqsirlər,
«Pir ilə yüz eyb» – deyib pirlər.

Dövlət əgər dövləti-Cəmşiddir,
Ağ saç ümidsizliyə ümmiddir.

Kimdə cavanlıqla təravət qalıb?
Bir de, axı kimdə bu dövlət qalıb?

Ğəflət ilə yetdi cavanlıq başa,
Əfsus evində demə «əfsus!» yaşa.

İtkin o Yusif kimilər hər biri,
İtmək ilə tapdı təəssüf yeri.

Gəncliyə ki qədrdə yoxdur nəzir,
Bilməyəcək olmasa hər kəs ki pir.

Gərçi cavanlıq olur ataş təmam,
Xoşdu cavanlıq, qocalıqda nə kam!

Bağda gözəldir ağac olcaq cavan,
Pir olacaq, doğrayacaq bağiban.

Tazə budaq tər gülə şayistədir,
Köhnə budaq gər külə şayistədir.

Ğaliyədir başda qara saç sənə,
Ki, zərə sərraf qara daşdır yenə.



Getdi cavanlıq, yox əsər, bir göz aç,
Keçdi gecə, gəldi səhər, bir göz aç.

Təb'in odu onda ki kafur yeyir,
Müşkünü kafur kimi eyləyir.

Bir-iki ay olsa həva sərt əgər,
Qarə buludlar çəkər ağ qar tökər.

Ayrı deyildir yumaq ilə boyaq,
Ki, Günə İsa ilə birdir otaq.

Sudə ağartmaq işi məşhurdur,
Ayda boyaqçı sifəti nurdur.

Bu dolanan mavi kürə rəng udur,
Etdi Məsihanı boyaqçı odur.

Yox havanın arpa qədər rəngi həm,
Yoxdu daşı arpa qədər, vəzni kəm.

Rəngdə gündüz-gecə tək olma gəl,
Rumlusifət, zənciürək olma gəl.

Dağ döşünə çıxcaq iki rəng pələng,
Arxadan aldı yaralar rəng-rəng.

Var necə bu zənci, bu rumi dağın,
Var bu «cəhuli», bu «zəlumi» dağın.

Sən ki ağac qızları tək, et qiyas,
Əyninə geydin gəh ipək, gəh pəlas.

Etdi xilaf təb' peşiman səni,
İsti – geyimli, soyuq – üryan səni.

Şirü pələng tək ye elə, gey elə
Ki, gətirirsən onu hər fəsl ələ.

Var bir udum su, çörəyin ta sənin,
Etmə əlin çömçəsi hər kasənin.

Atəşi səndən çörək almaz əgər,
Otla-suyu səndən alan var məgər?!

Bir çörək üçün nə olursan gəda,
Otla Məsih eşşəyi tək, et həya.

Odlu bu torpaq küp içində külək,
Ta suyunu almasa, verməz çörək.

İndi ki bu daxmada zindanilər,
Atəşi ki sönmüş o ruhanilər.

Olsa da can Yusifi hər qurdnəfəs,
Olsa da mətbəx pişiyi şir kəs.

Verməz ürək əhli ürək buğdaya,
Verməz ürək danəsini arpaya.

Su kimi öz sinəni sən et çörək,
Od kimi öz bağrını sən şişə çək.

Nəfs itinə olmaginən həmnəfəs,
Ruzi üçün nakəsə əl açma bəs.

Torpağı ye, ruzi bəxildən yemə,
Torpaq olub yarə zəlildən yemə.

Qalx, əlinə, bağrına həm xar vur,
Aram oturma, özünə iş buyur.

Xoşdu ki, bir işlə ola zəhmətin,
Olmaya bir kimsəyə ta minnətin.



## KƏRPİCKƏSƏN QOCANIN DASTANI

Şamdə bir pir, verirlər soraq,
Xəlqdən olmuşdu pəri tək iraq.

Hördüyü otlardan o köynək geyər,
Kəsdiyi kərpicdən o ruzi yeyər.

Əhli-qılınc qalxan atandan sora,
Qalxan o kərpiclə tutardı gora.

Kim ki o kərpic niqabı var idi,
Qəbrdə sanma əzabı var idi.

Bir gün o piranə görən yerdə iş,
Artıran artırdı ona bir də iş.

Gəldi qəzadən yanına bir cavan,
«Sən nə edirsən? – dedi, ey natəvan!

Döymə bu torpaq-saman içrə ayaq,
Ki, bu sayaq işləri işlər ulaq.

Qalxanına vurma qılınc torpağın,
Bir tikə verməzmi elin-oymağın?!

Dur, qəlibin odla bu kərpiclərin,
Vur yeni digər qəlibə digərin.

Bunca kəsəklərlə əziyyət nədir,
Su ilə, torpaqla bu zillət nədir?

Sən qocasan, tut qocalar tək işi,
Görsə, cavanlar görər eşşək işi».

«Gəl məni incitmə! – qoca söylədi,
Get yolunu, etmə cavanlıq – dedi.

Kərpici kəsmək işi – pirin işi,
Yük daşımaq olmuş əsirin işi.

Mən əl uzatdım bu ağır sən'ətə,
Ta ki, sənə açmayım əl minnətə.

Ne'mət üçün heç kəsə yox minnətim,
Zəhmət əlimlə yetişir ne'mətim.

Boynuma qoyma bunun üçün vəbal,
Düz demirəmsə, məni etmə həlal».

Etdi bu tə'nə cavanı şərmsar,
Getdi yanından qocanın zar-zar.

Döymə, Nizami, qapısın aləmin,
Döysən əgər, din qapısin döy həmin.

## ALTINCI MƏQALƏ
## MÖVCUDATA E'TİBAR HAQQINDA

Lö'bətbaz pərdə dalında gəzər
Ki, bu qədər pərdədə lö'bət düzər.

Qəlb gözüylə nəzər etsən bir an,
Pərdədən əsrarı görərsən əyan.

Gör ki, bu göy pərdəsinin çənbəri,
Pərdədə saxlar neçə ğarətgəri.

Göz gühərin bir kəmərə tikdilər,
Bir ürəyə xidmət üçün çəkdilər.

Var nə ki bu nöqtə, bu pərgardə,
Dairə xəttindədü rəftardə.

Bu iki-üç tə'lim olunmuş kəhər,
Bizlər üçündür ki, vurulmuş yəhər.



Dövrdə yoxkən hələ bu tazələr,
Tazə-səfərlər, qədim-avazələr.

Payəsi eşqin bizə oldu məqam,
Külçəsi eşqin bizə oldu təam.

Hər iki aləmdə hünər, eyb var,
Hər ikisi tərkinə olmuş süvar.

Aləmə həmxanəmi var sən kimi?
Yer quşuna danəmi var sən kimi?

At bu vücudu didən əclaf quşu,
Ol başı üstə bu quşun Qaf quşu.

O sənə ruh quş ki, qəfəsdir pəri,
Şəhpəri–altındadır, üstdür yeri.

Ya qəfəsindən çək onun çəngəlin,
Ya ver ona, çək qəfəsindən əlin.

Ta yük ilə çəksə vilayət səni,
Eyləyə şəhpərlə himayət səni.

Bir-iki dəhlizdən edən dəm güzar
Ki, səni öz lövhün özündən pozar,

Ağ-qara xətmi səni xürrəm qılar,
Tanrının əsrarına məhrəm qılar.

Həm özünə həmdəm edər ənbiya,
Həm hərəmə məhrəm edər kibriya

Yol iki mənzildir iki aləmə,
Bu yolu teyy eylər ürək bir dəmə.

Gildə əsasın olunurkən rəqəm,
Oldu canın kə'bəsinə qəlb hərəm.

Mətləbi et rövşən ürəkdən tələb,
Tozlu bədən fərşi deyil müstəhəb.

Sürmə səbadır gözünə nərgisin,
Rəngləyir iksir libasın misin.

Bu bir ovuc gil bədəni tərk elə,
Söz ürəyindir, ürəyin, dərk elə!

Ki, ürəyin bəndəsi sultan olur,
Əqlə ağa, həm cana fərman olur.

Nafə kimi istəsən aram ürək,
Möhnətə qatlanmalısan nafə tək.

Ki, sənə layiq cod olan camədir,
Hökm nə tirmə, nə də badamədir.

Cod dəri ahuyə bəha bəxş edir,
Dostluğu nazik dərisi nəqş edir.

Cod dəridə müşk olur aram, əgər
Olsa ipəkdə, olacaqdır hədər.

Təng nəfəs tut, var əgər şəkkərin,
Daş sədəf istə, var əgər gövhərin.

Gah səhər nə'li olan mah ol,
Sübh kimi ahə nişan gah ol.

Kim çəkə zülmət gecə zəhmət yükü,
Bir gün olur qisməti rəhmət yükü.

Əhli-vəfa kim ki yetib rif'ətə,
Qatlanıb əvvəlcə ağır zəhmətə.



Razı bəla töhfəsinə ənbiya,
Amma, sənə töhfə gələnlər bəla.

Dərdü bəla çarədü xudbinliyə,
Təlx şərab mayədü şirinliyə.

Sərv tək öz bəndini qır, azad ol,
Şəm' kimi öz-özünü ye,şad ol.

Əjdəha var harda ki bir xəznə var,
Rahətə zəhmətdir olan xəznədar.

Rahət olur kim ki çəkir zəhməti,
Zəhmətin ardınca gəlir rahəti.

Səndən əgər açmadı bir bənd çərx,
Özgə dügün etmədi peyvənd çərx.

Ta yolun azadlığa tənha gedir,
Şadlığa ğəm şihnəsi pişva gedir.

## OVÇU, İT VƏ TÜLKÜ DASTANI

Vardı bir ovçu, dolanan düzləri,
Həm özü ovçuydu, həmi gözləri.

Ahu tutan aslan iti var idi,
Ahuya Gün kölgəsi bağlar idi.

Qorxu salar kərgədənə peysəri,
Gurə həm ahunu yıxan dişləri.

Hər səfərində o idi həmdəmi,
Hər gecə, hər gün o idi məhrəmi.

Ovçuya olmuşdu yaman mehriban,
Gündüz ovundaydı, gecə pasiban.

İtdi o aslan kişinin şir iti,
Sandı pişik çəkdi apardı əti.

Söylədi: – «Bu yolda edibdir qəza
Şir başından it ayatın bəha».

Ğəmdən udurdu cigəri qanını,
Gər dişinə tutmuş idi canını.

Səbr ki qatlandı o, naçar idi,
Misqalının faydası dinar idi.

Gəldi bu dəm tə'n ilə bir tülkü həm,
Söylədi: – «Səbr etginən, ey səbri kəm!

O hünəri tək it əgər qalmadı,
Sən qal, əgər ondan əsər qalmadı.

Getdi ki, etsin ovu hasil itin,
Oldu yəqin yoxluğa vasil itin.

Ov ki bugün etdi səninçün o it,
Bəlkə, bəsindir iki ay, ey igid.

Bağrını dur indi özün çək şişə,
Məğzini ye, üstünü ver dərvişə.

Yağlı xörəklər ki yedin, yad elə,
Nəfsini kök ahudən azad elə.

Tərk elə bu yağ dolu ə'zamızı,
Qoyma mizacında bu səframızı.

Yoxdu tələndən daha pərva mənə,
Neyləyəcək səndəki sövda mənə!

Ondan uzaqsan, nə vəfadarsan?
Ğəm yeməyirsən, necə ğəmxarsan?!»



Ovçu dedi: – «Hamilədir hər gecə,
Olsa da ğəmdən bu günüm gər gecə,

Mən yenə şadəm ki, bu təng ruzigar,
Nə ğəmə, nə şadlığa verməz qərar.

Bəndəlik olsun gər, əmirlik əgər,
Bu qəlib içrə dolanır sərbəsər.

Dövr eləyir çərx ilə səyyarə həm,
Ötməlidir, şadlıq ola ya ki ğəm.

Xürrəməm olmuş ürəyim ğəm mənim,
Ğəmdir edən könlümü xürrəm mənim.

Düşsə də Yusif gününə qurd itim,
Qurd deyiləm, köynəyi neyçün didim?!

Məndən alan kəs onu gec-tez yenə,
Sən tək ov ilə verəcəkdir mənə».

Qalxdı bu dəm toz göyə tufan kimi,
İt toz içindən çıxıb aslan kimi,

Kürkünə ki saldı birə tülkünün,
Tez qasığın saldı girə tülkünün.

Söylədi: – «Gec gəldim əgər az, nə ğəm,
Şir kimi gəldim ki, bilir tülkü həm.

Tövq mənim boynuma dinin sənin,
Tülkü ilə qissə yəqinin sənin».

Kim ki yəqinində iradət çəkər,
İşləri axırda səadət çəkər.

Gəz bu yəqin yol, bu yəqin hasili!
Gör bu mübarək, bu əcəb mənzili!

Olsa yəqin rəftar, ayaq baş olur,
Daş da yəqin zənn ilə qaş-daş olur.

Kim yəqin içrə ola sabitqədəm,
Toz qoparar dəryadan, oddan da nəm.

Kim yəqini etsə təvəkküllə var,
Himmətə «ər-rizqu əl-əllah» yazar.

Süfrəsinə heç kəsin olma çibin,
Ardına düşmə nə ki görsən şirin.

Sanma qapından olacaq ruzi kəm,
Bəndəlik et, ruzi üçün çəkmə ğəm.

Üz tut o dərgahə, odur ixtiyar,
Ruzi verəndir, həm odur yaxşı yar.

Hər birimiz getsək o dərgahə biz,
Dönmərik ondan geriyə çarəsiz.

Əhli-yəqin tayifədir bir digər,
Biz ayağıq, onlar olur baş əgər.

Salsa əgər ki suya səccadəni,
Eyləyəcək bal kimi saf badəni.

Ömr ki bir gün sənə verməz aman,
Sən on ilin ruzisinə atma can.

Nəqşimizi ta əməli qıldılar,
Bəxşimizi həm əzəli qıldılar.

Ruzi o yerdən ki rəvandır sənə,
Qismət olur harda məkandır sənə.

Çoxlar edir ruzini çox niyyəti,
Ruzi olur hər kəsə öz qisməti.



«Nəhnu qəsəmna» oxu, et kəsbi-hal,
Ta uzaq etsin nə ki var qiylüqal.

Cəhd elə dinə, tut işi əhd ilə,
Ruzimi, dövlətmi yetər cəhd ilə?!

Ta olasan ən əzizi aləmin,
Cəhd gərək, tovfiq olur həmdəmin.

Cəhd soyuq idi Nizamidə həm,
Yetdi ona tovfiq odundan kərəm.

## YEDDİNCİ MƏQALƏ İNSANIN BAŞQA CANLILARDAN FƏZİLƏTİ HAQQINDA

Ey zəmidə çərx kimi nazənin,
Nazını həm çərx çəkir, həm zəmin.

İşlərin, ordan ki bilirsən nişan,
Bir yerə yetdi, ora yetməz güman.

O əzəli dayə ki, lütf etdi çox,
Bəslədi şəkkərlə səni, südlə yox.

Yaxşılığın cəhd elə artsın hələ,
Yaxşılıq eylər sənə kim bir belə?!

Nəqş ilə əvvəldə o qadir qələm,
Surətini gör nə xoş etmiş rəqəm!

Ta cigərin can telinə bağlıdır,
Gövhəri cismin belinə bağlıdır.

Yaxşı ki bu çöldə nə köksən, nə çağ,
Tutmaz arıq ahu ilə kök ayaq.

Canlı nə ki var, sənə olmuş ğulam,
Quşdu, torundan ələf otlar təmam.

İşdə şərif ol ki, hümasən əgər,
Kəm danışıb kem ye, kəm azar ver.

Ağ-qara bu karxanada hər nə var,
Bir işə məşğuldu nihan-aşikar.

Bayquş əgər nəhs olur əfsanədə,
Bülbül olur xəznəyə viyranədə.

Hər nə ki bu pərdədə var aşikar,
Cisminə layiq canının qədri var.

Nola ki bəhrincə deyil gövhəri,
Onları həm bil cahanın cövhəri.

Az-çoxu çəksən hesaba, ol mətin,
Qanbahasınca çək onun xiffətin.

Mülkdə əmrində durur yaxşı, pis,
Güzgü tutanın həm odur yaxşı-pis.

Versən əgər başmaq, alırsan papaq,
Bədnam olur pərdə cıran Ay-sayaq.

Pərdə atan olma, deyilsən səhər,
Pərdə tutan ol gecə tək sərbəsər.

Suri gülü gər arıya pərdədir,
Bu arı pərdəsi sənə xeymədir.

Uçma yem üçün belə milçək kimi,
Olma tor ağzında hörümçək kimi.

Pərdə tutanlar ki, cahan tutdular,
Pərdədə əsrarı nihan tutdular.



Pərdə yolundan çıxıb aşkar sən,
Pərdədən oldun yana naçar sən.

Pərdəsi yox qəlb ilə etmə vida',
Hər nə deyil pərdədə, etmə səma'.

Boş yerə bu pərdədəki hoqqəbaz,
Başına heç pərdə sənin bağlamaz.

Tutma nə bir pərdəni bundan səva,
Vurma nə bu pərdədə xaric nəva.

Pərdəni dinlə, nə ki ğəflətdə ol,
Sirlər olan pərdədə xəlvətdə ol.

Tut ki, sənin cismin olur pak can,
Qırx gün əgər həbsdə tutsan nihan.

Həbs şərafət gətirər mərd kəsə,
Yusif əbəs düşmədi bəs məhbəsə.

Canla ürək qədri ki, gəlməz dilə,
Gəlsə, riyazətlə gəlir hasilə.

Tapşır ona simini dörd gövhərin,
Xalis olur onda təbiət zərin.

Ta bu məqam ilə bu məhbəs səni,
Nakəs ikən eyləyə bir «kəs» səni.

Təb'in əgər ram eləsən Rəxşini,
Sikkən edər zərb vəfa nəqşini.

Əql ilə təb'in ki sənə yar olur,
Qisseyi-ahəngərü əttar olur.

Bu – nəfəsindən saçar od, üz səpər,
O – nəfəsindən sənə ənbər səpər.

Yoxdu nə təb'in ocağında həyat,
Yoxdu nə yoxluq qəfəsində nicat.

Hər nə xilafınca olur adətin,
Mehtər olur karvanına dövlətin.

Tərk eləyən nəfsini sərvər olur,
Olsa bu qüvvətdə peyəmbər olur.

Nəfs əgər əmrində olur bir nəfəs,
Başmağı gey, bağı-Behiştə tələs.

Zəngini nəfsin gətirib əfğana,
Bəndəlik et dinə, nə ki şeytana.

Din hərəminin, yeri, ol məhrəmi,
Çəkməyəsən ta ki çəkaçək ğəmi.

Şihnə tək atəşdən Əbutalibi,
Ətri ilə hifz edəcəkdir nəbi.

Paknəzərlər ki, inayət qılır,
Pakları lütf ilə himayət qılır.

### FİRİDUN VƏ AHU DASTANI

Bir neçə xas ilə çıxıb bir səhər,
Bir çəmənə etdi Firidun güzər.

Yetdi bir ovlağə, tutunca qərar,
Gördü bir ahu ki, Firidunşikar!

Boynu, qulağı, nəzəri xeyrxah,
Gözləri, sağrısı himayət, pənah.

Şahı elə tutmuş idi mənzərə,
Baxmağa yoxdu nəzəri bir yerə.



Gör ki, necə şahə kəmənd oldu ov,
Varlığı ilə ova bənd oldu ov.

Bağrı kimi Rəxşini coşdurdu, həm
Qarnı kimi yay belin etdi bu dəm.

Ox ona bu rütbət ilə yetmədi,
Rəxş ona bu sür'ət ilə yetmədi.

Kin lələyin bəs hanı, ey ox? – dedi,
Cövlanın, ey Rəxş, məgər yox? – dedi.

Noldu o pərvaz, o rəftarınız?
Varmı bu acizlik ilə arınız?

Ox dilə gəldi, dedi: – «Ey mərziban,
Bəs nəzərindəydi bu dilsiz nişan.

Ta nəzərin sayəsidir cövlanı,
Bu zirehə kim vuracaq peykanı?!

Qılsa nəzər, şad eləməz sərvəri,
Mütbib əlində belə nazik dəri».

Sən ucalanlar dağını et sorağ,
Ta uca etsin səni bir gün bu dağ.

Adəmilik xisləti xidmətdədir,
Adəminin şövkəti xidmətdədir.

Varsa hünər sahibinin ğeyrəti,
Əhdə rəvadır eləsin xidməti.

Sidq əlin at, tut kəmərin peymanın,
Peymanı qırsan, bu olur nöqsanın.

Xəznənin üstündə yatan əjdəha,
Gərçi kəmərdir, onu sanma gəda.

Xidmət ucundan kəmər olmuş fələk,
Başda qoyulmuşdur odur tac tək.

Kim ki fəzilət yüyəni əldədir,
Bir işə xidmət kəməri beldədir.

Şəm' ki, o xacəlik eylər nura,
Bağladı xidmət kəməri zənbura.

Bağlı deyilsən ki, Nizami, yetər,
Xidmət üçün bağlaginən bir kəmər.

## SƏKKİZİNCİ MƏQALƏ XİLQƏTİN GÖZƏLLİYİ HAQQINDA

Yoxdu ən əvvəlki vücudlar hələ,
Bəhri-kərəmdən su içən bir gilə.

Ovcu deyildi dolu bu göy tağın,
Tozlu deyildi yolu bu torpağın.

Və'deyi-tarix deyildi təmam,
Tutmuş idi pərdədə lö'bət məqam.

Sübh ilə şam yerlə nə peyvənd idi,
Cism ilə can varlığa nə bənd idi.

Cəngdən asudə nə ə'za hələ,
Ədldən «et!»-»etmə!» nə peyda hələ.

Etdi kərəm feyzi mədəd lütf ilə,
Atdı kəramət dənizi bir gilə.

Dərhal o bir qətrə ki oldu əyan,
Oldu bu su rəngli fələklər rəvan.



Qalxdı bu dəm toz bu sudan, afərin!
Ta o ərəz oldu sənin cövhərin!

Onda ki bu tordan olursan kənar,
Sanki, bu yoldan kəm olur bir ğübar.

O gecə sənsiz nə xoş idi cahan!
Nəqşdə surət yox idi, səndə can!

Həm səni gəzməzdi fələk gözləri,
Həm yer eşitməzdi həmin sözləri.

Sən bu yola qoymadan əvvəl qədəm,
Varlığa çox şükr eləyirdi ədəm.

Yoxdu bu bağ içrə nə zəhmət, nə xar,
Yoxdu bu torpaqda nə sərsəm ğübar.

Həmldən azad idi sübh ilə şam,
Bitki – xədim, duldu təbiət təmam.

Bağladı əvvəldə ki Cövza kəmər,
Yoxdu qan almaq vərəmindən xəbər.

Yerdə üzü qarə olan Ay o dəm,
Teştin ilə olmadı rüsvay o dəm.

Tökmədi Zöhrə hələ abrın gilə,
Salmadı Harut qanadın Babilə.

Pak idi səndən bu fələk, həm zəmin,
Sən kənar idin, aradaydı ğəmin.

Oldu bu möhrünlə cahan tazə həm,
Doldu bu göy günbəzə avazə həm.

Bəd nəzərin kövkəbə həmvarədir,
Ondan Ayın kövkəbəsi parədir.

Ay ilə il dövrdən azad idi,
Sən kimi onlar sənə ta yad idi.

Aləm üzü ayna kimi pakdı bəs,
Eybli etdi onu beş-üç nəfəs.

Məş'əli-sübhü sən apardın şama,
Sadiqü kazib dedin o zər cama.

Göylərin ağzına yerin torpağı!
Bağlar önündə hələ də qurşağı?!

Gər sənə «can meyvəsi» göylər dedi,
Yaxşı eşit ki, dil ilə söylədi.

Yox başının qədri o tacın qədər,
Cul qədər it, torba qədər yoxdu xər.

Laf çox olmuş ki, bu də'va yeri,
Arpaca torpaqdı sənə sərsəri.

Sən bir ovuc torpağa can istədin,
Arpaca kərpicə cahan istədin.

Səndən əzab altdadır üstü Yerin,
Xəznə tək olsaydı yer altda yerin!

Səndə ki, beynin yağı simabidir.
Donmuş o fındıqla ki, sincabidir.

Xanəni ta etməyə fındıqca təng,
Boşla, bu fındıqdır o sincabrəng.

Qaqumü qunduz gecə-gündüz deyil,
Bu dələ bəbr, əjdəhadır bəlkə, bil.

Etmə pişik tək əluzunluq elə,
Oynama vəhşi dələ ilə belə.



Şir ki, bu yolda töküb ağzı suyun,
Sən suya ceyran tək uzatma boyun.

Gər fələk işvə ilə su göstərər,
Uyma ki, su göstərər, ilğım verər.

Nə yügürürsən su tərəf bir belə?
Duzdur axı gördüyün, udqun hələ!

Olmaya bu təşnəliyin ta sənin,
Odla təbaşir kimi öz xirmənin.

Yusifin idi quyudan ta bəri,
Misri-ilahiydi təmaşa yeri.

Gəldin o göydən saralandan sora,
Bu quyuda sən daralandan sora,

O sarı çöhrəndə bu səfra ki var,
Qaşlarının sirkəsi eylərmi kar?!

Ki, yağıdır yüz ilin o piy, məgər
Bu on ilin sirkəsi eylər əsər?!

Tökdü atan qanını bu həftxan,
Yeddi kökə tökməsin abrın həman.

Xirmənini bu oda çatmaq nədir?
Dövlətinə bu təpik atmaq nədir?

Çap atı, gövlan elə, meydan sənin!
Bir işə hökm eylə ki, fərman sənin!

Tutdun iki-üç gün əgər cam xoş,
Nuş elə, yat yaxşı, tut aram xoş.

Həm sənə asudə sitəm qıldılar,
Kəndirini boş ki o dəm qıldılar.

Bel bükülüb, gərçi olub ləng ayağ,
Öz yağın ilə hələ dağsan ki, dağ.

Çör-çöpüsən burda ki bu mətbəxin,
Orda olursan ələfi duzəxin.

Tut ki, bu qarnın su-çörəklə dolur,
Olmaz ağır kim belə yüngül olur.

Ömrü çox etsəydi su ilə çörək,
Çox yeyən artıq yaşayaydı gərək.

Kəmdir əgər, qədri deyil kəm bu ömr,
Kəmlik ilə qədr tapıb həm bu ömr.

Az ye, gör aram nə, rahət nədir,
Çox ye, gör azar nə, zəhmət nədir.

Əqlin ilə yox yeməyin alveri,
Var tamahında bu yemək şakəri.

Əql onunçün sənə olmuş əta,
Ki, tamahı qoymaya etsin xəta.

Fitnə üçündür tamahın biqərar,
Olsa bu əql aldadan əbləh kənar!

Qorxum odur əvvələ düşsün yenə,
Axırı öz rəngini versin sənə.

Yaxşı-pisi var nə ki bu məclisin,
Yaxşı verir rəngini yaxşı-pisin.



## MEYVƏSATAN, TÜLKÜ VƏ OĞRU DASTANI

Meyvəsatan vardı, Yəmən baqqalı,
Tülkü onunçün qoruyardı malı.

Yolları gözlərdi ədəb gözləri,
Girməyə ta ki dükana digəri.

Etdi bir oğru nə qədər hiylə gər,
Tutmadı bir hiyləsi baş, müxtəsər,

Düşdü, yumub gözlərini bircə dəm,
Uyqu damarından onun tutdu həm.

Yatdığını zənn elədi oğrunun,
Yatdı qucağında o həm uyqunun.

Qurd bu uyqunu ğənimət dedi,
Yığdı nə ki vardı, «ğənimət» dedi.

Kim ki, bu yolda yuxudur yoldaşı,
Ya gedər əldən papağı, ya başı.

Qalx, Nizami, nə yataq taxtıdır?!
«Hamını tərk eylə!» demək vaxtıdır.

## DOQQUZUNCU MƏQALƏ
## ALİCƏNABLIQ VƏ ALİ HİMMƏT HAQQINDA

Vəsl şamından əziz, ey mayəsi!
Sübh aləmindən çevik, ey sayəsi!

Sayə kimi çox oturub çəkmə ğəm,
Qalx, ayaq üstə daha xoşdur ələm!

Şahlar haçan bir yerə get-gəl edir,
Sursatı, azuqəsi əvvəl gedir.

Bir səfərə əzm elə şahsan əgər,
Əzm ilə səhman elə, versin səmər.

Yolla yükü, sursatı yeksər bu gün,
Axirət azuqəni göndər bu gün,

Zənbur evi dolmaz idi şəhd ilə,
Görməsə idi uzağı cəhd ilə.

Mərd qarışqa necə səf çəkdi gör,
Öz sabahı üçün ələf çəkdi, gör.

Kim ki açıqdır gözü, nadan deyil,
Yə'ni qarışqaycan, arıycan deyil?!

Kim dilər asan keçirə ruzgarı,
Yayda yığar qış günü üçün barı.

Taət edənlər buna digər, hərə,
Sərraf olur bir dəm olan gövhərə.

Yoxdur edən aqibətə sə'y heç,
Kimsədə bir saətə yox rə'y heç.

Biz ki, fələkdən ucadır payəmiz,
Tapdıq uzaq görmək ilə payə biz.

Varlığı hər cinsini görsəm də çox,
Aqibəti fikr eləyən bizcə yox.

Ömrdə kam olsa da candan gözəl,
Aqibəti görməyin ondan gözəl.

Hali ürək halinə yeksər bizik,
Mə'dənimiz gil, yenə gövhər bizik.

Hər nə gələn var, ona sahibxəbər,
Hər nə keçən var, ona sahibnəzər.



Gördü bu gil lövhədə can aşikar,
Hər nə ki doqquzvərəq əbcəddə var.

Kim bu dağa oldu düçar? – Sənlə mən!
Kim bu bağa oldu nübar? – Sənlə mən!

Torpağını ta ələyə saldılar,
Ondan «ürək mə'cunu»nu aldılar.

Torpağın indi qarışıb rənc ilə,
Amma ki, dolmuş ürəyi gənc ilə.

Şükr elə bu torpağa, var qiyməti,
Çoxdu bu boynunda onun minnəti.

Mənzilini gör, yolunu seç, yeri,
Gəl bu yerə, sonra yenə dön geri?!

Bu səfər etməkdə bu niyyət nədir?
Ya geri dönməkdə bu hikmət nədir?

Mülk deyildi adına, sən hələ
Gəlmədən əvvəl bu xərab mənzilə,

Vardı Hüma fərri Həməldən sənə,
Vardı həva övcü əzəldən sənə.

Gəldin əgər eşq ilə pərvazə çox,
Bu əbədi yolda bir əndazə yox.

Süst, bu torpağə yol aldın yenə,
Sayə suya-torpağa saldın yenə.

Təngə gətircək səni bir gün bu tağ,
Gün ətəyi üstə alırsan ayağ.

Cümlədən ayrılsan əgər bir zaman,
Onda da çox dözməyəcəksən, güman.

Çünki, tərəddüdü mədarın sənin,
Yox bir ip üstündə qərarın sənin.

Bəxşiş edən müflis əta həngamı!
Köhnə olan tazə vücud əyyamı!

Oğluna qatil anadan ol uzaq,
Hər nə atan söylər, ona tut qulaq!

Öz atana et nəzər, ey sadə kəs,
Gör ki nə etmiş, onu et sən də bəs!

Rahət üçün durma belə intizar,
O, ələ gəlməz bu cür ömrün ki var.

Təb'ə nəvaziş ola kaş bir nəfəs,
Qaytara o ömrü ki, keçmiş əbəs.

Fikr elə bir gör ki bu torpaq nədir,
Bu ürək ilə şad oturmaq nədir?!

O kəsə ki, bu fələk «əhsən!» dedi,
Nə mənəm o kəs, nə də sənsən – dedi.

Biz ki bura zəhmət üçün gəlmişik,
Zənn eləmə ğeybət üçün gəlmişik.

Alver edəndən bu cahan ilə biz,
Görməmişik düz onu can ilə biz.

Gəlməyin üçünmü bu rəngin meyi?
Gəlməyin ardınca olur getməyi!

Çoxmu bu cür dövr edəcək ruzigar,
Gəlməyi, həm getməyi biixtiyar?!

Şəkk yox onda ki, adəm var, yox,
Varlığadır şəkk, o həm var, yox?!



Sən belə gec düşdün axı, uçma tez,
Sən ələ gec gəldin axı, keçmə tez.

Ta döyülür təbl köçəköç dəmi,
Tazə olur sikkəmizin dirhəmi.

Tazə olur həm bu atılmış ğübar,
Həm yığılır hər nə pərakəndə var.

Ey bugün arsız keçirən ruzgarı,
Barı sabahından edəydin arı!

Bunca ki ğəm var içimizdə bizim,
Bəh-bəh, ürəkdə nə qədər var dözüm!

Köhləni dindir bu çölün təkcə, din,
Bu işə həm çarə həmindir, həmin!

Sərt yolu gör, süst eləmə cövlanın,
Süstgüman olma ki, sərtdir canın.

Qalx, yenə cəhd aynasını al ələ,
Bax ona, çirkdən üzünü hifz elə.

Üzrə dil aç, Tanrı keçər təqsirin,
Xəncərinə qoyma boyun təqdirin.

## ZAHİD DASTANI

Dərd əsir eylədi bir zahidi,
Verdi xərabat evinə məscidi.

İçdiyi mey rəngdə idi göz yaşı,
Çarə gəzirdi bir əli, bir başı:

«Mürği-həva tutdu ürək xanəsin,
Çaldı mənim təsbihimin danəsin.

Kə'bə – yolum bağlayan ovqat olub,
Əsli evim çünki xərabat olub.

Tale' olub bəd, olub ulduz da bəd,
İndi qələndərliyəyəm namizəd.

Örtdü ədəb gözləri məndən niqab,
Oldu xərabat evi məndən xərab.

Bunca cahandan ki var arım mənim,
Getsə ətəkdən bu ğübarım mənim!

Təqdiri gör ki, mən hara, Lat hara?
Zahid hara, yoxsa xərabat hara?»

Himmət o yerdən ki nəzər eylədi,
Pərdədə var idi cavan, söylədi:

«Bu işi zənn etmə ki təqdir edir,
Sən kimisi yüz min ona heç nədir.

Üzr evinə get, günahın pak elə,
Sonra da bu şivə ilə gəl dilə.

Getsən özün, üzrə edirlər qəbul,
Yoxsa, əsir tək aparırlar məlul.

Yerdə bu cür otlamağı tərk elə,
Neyşəkərindir bu fələk, dərk elə.

Uymadan ondan, yeri bir guşə tut,
Get ədəm üçün özünə tuşə tut.

Yaxşı deyil qan çəkə gözlər suda,
Ölmüş ilə sağ ola bir uyquda.

Uyqu ilə gördü səni din xərab,
Öz üzünə çəkdi o üzdən niqab».



Qalx, Nizami, məlik olmuş süvar,
Burda xətər var, nə tutursan qərar?!

## ONUNCU MƏQALƏ
## AXİRƏZZAMAN ƏLAMƏTİ HAQQINDA

Ey fələk, ahəstə bu dövrün nədir?!
Ey zəmi, asudə bu cövrün nədir?!

Hər gecə ardınca olur bir səhər,
Hər ucalan axır enir bir təhər.

Saldı yerin qatlarına qorxu kim?
«Zəlzələt-əs saəti şəy'un əzim».

Gör bu yerin şurunu, gör tədbirin,
Boş yerə sürtməz fələkin zəncirin.

Diddi külək əndamını sərsəmin,
Zənciri sərsəm qıracaqdır həmin.

Kimlə, haçan mərc eləyib Yer, məgər
Çərx belindən açacaqdır kəmər?!

Sübh ilə şam ətr ilə rəngdən qalır,
Ki zəmi top, çərx də çovgan salır.

Yer uca çərxin qapısın döysə həm,
Çərx, ğübarın sovurur dəmbədəm.

Çərx qəzası demə ki çox güdər,
Torpağın əndamını yer-yer didər.

Ta ki fələk piri cırır xirqəni,
Ta ki bu gil möhrə qırır riştəni,

Çərx enib xak ilə yeksan olur,
Xak dönüb çərx ilə viyran olur.

Dərdimiz olmur olara dərdisər,
Yolda da qalmır tozumuzdan əsər.

Həm bu işindən fələk aram olur,
Həm zamidə məkrinə əncam olur.

Çərx də, ulduz da xəcalətdədir
Ki, bir ovuc torpağa taətdədir.

Həlqə vurub çərx ilan tək, deyir
Ki, ilan ömrün sonu torpaq yeyir.

Ey cahanın sizdən olan bağrı qan,
Siz kimi varmı bu cahan içrə can?!

Torpağı bu ğəm küpünə kim töküb,
Ki, bu küpün rənginə matəm çöküb?!

Çəkməsələr pusqu üçün qurşağı,
Atmasalar küpdən əgər torpağı,

Ğəmli bu küpdən ki, olub tüstü tək,
Yeddi su-torpaqla yuyanlar ətək,

Həm çəkər ulduzlu fələk xəl'ətin,
Həm bu cahan üstə pozuqluq xətin.

Tünd yerişli bu fələkdən hələ,
Üz verəcək torpağa çox vəlvələ.

Bunca bu işlərdə olan təmtəraq,
Həm verir əflak köçündən soraq.

Olsa şikəst baş, uçunar əvvəli,
Yerdə bugün var bu uçunmaq, bəli.



Müşksədəf ki, sənə bədxahdır,
Gözləri gövhər, içi timsahdır.

Bu sədəfi sanma dəniz gövhəri,
Var bu sədəf içrə nəzər cövhəri.

Beyni donar, kim ona eylər nəzər,
Əf'i gözü zümrüdə hardan dözər?

Sanma ki çeşmində onun nur olur,
Min gözü olsun, yenə də kur olur.

Gəlmədi yoxluq yolu heç xoş sənə,
Özgə gözüylə ona baxdın yenə.

Öz ayağın nola əziyyət edir,
Özgə ayağıyla, de, kim yol gedir?

Gərçi zəri, ya zoru məşhurdur,
Bəhrəsi Bəhram-Gurun gurdur.

Bu qapıya bənd vuran bəs hanı?
Bu bacadan baş çıxaran kəs hanı?

Ol bu evin məhbusu divanə tək,
Yox qapısı, yox bacası xanə tək.

Çərx hədisin nə qədər yad edək,
Yel dolu başına edək kül gedək!

Çərx ilə bu Kəhkəşanından nə ğəm,
Süd yolunu arpa qədər sanma həm!

Qalx dolabrəng bu pərgardən,
Qurtarasan təng bu pərgardən.

Riştəsi çox nazik olan vəhm həm,
Çəkdi xəcalətlə bu yoldan qədəm.

Aciz olur vəhm xəcalətlə, bax!
Tük tək olan bu yola diqqətlə bax!

Sən bu tük üstündə əl at bir tükə,
Ta səni tük tək bu xəmirdən çəkə.

Ki, gətirirsən ələ xoş bir məqam,
Yaxşı deyil burda otursun adam.

Xali olub çünki vəfadən bu gil,
Meyl edib üz tutmağa layiq deyil.

Hər ələm altında pərakəndəlik,
Hər kəmər üstündə rəqəm bəndəlik.

Bir şəhərin tə'nəsidir hər hünər,
Bir zəhərin zəhmətidir hər şəkər.

Qırmızı sübh atəşi bu mətbəxin,
Xırda qığılcımlarıdır duzəxin.

Ay ki, olub cismi fələkdə çırağ,
Gündən alıbdır o gədalıqla yağ.

Əbr ki, solğunluğa var mərhəmi,
Var yenə pəjmürdəliyə bəlğəmi.

Gərçi suyun canlara var rahəti,
Sor gəmilərdən ki nədir afəti.

Bəs doludur eyb ilə bu karxana,
Bir nəzər et onda olan nöqsana.

Göz yumub öz eybinə, olma həmən
Özgələrin eybinə ayinə sən.

Ayinə tək eyb açan olma bəs,
Açmaya ta eybini bir dəm nəfəs.



Varsa, yaxandan hünər aşkar elə,
Yoxsa, öz eyb ayinəni parələ.

Eyb üçün öz surətinə bax müdam,
Özgələrin eybinə göz yum təmam.

Baxma ki hər şeydə hünər, eyb var,
Göz yumub eybə, hünər et ixtiyar.

Qarğa ki, gündüz qəfəsində gəzər,
Yüz çırağ ilə gecə görməz nəzər.

Zərlə bəzənmiş tavusun şəhpəri,
Yoxdur ayağında məzəmmət yeri.

Qarğa ki, cismi qaradır sərbəsər,
Gözləri ağdır, sən ona et nəzər.

## İSANIN (Ə) DASTANI

Yerbəyer İsa ki edərdi güzər,
Bir bazara düşdü yolu bir səhər.

Gördü ki, qurd tək yekə bir it düşüb,
Yusifi çıxmış quyudan, küt düşüb.

Bir neçə quzğunsifət orda, onun,
Cəmdəyinə tə'nə edir ki, bunun

Vəhşəti ilə olur əlbət, dimağ
Adi nəfəsdən qaralan tək çirağ.

Hər biri rişxəndlə deyir: – «Aşikar,
Göz kor olar bundan, ürək həm qubar».

Hər biri bir pərdədə tutdu nəva,
Hər biri bu cəmdəyə etdi cəfa.

Yetdi o həngam ki İsayə söz,
Eybi atıb tutdu o, mə'nayə söz.

Ki: – «Onun eyvandakı nəqşində həm,
Dürr olur dişləri yanında kəm».

Amma, bu yanmış sədəfə sərbəsər,
Bəs diş ağartdı o iki-üç nəfər.

Özgənin eybin demə, öz ehsanın,
Öz yaxana bax, demə yox nöqsanın.

Bir gün əgər ayinə alsan ələ,
Olma təkəbbürlü, təvazö' elə.

Ziynətə meyl etmə, necə novbahar,
Ki tamah eylər sənə bu ruzigar.

Eyb libasın ki tünük tikdilər,
Üstünə doqquz tutuğu çəkdilər.

Bu üzüyün həlqəsi içrə nə var
Ki, o sənə tövq deyil aşikar?!

Çün it olan tövqi-Süräyya çəkər,
Eşşək olan bari-Məsiha çəkər.

Bir qarımış dul kimidir asiman,
Bir çürümüş meyvəyə bənzər cahan.

Hər nə bu aləmdə ki var fanidir,
Dəyməz iki arpaya ki, anidir.

Qalx, yemə dünya ğəmin, ey xacə, çox,
Onda Nizami payı yoxdur ki? – Yox!



## ON BİRİNCİ MƏQALƏ
## DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA

Qalx, fələk fərşini yığ, et tumar,
Çünki, bu nərdtaxtada yox e'tibar.

Gəzmə murad nəqşi tumarında heç,
İnsaf üzü yoxdu qumarında heç.

Bu dəniz üstündə bu qaçmaq nədir?
Bu ləpə üstündə yük açmaq nədir?

Ördəyə şahin dedi: – Çöl yaxşıdır,
Ördək ona söylədi: – Göl yaxşıdır.

Ğəm gəmisində oturub ümmanın,
Öz malının boynuna salma qanın.

At bu yükü, yoxsa əziyyət verər,
Suyə verincə səni möhlət verər.

Yoxdu bu küllükdə bir asudəlik,
Yox bu sümük içrə vəfadən ilik.

Zərrəcə çəkməz bu cahan naz heç,
Çək ayaq, olma ona həmraz heç.

Baxma ki ne'mətlə dolu hücrədir,
Kasəsi aludə bu boş süfrədir.

Kim ki göz açdı, gözünü tikdilər,
Kim ki dil açdı, dilini çəkdilər.

Boşdu kəcavə, nə çalır zəng çox?
Boş kasa, milçək nə salır cəng çox?

Bu kasaya kimsə ki barmaq salır,
Barmağı öz baş kasasında qalır.

İl boyu bu kənddə deyildir səvab,
Vəhm ilə ğovğadə, yuxuyla xərab.

Et özünə xəlvət ədəm xanəsin,
Boşla bu viranəyə viranəsin!

Tüstüyə tapşır bu evin rövzənin,
Çör-çöpə təslim elə bu məskənin!

Əl nə açırsan cahana, ar elə,
Yoxsa ki qarnından o çıxmış belə?!

Aləmə çək xətt, ğəmin kəm yaşa,
Dövrdən asudə müsəlləm yaşa.

Mənzil uzaqdır, yol uzun, sə'y qıl,
Mənzillə azuqə, yola rə'y qıl.

Divlərə mənzil olan çöldü bu,
Təşnəyə oddur bu cəhənnəmdə su.

Xizr suyu onda cigər qanıdır,
Gün bulağı odlu nəməkdanıdır.

Şorluğu duzsuzlara olmuş şərab,
Duzlusu, duzlanmışı olmuş kəbab.

Yox suyu, duz rəngli suyundan həman,
Qəlb ödü su oldu, həm öd qəlbi qan.

Yol ki, ürək görcək onu təng olur,
Təb'in ona qafiləsi ləng olur.

Div dolu bu çöldə ki, oddur dəmi,
Təng ürəyin olmadı kəm heç ğəmi.

Kim ki tutub təb' ilə bu iqlimi,
Dondu cigər tək, əridi öd kimi.



Qazma cəhənnəm mayalı türbəti,
Keç bu cəhənnəmdən, al o cənnəti.

Ta ki bu toz-torpaq olan cism var,
Payimal eylər onu bu ruzigar.

Hər necə ki xəlqi giriftar edir,
Sənlə də axır elə rəftar edir.

Bir gün olur torpaq olur mənzilin,
Çək ayaq, ondan nə olur hasilin?!

Heç kəsi salma ayağa, torpağa,
Salmış o çox sən kimini tapdağa.

Kim canı qurtardı bu həngamədə?!
Kim xəti vurdu başa bu namədə?!

Çək bu tikanlıqdan ayaq, qıl nəzər,
Yaxsa, görərsən tikanından zərər.

Burda məqamın ki səlamət deyil,
Qorxulu mənzil bir iqamət deyil.

Bu o məkandır ki, qərar onda yox,
Bu o xəzandır ki, bahar onda yox.

## MÖ'BİD VƏ BOSTAN DASTANI

Var idi bir mö'bidi Hindistanın,
Düşdü yanından yolu bir bostanın.

Gördü naxışlarla dolu bir ribat,
Tapdı nişanlarla dolu bir büsat.

Qanə çəkib ğönçə fələk tək kəmər,
Lalənin ömrü kəm, özü bixəbər.

Şur salıb gülşənə gül rəng-rəng,
Pak dolub şəkkərə ney təng-təng.

Yarə vurubdur gülə öz peykanı,
Lərzəyə gəlmiş söyüdün həm canı.

Zülfi-bənövşə dügün öz boynuna,
Dideyi-nərgis dirəm öz qoynuna.

Lalə gühər yonmada, firuzə – gül,
Bir dəm o, bir gün bu yaşar, çox deyil.

Hər kəsə möhlət verilir bir nəfəs,
Aqibəti yox düşünən bircə kəs.

Keçdi o bağdan qoca, bir də ora
Düşdü yolu bir neçə aydan sora.

Gördüyü gül-bülbül olan bağ idi,
Amma, yerində bir ovuc zağ idi.

İndi cəhənnəmdi o cənnət daha,
Qeysəri qəsrin gedib atəşgaha.

Ki, əriyib səbzələr olmuş buxar,
Gül yeri dolmuş bir-iki çəngə xar.

Baxdı bu əhvalə, ürək dağladı,
Onlara güldü, özünə ağladı.

Ki: - «Nə ki fəsl ilə nümayan olur,
Ömrünə nə fikr, nə imkan olur.

Hər nə ki torpaqla sudan baş çəkər,
Aqibəti fani olur sərbəsər.

Yoxdu gözəl mülk fənadən səva,
Mən ona üz tutmağı gördüm rəva».



Eylədi fəhm ilə yəqin bir nəzər,
Bildi Xudadən, həm özündən xəbər.

Oldu o sirr gövhərinin sərrafı,
Getdi dalınca ki, yox ondan safı.

Gəbrdən islamiliyin kəm deyil,
Çeşməsən, amma buludun nəm deyil.

Tutma o mö'biddən özün kəm belə,
Keç bu cahandan, onu yox zənn elə.

Olma bu torpaq kimi çox sərsəri,
Tacü kəmərdə yox öyünmək yeri.

Boşla bu torpaq kəmərin, yox səmər,
Qanını tökməkçün o çəkmiş kəmər.

Tacü kəmər ki, olur afati-eşq,
Xoşdu girov tutsa xərabati-eşq.

Onda bədən xacəliyi var sənə,
Bunda ürək bəndəliyi var yenə.

Olmayasan xacə-ğulami kimi –
Boşla Nizamini Nizami kimi.

## ON İKİNCİ MƏQALƏ
## BU MƏNZİLLƏ VİDALAŞMAQ HAQQINDA

Qalx, vida' eylə bu əyyam ilə,
Qoyma bu torda ətək aram ilə.

Sən daha xoş mülkə tədarükdə ol,
Sən daha xoş hücrə tərəf başla yol.

Göz, ürək olduqca hidayət sənə,
Göz yaşı naləylə kifayət sənə.

Bir gilə salsan bu gilə göz nəmi,
Xacə olursan, ürəyin məhrəmi.

Gər dəvəsən, rəqs et edərkən səfər,
Fil ayağına dəbə atma hədər.

Burda ki, yox tükcə də məhrəm sənə,
Tut bu yol ilə ədəmə üz yenə.

Təb'nəvaz yoxdu, zəriflər gedib,
Həmdəm olan yoxdu, həriflər gedib.

Nola ki çox təb' zəriflik edir,
Tək bədən ilə nə həriflik edir?!

Ey saf ürək ki, dodağın var quru,
Bu bulanıq gildə su yoxdur duru!

Ayrı düşən yolda ki vardır nifaq,
Hasilini sən ayır ondan qabaq.

Ləng gedirsən, şələni atginən,
Yüngül olub mənzilə tez çatginən.

Sən fələk üstə yet, ürək mənzilə,
Yoxsa, bu evdən nə yetər hasilə?!



Bu tora hərçənd giriftarsən,
Bu quyudan, yırt onu, qurtar sən.

Gör bu bütün xət ki, olub bağlı «mim»,
Yol tapar ondan, ikiyə bölsə kim.

Olma bu çox nöqtəli çərxə nişan,
Olma bu xəttindən onun natəvan.

Ötsən əgər sən gecə-gündüz xətin,
Dairə xəttindən ötür ğeyrətin.

Ta ayağın altı deyildir dayaq,
Bir iş üçün atmağa dəyməz ayaq.

Hər işə əvvəl girişirsən necə,
Sonra bil ondan sürüşürsən necə.

Vacib olur yollara salmaq nəzər,
Görməyəsən ta quyulardan xətər.

Aç baca bu sel axıdan eyvana,
Qaçmağa fürsət tapasan bir yana.

Duydu duyuq tülkü ki itdən nəfəs,
Qoydu iki-üç baca bir evdə bəs.

Görmədi tutmuş yolunun üstünü,
Bu bacadan tülkü tutan tüstünü.

Burda nə şadlıq, belə işrətdəsən?
Ğəflət edirsən hələ ğəflətdəsən!

Oldu qərar ki, bu darısqal yeri
Tərk eləyib yollanacaqsan geri.

Qırsan ilahi ilə bu peymanın,
Peymana olmazmı müxalif canın?!

Can gözü ilə nəzər et, get yolu,
Göz yüm iki aləmə, gör göz dolu!

Baxma yerə, qorxmayasan payədən,
Baxma geri, qorxmayasan sayədən.

Dindən et azuqə, özünlə götür,
Yol quru, yurd yox, su gözünlə götür!

Həm sədəfə qaytar o pak gövhəri,
Həm özünü, həm o gili et bəri.

Dövr ilə öldürdü fələk yar çox,
Səndən igid kəslər edib xar çox.

Fikr elə bu düşmən üçün bir kərə,
Vur onu bir fənd ilə axır yerə.

Qalxanı vardır, hünəri amma yox,
Şəmşiri vardır, kəsəri amma yox.

Həlqə bu kəndir ki, ilan tək çalır,
Eşq çəkən dəm səni aciz qalır.

Dur, bu nə şişə, bu nə əndişədir?
Bir daş ilə sındır, o ki şişədir!

Sim verənlər odu zərdən alır,
Düşməninə şəkkər ilə od salır.

Rövşən edir elm, ey ürək, ta səni,
Gün kimi öldür gül ilə düşməni!



## İKİ HƏKİMİN DASTANI

İki həkim etsə də həmxanəlik,
Bir-birinə eylədi biganəlik.

Laf «mən» idi, yox idi «sən» məgər,
Mülk bir idi, «ikilik» dərbədər.

Həqq iki olsa, eşidilməz biri,
Baş iki olsa, biri qalmaz diri.

Kim iki Cəm məclisini bir görüb?
Bir qın içində iki şəmşir görüb?

Qəsdi bu idi iki fərzanənin,
Sahibi olsun biri bu xanənin.

Kin kəmərin tutdu nəhayət ğəzəb,
Xanəni tərk etməyi etdi tələb.

Yarı gecə sözləşərək bir təhər,
Xanəni guya ki satırlar səhər.

Qalmasın onda daha höccət yeri,
Şərbətin içsin birinin digəri.

Ta ki, kimin payəsi qüvvətlidir,
Ya ki, kimin şərbəti şiddətlidir.

Yetsin ona mülkü iki hikmətin,
Qalsın ona canı iki surətin.

Hazir edib bir zəhər əvvəl biri,
Ki, əridərdi daşı həm tə'siri,

Verdi ki, rahət meyidir, al bunu,
Sanma zəhər, sən güman et bal bunu.

Şərbəti ondan alıb aslan kişi,
Bal kimi içdi onu asan kişi.

Nuşgiya hazir edib bir qədər,
Bağladı zəhrin yolunu sərbəsər.

Tapdı qanad, yansa da pərvanə tək,
Şəm' kimi məclisə gəlsin gərək.

Gəldi çəmənlik sarı, bir gül dərib,
Sehr oxuyub, püfləyib, əfsun verib,

Verdi gülü etmək üçün qəhr onu,
Etdi əsər, etməz idi zəhr onu.

Düşmən əlindən gülü alcaq həman,
Qorxu ona ğalib olub verdi can.

Zəhrə əlac etdi o, dərman ilə,
Qorxudan etdi bu vida' can ilə.

Gülşəninin hər gülü bu aləmin,
Gül-gül ürək qətrəsidir adəmin.

Baği-zaman ki, ona sənsən bahar,
Ğəm evi san ki, ona sənsən nigar.

Qalx, bu bağ laylarına səng vur,
Dur, bu mayallaq suya torpaq sovur.

Keç bu suyundan ki, xəyalatdır,
Uç bu bağından ki, xərabatdır.

Nə Günə eylə, nə Aya e'tibar,
Ki tutulur, eyləyir afət düçar.

Oldu o zərrin Ayı bu xərgahın,
Göz yoluna div Xəlilullahın.



Sübh kimi gündüzünü dağladı,
Çərx o gündən bu günə bağladı.

Gər ürəyin nur bağışlar Günə,
O səni bir gün çıxarar bir günə.

Yaş tök, o ümmid gülabı ilə,
Bu qara-ağ lövhəni ta ki silə.

Çəksə tərazuyə Qiyamət səni,
Çəksin əməl onda səlamət səni.

Din ki edir qüvvəli bazun sənin,
Ədl təraz etsə tərazun sənin!

Hansı hünər əhli nəcib adəmi,
Aləm evində çəkər aləm ğəmi?!

Aləmə meylin ki deyil kəm sənin,
Dini Nizamiyə ver, aləm sənin!

## ON ÜÇÜNCÜ MƏQALƏ
## DÜNYANIN MƏZƏMMƏTİ HAQQINDA

Pirdir aləm necə ki təngdir,
Uyma cavan rənginə ki, rəngdir.

Əldə tutub gül, bu cavan piri gör,
Güldən edib atəşə təsviri gör!

Çeşmə sərabdır, nəfəsi həm riya,
Qiblə səlibdir, nəmazı həm xəta.

Var bu qədər gül, hanı xarın sənin?!
Var bu qədər var, hanı barın sənin?!

Yoxsa bu evdən tamahın, var yeri,
Hər nə gətirdin, aparırsan geri.

Ta ki çəkir varını həşr ümmanı,
Yoxsul olan qurtarır ondan canı.

Mayəni ya xərc elə, ya yığ, yenə
Axır alırlar nə veriblər sənə.

Bu cahan alver evidir ta qalır,
Ki bunu versə, onu dərhal alır.

Hasil edir nola ki bir qurd ipək,
Bəs o biri qurd onu eylər yemək.

Şəm' elə bu cə'fəri güldən sarı,
Ki, çırağın öz gülü olmuş barı.

Sındır o doqquz-qapılı peykəri,
Çək zərin altı başına xəncəri.

Qoyma zərə əl, qoy ayaq, et şikəst,
Yoxsa, adın zər tək olur bütpərəst.

Zər ki, murad sikkəsi yoxdur onun,
Zərnix ilə nisbəti çoxdur onun.

Gərçi vurur bərq, verir zər nişan,
Var tavusun quyruğu həm zərnişan.

Sikkə ki, ahənlə vururlar zərə,
Şahları ahəngər edir yeksərə.

Qarunun əzmi edib ondan papaq,
Ki, quyudan ğeyri yox ondan soraq.

Yükdü başında yer edir ta sənin,
Salsan ayaq alta, olur köhlənin.

Gərçi verir can, verir o kəs ki zər,
Almamağı xoşdur o candan məgər!



Gəlsə, hərislik cahana artırar,
Getsə, rahatlıq o cana artırar.

Sən ki yığıb xərc eləmirsən zəri,
Var yeri ki yığmayasan, var yeri.

Saxlama çox yağ kimi, səfra çəkər,
Meyvə kimi nuş elə, səfra tökər.

Parladı məşriq sarıdan gərçi zər,
«Məğribi» söylər onu çox bixəbər.

Məğribi – bəxşiş ilə düşmən hamı,
Məşriqi – bəxşiş ilə rövşən hamı.

Məşriqi sübhün nə verir borc hamı,
Məğribi şamın alıb eylər şamı.

Mə'dənə can valisi zərdir nə var,
Quşlara əl naibi pərdir nə var.

Rumi zəri çəksə də səngi - Dəməşq,
Düz çəkər ağuşə tərazuyi-eşq.

Xoş görünər, parlar əgər, heç nədir,
Tök başına kül ki, sənə fitnədir!

Çalmadı bu oğru, de, kimdən papaq?
Salmadı bu div kimi yoldan uzaq?

## HACI İLƏ SUFİNİN DASTANI

Kə'bəyə əzm etdi gedə bir nəfər,
Gördü tədarük ki edə ta səfər.

Xərcdən artıq ki varı var idi,
Nəqdi onun bir kisə dinar idi.

Sufi bir abid var idi şəhrdə,
Sufilərin şeyxi idi dəhrdə.

Getdi, filan sufi nəcibdir – dedi,
Əl üzüb aləmdən, əcibdir – dedi.

Qalsa – dedi, onda dəyanət qalır,
Özgədə yox, onda əmanət qalır.

Getdi, evindən çıxarıb varını,
Sufiyə tapşırdı o, dinarını.

Ki: – «Bunu sən pərdədə saxla, yenə
Mən qayıdanda gətirərsən mənə».

Xacə ziyarət yoluna tutdu üz,
Şeyx əmanət puluna tutdu üz.

Bir neçə müddətdi ki: – «Yarəb, aman!»
Düşmüş idi dərviş o bəndə yaman.

«İşlərimi axırı yapdım – dedi,
İstədiyim xəznəni tapdım – dedi.

Tanrı verib ki, edə məmnun məni,
Xərc eləyim, etməyə məftun məni».

Bağlamanın açdı neçə bəndini,
İşrətə bənd eylədi peyvəndini.



Hər nə ki yanında qoyulmuşdu zər,
Qarnına israf elədi müxtəsər.

Torbada dinarə vurunca əlin,
Eylədi zünnar gözəllər telin.

Cırdı o şeyxanə olan xirqəni,
Çəkdi böyük üzrə görə ğüssəni.

Uddu şikarı, dağı həm qalmadı,
Heç çırağ üçün yağı həm qalmadı.

Hacı səfərdən qayıdıb sərfəraz,
Eylədi öz hindusuna türktaz

Dur ver, ey aqil, hanı o bəs? - dedi,
Sordu: – Nə? Ərz etdi ki: – Zər! Kəs! – dedi.

İnsaf elə, tərsliyə yox ehtiyac,
Kim xaraba kənddən alıbdır xərac?

Toz tək havadə o pərakəndədir,
Yoxsa nə müflis, nə kisə, zər nədir?

Türkü axı eylədi ğarət, de, kim?
Hinduya tapşırdı imarət, de, kim?

Rüknün ürək rüknümü qırmış mənim,
Ki, bu günah qəsdimə durmuş mənim.

Xəndan-xəndan malı tarac edən,
Giryan-giryan o ayağa gedən,

Söylədi: – «Rəhm et ki, peşiman mənəm,
Kafər idim, indi müsəlman mənəm.

Boylu xələldən bu cahan təb'i həm,
Mən xələl etdimsə də, sən et kərəm».

Ta kərəmi saldı qiyamətlə şur:
«Qalx ki, dərviş ayağa gəldi, dur!»

Tanrıya üz tutdu kərəm sahibi,
Keçdi dirəmdən o dirəm sahibi.

Öz-özünə söylədi: – «Ğəm çəkmə, keç,
Heç nəyi yoxdan nə alırsan ki? – «Heç».

Arpası həm yox, nə tələb eyləyim,
Mən onu əfv eyləməyim, neyləyim?

Onda, o maldan ki edibdir talan,
Həlqəli «mim», kufi «əlif»dir qalan»,

Söylədi ki: – «Çəkməyəsən ta vəbal,
Bəs bu həramı edirəm mən həlal.

Ey qısa qolçaqlı, fələk tək kələk,
Bu əluzunluqdan əlin et gödək».

Hirsü həsəddən pak ürək kimdə var?
Bu yer üzündə kimə var etibar?

Şeytana vermə din əyarın, gedir,
İtbaza fəğfuri bilərzik nədir?!

Vermə ki, ey xacə, görürsən zərər,
Mayəni müflisdən alırsan məgər?!

Eyb evidir bu, get hünər tuşə tut,
Din ətəyin tut, özünə guşə tut

Şihnəsi ğarətgər olan aləmin,
Müflisi yey möhtəşəmindən həmin.

Müflisə yoxdur xətəri dövranın,
Çərx vurur möhtəşəmin karvanın.



Gördüm açıq gözlə qılıb mən nəzər,
Ki, arıya öz balı olmuş zərər.

Şir ətinin təlxdir ondan təmi,
Ta cəsədi olmaya qurd-quş yemi.

Şəm' oturur, qalxmaq üçündür bu hal,
Bədr həvasından olur Ay hilal.

Bağladı qurd sülhü ki torpaqla yel,
Qorxusuz etdi onu yoldan boş əl.

Su quşu bəlkə bilə bu illəti,
Ki, balığın öz puludur afəti.

Arzuna zər me'yar olandan bəri,
Beş namaza fatihə bildin zəri.

Pak olasan ta ki bu me'yardən
Pak Nizami kimi ol vardən.

## ON DÖRDÜNCÜ MƏQALƏ
## HUŞYARLIĞIN VACİBLİYİ HAQQINDA

Ey xər-öküz tək çölə məftun olan,
Otlamağından belə məmnun olan!

Gün dolanan mərkəz ilə yox işin,
Yoxdu bu göy dairədən təşvişin.

İş görər işdən xəbəri kim ki var,
Bixəbər üçün nə ğəmi-ruzigar!

Uyqu ilə tutmusan aram xoş,
Tut elə iş ki, tapa əncam xoş.

Pusqu qururlar, sən uyursan hələ,
İş görən əlbəttə ki, görməz belə.

Qarşıda ğəm püştəsi, yox diqqətin,
Artırır acizliyini xiffətin.

Pirdir əqlin ki olubdur xərif,
O əgər olmur, sən ona ol hərif.

Olmasa idi sənə əqlin şərəf,
Kim səni tə'riflə edirdi xələf?!

Əql Məsihadır, ona çək kəmər,
Palçığa xər çəkmə, deyilsən ki xər!

Əql yolundan rəvan ol, nur tut!
Yoxsa, ətək çək qapısından, unut!

Əqli edib məst, ədəbi tutma kəm,
Şahini bir sərçə üçün etmə yem.

Mey ki, həlal etmiş onu hər məqam,
Əql ilə düşmənliyi etmiş həram.

Mey – o sudur ki, süzülür camına,
Əql – o bir çeşmədir aramına.

Mey səni ğəmdən əgər azad edir,
İçmə onu ki, onu bərbad edir.

Tərkibidir mey cigər ilə duzun,
Ki, cigərində duz olur duzsuzun.

İçmə ki, huşyar olasan ta məgər,
Ki, səni hər şeydən edər bixəbər.

Bixəbər o kəs o şeyi nuş edir
Ki, onu nuş etdiyi bihuş edir.

Çək gözünə mil xəyalata ver,
Vur ayağa kündə xərabata ver.



Olma «əlif» qəddinə aşiq belə,
Uyma bu vəhşətlə, bu sevda ilə.

Quş kimi şəhpər tök «əlif»sən əgər,
Yoxsa, baş əy «fa» kimi, göstər hünər.

Məclisə olsan da «əlif» tək bəzək,
Müflis «əlif»sən yenə müflis tək.

Xar kimi çəkmə baş, ondan daşın,
Gül kimi bir et ayağınla başın.

Tifl deyilsən, nə oyundur belə?
Ömr deyilsən, uzanırsan hələ!

Gün başa yetdi, Günəş ötdü əyan,
Kölgə uzandı nur olunca nihan.

Gün ki, haçan istəyir aşsın divar,
Kölgəsi artır ikiqat hər nə var.

Kölgəpərəst olma, deyilsən ki bağ,
Kölgəqovan ol, necə olmuş çırağ.

Çəksən o kölgəndən əgər sən ətək,
Eybini səndən çəkəcək kölgə tək.

Kölgədə olmaq yetənə fən deyil,
Xizr suyu kölgədə rövşən deyil.

Ey fələk altında qədəmlə süvar,
Səndə fələkdən yuxarı rə'y var.

Sübh sənə verdi qızıl teşt əgər,
Ta sən özündən yuyasan əl məgər.

Paltarı bu teştdə pak eylə, yu!
Gün bulağından rəvan et teştə su!

Sən Günəşin qürsünü sabun elə,
Qoyma libasın qala qan-çirk belə.

Təb' bu atəş ki saçır hər nəfəs,
Qalmadı ömrün cigərində su bəs!

Qalsa ğərəz çirki bədəndə nə ğəm,
Qırmızı həm olmasa zər, tutma kəm.

Bunca pak ünsürdən əgər söz düşər,
Atəşin o mə'dəsi hardan şişər?

Doğruluğu mərdə nə atəş, hələ
Cövşən olur isti-soyuqdan belə.

Əyrilik etsən görəcəksən zərər,
Doğru olanlar tapar ancaq zəfər.

İşdə tərazu tək ol, ey pakürək!
Doğru ürək doğru tərazuyə çək.

Arpaca zur eyləsə bazun sənin,
Zərrəcə kəm qılsa tərazun sənin,

Hər biri üçün çəkəcəklər hesab,
Hər biri üçün verəcəksən cavab.

Göstərəcəklər sənə gizlin nə var,
Çox alıb, az verdiyini aşikar.

Çəkmə tərazu qılıcın çox daşa,
Çəksən əgər çox ver, az al, xoş yaşa.

Gül kəc olur, xarə həmağuş olur,
Neyşəkər amma düz olur, nuş olur.

Harda ki düzlük ələm aşkar edir,
Həqq ona imdad əlini yar edir.



## ZALİM PADŞAH İLƏ DÜZDANIŞAN KİŞİNİN DASTANI

Mərdümazar bir qəvi şah var idi,
Tərs idi, Həccac idi, ğəddar idi.

Sübhdən axşamə nə versəydi baş,
Dərgəhinə dərs idi hər sübh faş.

Sübh biri dərgəhə oldu rəvan,
Sirr açan sübh tək, Ay tək əyan.

Pərdədə kölgə oyununda – qəmər,
Pərdə dağıtmaq əməlində – səhər.

Söylədi: – «Bir yerdə filan pir var,
Gəh səni «cəllad» dedi, gəh «zülmkar».

Şah dedi: – «Görməyib o bidadı,
Göstərərəm indi ona cəlladı».

Nət' çəkib qumladı divan edən,
Div həm ürkərdi o divanədən.

Getdi o pirin yanına bir cavan,
Ki: – «Şah edir səndə cinayət güman.

Ta çağırınca səni o fitnəkar,
Dur get özün, bəxtin olur bəlkə yar».

Ğüsl eləyib pir kəfən geydi həm,
Getdi hüzurinə şahın müttəhəm.

Şah, ğəzəbdən ayağında gözü,
Əllərini ovxayıb açdı sözü,

Ki: – «Nə ağızdır bu edibsən bəhəm,
Sən məni «qatil» demisən, «hərzə» həm?!

Agəh ikən mülki-Süleymanıma,
Div deyirsən mənim ünvanıma?!

Pir dedi: – «Sanma məni bixəbər,
Mən demişəm sən dediyindən betər.

Pirü cavan qorxuda karınladır,
Kəndü şəhər zar biyarınladır.

Eybini ki mən deyirəm aşikar,
Yaxşı-yamanınayam ayinədar.

Ayinə düz göstərir əksin əgər,
Ayinədən yox, et özündən həzər.

Doğru sözümlə elə diqqət mənə,
Verməginən yoxsa ki möhlət mənə».

Doğrusunu söylədi ta pir ona,
Doğru sözü eylədi tə'sir ona.

Şah onun düzlüyünü anladı,
Öz-özünün kəcliyini danladı.

Aldı əlindən kəfənü kafurun,
Söylədi: – «Xəl'ət verin, ənbər vurun!»

Zülm eləməkdən çəkib əl tacvər,
Oldu ədalətli, rəiyyətsevər.

Həqqi daha kimsə nihan etmədi,
Doğru danışmaqda ziyan etmədi.

Doğru əməl lövhə nicat nəqş edər,
Doğrulara Tanrı zəfər bəxş edər.

Doğru söz hərçənd ola cümlə dürr,
Təlx olur, təlx ki: – «Əlhəqqü mürr».



Həq sözü hərgah eləsən ixtiyar,
Yar olacaqdır sənə pərvərdigar.

Həqdü Nizami sözü həm təb'i tək,
Ondan işi həqq ilə tapmış bəzək.

## ON BEŞİNCİ MƏQALƏ
## HƏSƏD HAQQINDA

Hərdəm əcayib bu oyunbaz ki var,
Pərdədən eylər bir oyun aşikar.

Fərşdə mizrab dolu, rəqqas yox!
Bəhrdə gövhər dolu, ğəvvas yox!

Tac ilə şəmşir, bu dövlət, dirəm,
Oldu sənə bəxş, elə sən həm kərəm.

Həmnəfəsin olsa əgər Cəbrəil,
Sanma qəzavü qədər olsun bəxil.

Hər nə aparsan sən o vardan apar,
Hər nə aparsan sən, o artıq tapar.

Ol bu yolun yolçusu, rəftarı gör!
Çal bu qapı həlqəsin, əsrarı gör!

Ki daşı lə'l, torpağı iksirdir,
Anlamasan gər, sənə təqsirdir.

Qırdı təsərrüf əli burda qələm,
Pərdədə görsəndi xəzinə bu dəm.

Hərdəm o bağdan təzə bərdir gələn,
Tər-təzəsindən təzə-tərdir gələn.

Bağlı ürəklər bağı gövhər budur,
Hər bağı digər bağa ziyvər budur.

Bir-biri ardınca gedənlər yolu,
Tayifəsi tayifəsindən dolu!

Əql ki, mə'nayə şərafət verər,
Pirü cavanə necə qiymət verər?!

Daş ki olur köhnə, olur lə'li-saf,
Amma, bu sözdə görünür ixtilaf.

Köhnə bu tayfa bəs olubdur ulaq,
Bəd səsi ilə aparır baş-qulaq.

Kim südəmər çağ səni görmüş əgər,
Sanki, dadır sonra südündən zəhər.

Tazələrə köhnədə mürvət hanı?!
Novcavana pirdə rəğbət hanı?!

Tazə gülün rahəti aşkarədir,
Köhnə tikan neştər ilə yarədir.

Tazə üzümlərdən olur tutiya,
Köhnə ilanlardan olur əjdəha.

Baş kasasında ki olur əql bənd,
Köhnə olan məğzi edirmi pəsənd?!

Təqvimi tazə nə münəccim ki var,
Ləğv eləyər köhnə nə təqvim ki var.

Çox qoca it şir tək ov güddü bəs,
Qurd kimi ahu göbəyin diddi bəs.

Var qoca qurdlardan əgər vəhşətim,
Tutma bu yusifliyimə töhmətim.

Pirin o çəngi, cavanın cəngi xoş,
Olsa da atəş, cavanın rəngi xoş.



Var bu cavanlıqda ki fərzanəlik,
Var bir əlində yenə divanəlik.

Etsə söyüdlük nə qədər yasəmən,
Hindu kimi dəm vurur ağdır həmən.

Mən ki, cavan gül kimi saçdım dirəm,
Dəm qocalıqdan vururam dəmbədəm.

Boşla ki, xudbinlik edər boş səni,
Həqqə olur dost özünün düşməni.

Sən o təzə Ay ki görürsən hilal,
Bədr olur, kəsb eləyir ta kəmal.

Nəxl ucalıb xurma verincə, fəqət,
Öz əlin ilə ver ona tərbiyət!

Hər səpilən danə ki var guşəyə,
Danə demə ki, dönəcək xuşəyə.

Arx suyundan hovuz ümman olur,
Baxma həmin gözlə ki, nöqsan olur.

Yumdu səhərdən gecə yeksər gözü,
Gündüzün oldu ona digər gözü.

Neyşəkərə baxma ki ot tək bitər,
Bax şəkərindən nə məqamə yetər.

Dəm vurana yox, hünərə ver ürək,
Ol ona hər yerdə nişangah tək.

Gərçi sədəflə su firavan olur,
Gövhər ona bir gilə neysan olur.

Həm ürəyi, həm canı yandır, məgər
Ki, tapasan bir taca layiq gühər.

Hər aləm olsa təzə təqdir ilə,
Hifz gərək ki, yetirə mənzilə.

Yoxdu pozan kəs bu ribatı hələ,
Yoxdu yığan bəs bu büsatı hələ.

Darğalıq etmə bu qədər xilqətə,
Ta sənə İblis kimi şallaq yetə.

Hökmünə baş qoymasa hər kim əgər,
Çərxin əlindən qutarır baş məgər?!

## MƏRV MƏLİKZADƏSİNİN ƏMİRLƏR İLƏ DASTANI

Vardı məlikzadə uzaq Mərvdə,
Yoxdu o rəftar cavan sərvdə.

Səltənət əhlindən idi biqərar,
Mülk ona fitnəydi, necə ruzigar.

Yoxdu edən fitnəni peyda hələ,
Vardı xətər, yoxsa da ğovğa hələ.

Bir gecə yatmışdı yenə fikr ilə,
Gördü ki bir pir deyir zikr ilə:

«Ey yeni Ay, köhnədir o bürc, uçur!
Ey təzə gül, köhnədir o şaxə, vur!

Ta ki sənə möhkəm ola dövlətin,
Eyşini xürrəm qıla bu xislətin».

Şah oyandı yuxudan hövlnak,
Etdi o üç-dörd nəfəri tez həlak.



Təzə bina etdi, pozub köhnəni,
Təzə məlik təzələdi ölkəni.

Mülkə salan rəxnə yıxılsın gərək!
Əhdi pozan ordu dağılsın gərək!

Ta çəkə sərvin baş, aça əl-ayaq,
Boynunu vur köhnə nə ki var budaq!

Bağlamasan arxın o ki ağzı var,
Davaya pəncə aça bilməz çinar.

Çeşmə yolu pak gərək bigüman,
Ta suyu torpaq gözü etsin rəvan.

Batini dayən var o səndən uzaq,
Sən o nəsihət verənə ver qulaq.

Çək bir o qından qılıcı bir nəfəs,
Bunca xilaf olmağın olmazmı bəs?!

Bəs bu nəfəs torpağın ağzında yox,
Həmnəfəs haqqında xilaf olma çox.

Hər nə varındır bu kəsə bəxş elə,
Varlığının üstə «kərəm» nəqş elə.

Kim ki, şərəf tapdı onun himməti,
Tapdı kərəmdən əbədi dövləti.

Toxmu-kəramətdü sələmət zəmi,
Yetsə, olur tuşə Qiyamət dəmi.

Yarəb, o xəznəndən özün insaf et,
Nəqdi-Nizami ki səninidir, saf et.

## ON ALTINCI MƏQALƏ ÇEVİK OLMAQ HAQQİNDA

Ey bir əsən mehdən ələm qaldıran,
Bir toz olur səndən ələm saldıran.

Kənd yox ikən kətxudadan umma pay,
Təxt qurursan, hələ yoxdur saray.

Tiğ deyilsən, bu kəsakəs nədir?!
Təbl deyilsən, bu qədər səs nədir?!

Gah qılınc ağzı kimi saç dirəm,
Gah təbil qarnı tək ol boş, nə ğəm.

Düşməmisən ki, divə qoyma məhəl!
Ölməmisən ki, sən ona vermə əl!

Bir müğ önündə əlin olmuş səlib,
Laf qılıncıyla olan tək xətib.

Dövlət olan xütbəni eylər fəsih,
Adəm edən ətsəni eylər Məsih.

Kimsə ki pərvanə kimi dəm vurar,
Öz canını atəşə hərdəm vurar.

Tap bir-iki xoş dəm ilə sən də can,
Xirqəni at ki, tapasan xoş cahan.

Səndə riya bəxşişi layiq deyil,
Vallah, o Allahə müvafiq deyil.

Aslana neylər pişiyi mətbəxin?
Təlqi yaxarmı alovu duzəxin?

Qəlb deyilsən, nə şikayət-filan?
Atəşə yaqut ilə zər tək qalan!



Qəlb bu küllükdə edib «mən» səni,
Ey iki-üç mən sümük, at «mən-mən»i!

Çoxları bizdən qabaq olmuş hələ,
Cahü cəlal arzu ediblər belə.

Hasilinə qıl o cəlalın nəzər,
Xeyri nə, bir xeyr ki eylər zərər?

Göylərə Ay-Gün kimi alsan ayağ,
Olsa da sən torpağa payə o tağ,

Düşməlisən, səndə nə nisbət tağa?
Torpaq olan düşməlidir torpağa.

Azad edincə başını türrədən,
Sən bu dama qoyma ayaq ğürrədən.

Quş kimi gərçi qanadın yox, həmən
Uçmaq üçün canə gərəkməz bədən.

Xoşluq ilə get bu fələklə yola,
Ta bu yol ilə ayağında ola.

Sən şərab içdin, nə günah zəhrdə?!
Sən günah etdin, nə xələl dəhrdə?!

Dəhrə məzəmmət deməz insan olan,
Dəhr deyil insana nöqsan olan.

Cəhd ilə heyrətdə qoyur bəs bizi,
Zəhmət ilə ta edə bir «kəs» bizi.

Dəhrdə biz heç kəs ikən yeksərə,
Dəhrə cərimə nə qoyaq boş yerə?!

Lə'l ola cövhərlə gərək abdar,
Ta ki qəbul möhrü qoya şəhriyar.

Daş, qucağında cahanın çoxdu, çox!
Amma, o ki lə'l olur, yoxdu, yox!

Xarü səmən – hər biri zatəm giya,
Bu – gözə çöpdür, o biri – titiya.

Arx suyundan mədədi olsa kəm,
Əsl gülün ətri gedir, rəngi həm.

Hər necə artırsa da su iltifat,
Xarə səmən tək verə bilməz həyat.

Ruzigar etdi bu qərarı qərar,
Yoxsa, qərar etməz idi ruzigar.

Rə'y ilə yox, iş hamı dövlətlədir,
Dəhrdə dövlət payı qismətlədir.

Hər kişi ki dövləti yox, xar olur,
Yox ğəmi, dövlət kimə ki yar olur.

Tale'i məs'ud yetər rif'ətə,
Harda ki var, bəndəlik et dövlətə.

Dövlət olan mülk məcazi deyil,
Dövlət olan kimsəyə bazi deyil.

Başına dövlətlilərin dövr elə,
Yoxsa ki, sərgəştə qalırsan belə.

Bir-iki müflislə nə rahət yetər?
Dövlətə yetmək sənə şöhrət yetər.

Bəxt ilə Cövzadə tulu' et, həman,
Cövz ilə öz bəxtini et imtəhan.

Döyməyə dövlət qapısın sadə ol,
Aç dügünün aləmin, azadə ol.



Sadəliyindən su gələr xoş, axar,
Öz dügünündən udu atəş yaxar.

Vermə ürək heç kəsə, pir əqli et,
Yolda bədən zəhməti çox çoxdu, get.

Atma digər şaxəyə əl bar üçün,
Yaxma cigər ah ilə bu var üçün.

Tut ki, bütün aləmi tutdun, əcəb!
Tərk edəcəksən, nə edirsən tələb?!

Çəksə tamah boynunu, taət vurar,
Boynun onun vursa, qənaət vurar.

Mərkəzi bu mavi tağın sərbəsər,
Fikrə dar olmuş, sənə gendir əgər.

Ya sən onu çəngə gətir fikr ilə,
Ya sən onu təngə gətir fikr ilə.

Mə'rifəti ğarət olub adəmin,
Mə'rifət əhli nə olub aləmin?!

İki hünərnamədə doqquz dəbir,
Surətə nəqş etmədi mə'nanı bir.

Dost ki mə'na ilə düşməndir, at!
Əf'inin ağzında nə abi-həyat?!

Əqli olan düşmən olur dərdisər,
Nadan olan dost olur ondan betər.

## YARALANMIŞ UŞAĞIN DASTANI

Bir neçə tay-tuşla nəcib bir uşaq,
Oynamağa çıxdı xətərdən uzaq.

Ta atılıb-düşdü iki-üç kərə,
Oynadığı yerdə yıxıldı yerə.

Sanki, qəzadən bu imiş bəhrəsi,
Sındı ürək mehri, ayaq möhrəsi.

Gördü, çətin oldu vəziyyət, hamı,
Çəkdi vəziyyətdən əziyyət hamı.

Kim ki yaxın dostu idi, etdi ərz
Ki, quyuya atmağımız oldu fərz.

Gün kimi onda nə olur sirr əyan,
Nə atası bizdən olur bədgüman.

Burda ona düşmən uşaq var idi,
Cümlə uşaqlardan o huşyar idi.

Söylədi: - «Siz etməyin əsla güman
Ki, bu işin surəti qalsın nihan.

Burda mənəm çünki onun düşməni,
İşdə günahkar biləcəklər məni».

Getdi, uşaq sahibinə söylədi,
Gəldi ata, çarəsini eylədi.

Var isə hər kimdə bilik cövhəri,
Hər şeyə qadirdir onun gövhəri.

Kim ki fələk bəndin açar, lacərəm,
Əvvəl onun üstünə qoysun qədəm.



Tapdı Nizami fələk avazəsi,
Yox hünərincə fələk əndazəsi.

## ON YEDDİNCİ MƏQALƏ
## NƏFSİ QORUMAQ HAQQINDA

Ey özünü, Tanrını həm yad edən,
Can ğəmi, tən rənci ilə dad edən.

At bu qəlib içrə o «mən-mən» ki var,
Çünki, dodaqdan yana etməz güzar.

Olma cahançün bu fələk tək kəman,
Hər nə səninçün ki deyil, atma can.

Yox cahanın zuruna bazun sənin,
Yox daşına qarşı tərazun sənin.

Tozda olan zur ilə dağ oynamaz,
Cüz'i qığılcımla qazan qaynamaz.

Hansı riza ilə çəkilmiş kəmər,
Çəkdi bədən qeydi ilə dərdisər?!

Hirsi riba üçün olur məhrumun,
Başda riza tacı olur məhkumun.

Kisəkəsən yol dolu, ğarət gedir,
Kisəsi boşlar yolu rahət gedir.

Dərdisərə şükr elə, ey möhtəşəm,
Yoxsa, get iflas ətəyin tut, nə ğəm!

Bir kosa gördü iki kəs cəng elər,
Bir-birinin saqqalını çəngələr.

Xoşdur üzümdə – dedi, tük kəm mənə,
Saqqal üzündən daha yox ğəm mənə.

Bu işi xeyr ilə belə saldılar,
Ki, ulağından yükünü aldılar.

Cəhd edib İsa kimi ta ruh ilə,
Yüksüz, ulaqsız yetəsən mənzilə.

Mö'min ikən gəbrliyə vermə yol,
Sərtliyə meyl etmə, calış yumşaq ol.

Təhlükədir dalğa, işi yüngül et,
At yükü, qurtar canı, asudə get.

Xoş o xərab kəs ki, əliboş qalır,
Ta su üzündə kudu tək xoş qalır.

Qədr olan xəznə xərab içrədir,
Nə yemək-içmək, nə də xab içrədir.

Cəmdək üçün ölmə, deyilsən zəğən,
Zağ tək olma ayağı qanlı sən.

Büt tək əgər qandan olur boş camın,
Zağü zəğəndən qutarır əndamın.

Sən qanı zənn et meyə dönmüş cigər,
Şərmdən olmuş su tək ataş məgər.

Qüvvəni qandan kəm edə ta ki bir,
Olsa dəmir həm yeyəcəkdir dəmir.

Qalma yeməkdən, ye-iç insaf ilə,
Nəqdini xərc eyləmə israf ilə.

Şir yeyir az, belə məğrurdur,
Ataşin acgözlüyü məşhurdur.

Bax kökə ilə şad olan gündüzə,
Gör necə nur oldu hər aqil gözə!



Vaxtsız içdi gecə sübhün camın,
Ki, qara etdi qan onun əndamın.

Əqli edir kəm o ki çox nuş edir,
Qəlbi də pəjmürdəliyə tuş edir.

Əqlin o candır ki, bu cismindədir,
Canın o xəznə ki, tilismindədir.

Qır bu tilismi ki, qırır gər səni,
Ta edə bu xəznə münəvvər səni.

Yoxdu bu torpaqda görən e'tibar,
E'tibarı olmayana olma yar.

Ömrün əgər olsa təmam ğəm sənin,
Ğəm yemə, etməz ğəmini kəm sənin.

Söylədi bir gün atası zənciyə:
«Ağlamalı üzlə gülürsən niyə?»

Söylədi: – «Aləmlə kimin yox işi,
Xoşdu qara üzlə ağarsın dişi».

Nola qara üz gülüş eylər əyan,
Qarə bulud şimşəyi etməz nihan.

Bağlı deyilsən bu şəhərdə əgər,
Aləmə şimşək kimi gül sərbəsər.

Tuti gülüşlə şəkəri dağlayır,
Qəhqəhə kəklik dodağın bağlayır.

Vaxtsız açır onda ki gülmək dügün,
Yaxşı olur ağlamaq ondan yəqin.

Bərq tək atəşlə gülüş dəmbədəm,
Ömrü qığılcım kimi etməzmi kəm?!

Yoxdu bu gülınəkdə fərəh şəm' tək,
Bu gülüşə ağlayasan sən gərək.

Xoşdu ki, yersiz ağarınca dişin,
Dişlə dodaq didmək ola vərdişin.

Ağlama artıq, gözü bimar edər,
Gülmə çox, ətrafını bizar edər.

Görsən əgər köhnəni, ya tazəni,
Yaxşı-yamanında gör əndazəni.

Qalx, ğəmə meyl et, otur eyş elə,
Gah elə xoşdur olasan, gəh belə.

Xoş ürəyin can yaxan əfğanı var,
Hər gecə bağrında səhər qanı var.

Kimdir o kəs ki, görə ne'mətlə naz,
Görməyə ardınca onun bir qapaz?!

Zəngi olur hər məkanın, hər yerin,
Milçəyi var hər şirənin, şəkkərin.

Dayə olubdur sənə bu ruzigar,
Tapşır ona yaxşı-yamanın nə var.

Sən şirə tək coşma, verir sirkə gər,
Xeyrxahındır, sənə verməz zərər.

Kim bu yolu tutdu, səlim oldu bəs!
Xizr ilə həmrah Kəlim oldu bəs!

Yoxsa böyüklər nazına taqətin,
Çəkmə böyüklər yerinin xiffətin.



Dost yaman gün əgər eylər kömək,
Tor çəkər, əlbəttə ki, çəkməz ətək.

## MÜRŞİD VƏ MÜRİDLƏRİ DASTANI

Bir dəfə bir mürşid edirdi səfər,
Vardı yanında müridi min nəfər.

Naçar olub pir bu dəm nagəhan,
Onlara bir yel elədi ərməğan.

Hamı çıxıb getdi, yığıb əl-ətək,
Bir müridi qaldı o pir ilə tək.

Pir soruşdu ki: – «Nədir niyyətin,
Getməyə yoxdur görürəm rəğbətin?!»

Söylədi ki: – «Ey ürəyim növrağı,
Ey başıma tac ayağın torpağı!

Mən yel ilə gəlmədim əvvəl nəfəs,
Getməyə həm yel tək edəydim həvəs.

Bəxşiş uman olsa, yola əzm edər,
Gəlsə yel ilə nə, yel ilə gedər».

Tez oturan, tez də durandır ğübar,
Tutmaz o bir yerdə onunçün qərar.

Tapdı dağ ahəstəlik ilə məqam,
Durmağa bu payədə eylər davam.

Pərdə dağıtmaq işi dövrandadır,
Rənc yükü səbr edən insandadır.

Saleh olan zöhd yükün tək çəkər,
Yoxsa, təbiət yükün eşşək çəkər.

Zöhd xətində yox əgər təqlidin,
Olsa da göz nəm, xoş olur ümmidin.

Zöhd qumaşında ki, sultan olur,
Qisseyi-zənbilü Süleyman olur.

Şəm' ki, zər saçmadadır hər gecə,
Zahid olub gizliqəba gör necə!

Zöhd ğəribdir ola meyxanədə,
Xəznə əzizdir ola viyranədə.

Zöhdü Nizaminin əcəb nəqşdir,
Zər ələm altında səfabəxşdir.

## ON SƏKKİZİNCİ MƏQALƏ
## RUZİGAR ƏHLİNİN VƏFASIZLIĞI HAQQINDA

Qəlb vuranlar neçə cür durdular,
Qəlblərindən qəlibə vurdular.

Bellərinin yoxdu qarın tək üzü,
Əllərinə qoyma düşə hər sözü.

Nur kimi üzdə müvafiq hamı,
Sayə kimi dalda münafiq hamı.

Şəm' kimi sadə, dügünlənmiş ud,
Sadəsifət, amma dügün bir vücud.

Cövr qılan cövrü inayət sanır,
Eyb tutan sanma şikayət qanır.

Mehri ağızdan-ağıza yağlıdır,
Kini dügündən-dügünə bağlıdır.



İstidir, amma ki cigər tək donuq,
Canlıdır, amma canı yox tək soyuq.

Ülfətinə çəkmə məhək qəlb ilə,
Məst deyilsən ki batırsan gilə!

Sirrini vermə ki, bu dağ xəznədar
Ta sözünü etməyə aləmdə car.

Laf vurur səndən o hörmət tapa,
Cəhd qılır səndən o bir şey qapa.

Sülhü ki məkr ilə olur bədxahın,
Kəssin o sülhü ğəzəbi Allahın!

Dostluq ilə kim ki güdür bir ğərəz,
Dostluğunu eylər ədavət əvəz.

«Sənlik» ilə «mənlik» olan ülfəti,
Olsa, ədavətdən olur nisbəti.

Zəhrini dostun nə sanırlar? – Şəkər!
Eybini dostun nə qanırlar? – Hünər!

Məhrəm olan dost verər mərhəmin,
Yoxsa, sözün tərk elə naməhrəmin!

Çox pişik eyni dəridən ki geyir,
Öz balasın istədiyindən yeyir.

Dost deyil, kim ki deyil pərdədar,
Pərdə çırandır, necə ki ruzigar.

Sə'y qılır ki, düşə səndən qabaq,
Pər vura axır işinə bir sayaq.

Zahirən, olsun ki sənə yar olur,
Amma, zərurət dəmi naçar olur.

Kim ki, olur dostluğu rövşən sənə,
Etsə ürək rədd, odu düşmən sənə.

Fəhm edə bilməz bədən öz yarını,
Anlar ürək bəlkə vəfadarını.

Bir ürəyin var dolu azardən,
Bir gülün almış yara yüz xardən.

Çünki, Firidun bir olur, mülk çox,
Faliyə bihədd, dimağ amma yox.

Pərdə cırar, hər nəyi var aləmin,
Sirrə ürəkdir tək olan məhrəmin.

Bənd et ürəkdə sən onu, ver ədəb,
Digər ürəkdən kilid etmə tələb.

Sən ki, tünükdür ürəyin, mehriban,
Gün tək odur sirrin olubdur əyan.

Sirri tünüklükdən ürək faş edir,
Şişə içir mey, nə gərək faş edir?!

Bir nəfəs istərsən əgər həmnəfəs,
Həmnəfəsin bir nəfəsin olsa, bəs!

Hökm olunan mülkə ki qoydun qədəm,
Əl-ayaq et həmdəm üçün dəmbədəm.

Dostunun əvvəlcə tanı cövhərin,
Sonra səp öz sirlərinin gövhərin.



## CƏMŞİD VƏ MÜHAFİZİ DASTANI

Xas nədim var idi Cəmşid ilə,
Mah necə xas idi xurşid ilə.

İş elə gəldi ki, gəzib aləmi,
Şah onu etdi özünün məhrəmi.

E'tibarı, gördü ki qəlbində var,
Xəznəni etdi cavana e'tibar.

Gərçi yaxındı cavana şah çox,
Şahdan uzaqlaşdı, necə yaydan ox.

Sirr onun deşsə də can dürrünü,
Heç kəsə açmırdı şahın sirrini.

Gəldi əlac etsin ona bir qarı,
Rəngini gördü cavanın sapsarı.

«De, nə xəzandır – dedi, ey sərv, bu?
Şahların arxından içirsən ki su!

Ğəmdən uzaqsan, bu saralmaq nədir?
Şadlıq içində bu daralmaq nədir?

Bu qocalıq rəngi nədir, ey cavan,
Xeyri olubdur nə üçün arğavan?!

Padşahın sirdaşısan sən, gərək
Gülsün üzün padşahın qəlbi tək.

Solsa rəiyyət üzü, şahdan solar,
Məhrəm olan üz daha solğun olar».

«Səndə – cavan söylədi, nə çarə var,
Bu ürəyimdə ki bu cür yarə var?

Dərd ilə səbr etdi məni həmnəfəs,
Səbr ilə rəngim saralıb-soldu bəs!

Öz qədərincə cahanın sərvəri,
Qoydu mənim sinəmə sirr gövhəri.

Köksümə qoydu o böyük dürrünü,
Açmaq olurmu böyüyün sirrini?!

Gör bu nə sirdir ki, belə saxlaram,
Bir kiçik işdən dilimi bağlaram?!

Bağlı bu xəndə qapısı, vəchi var,
Sirr quşu şayəd ki, dilimdən uçar.

Sirr ürəyimdə ola pünhan əgər,
Razıyam olsa ürəyim qan əgər.

Sirrini aşkar eləsəm sultanın,
Bəxt başımda qıracaq peymanın».

«Çəkmə – qarı söylədi – ad bir də bəs,
Öz nəfəsin et özünə həmnəfəs.

Bu dəmə bir kimsəni məhrəm demə,
Məhrəmin öz kölgən ola həm, demə!

Yaxşıdır, əlbəttə, saralsın belə,
Qırmızı olmaqdan üzün qan ilə.

Mən gecələr yad edirəm çox zaman,
Baş dil önündə eləyir «əl'aman!»

Xəncər olan dil başa ğovğa olur,
Sirri açan Gün kimi rüsva olur.

Dil qısa etmək xoş olur mərddən,
Ki, quduz il dil uzadır dərddən.



Yaxşıdır olsun dilin ağzında bənd,
Qında qılınc olsa, edərlər pəsənd.

Can bu nəsihətlə tapar rahəti
Ki: – «Başa dildir gətirən afəti».

Saxla bu teşt üstə dilin, ta sabah
Teştin içindən deməsin başın «ah».

Açma dodaq, saçsa da hərgah şəkər,
Ki, divar ardında qulaq səf çəkər.

Çəkmə bənövşə kimi bir dəm nəfəs,
Başını üzməkçün edərlər həvəs.

Ğeybət eşitmə, qulağın vardır,
Eyb demə, susmalı ruzgardır!

Çox nə yazırsan, qələmi yumşaq et,
Çox yazılıbdır: – «Dilini dustaq et!»

Hər nə eşitsən, su kimi eylə saf,
Ayinə tək gördüyünü etmə laf.

Sə'y eləyənlər gecə nə gördülər,
Bir kəsə gündüz nə xəbər verdilər?!

Bir bax o ulduzla dolu günbəzə,
Görsə gecə hər nə, deməz gündüzə.

Eylə bir ibrətlə nəzər aləmə,
Hər nə görürsən gecə, gündüz demə.

Var gecədə xəlvət edən xəznələr,
Xəznə olan köksü – dolu sinələr.

Şimşəkayaqlar ki, ürək saf edər,
Gördüyünü zənn eləmə laf edər.

Onlar atı Ərşə tərəf çapdılar,
Batini meydanda topu qapdılar.

Göz ilə dil zahirədir müştəri,
Ki başı tükdür, bədəni həm dəri.

Pərdədə eşq olsa, kəramat olur,
Çıxsa, məqamatı xərabat olur.

Bu dügünü din sapına vurdular,
Pənbeyi-Həllacı didib vurdular.

Pərdə edən ğonçə bu sirrə canı,
Açcaq ağız, arx tək axdı qanı.

Yox ağızın rütbəsi şərh eyləsin,
Şərh ürək ağzı edər öz qissəsin.

Qəlb camında xoş olur bu təam,
Gəlsə, ağızda olur ataş təmam.

Xoşdu fəsahətdə ağız bağlamaq,
Xoşdu tələsməkdə ayaq saxlamaq.

Nurlu ürəklər demək üçün sözü,
Özgələrə ağzını vermiş özü.

Söz ürək içrə nə ki var, biguman,
Ancaq ürəkdir o sözə tərcüman.

Qane' ürək olsa Nizamidə gər,
Mülki-qənaətdə olur tacvər.



## ON DOQQUZUNCU MƏQALƏ
## AXİRƏTİ QARŞILAMAQ HAQQINDA

Xəlvəti məclis əcəb asudədir,
Bədr kimi nur ilə aludədir.

Şəm' gülür, məclisə şəkkər saçır,
Təxt qurulmuş, əcəb ənbər saçır.

Ey dini dünyayə verən naz ilə,
Hifz eləyənlər deyir avaz ilə:

«Gəzmə zəlalət qapısından hüzur,
Qalx, bu sirlər hərəmin dövrə vur».

Göz görə ataşdən özün qaçmadın,
Açdılar aləm sənə, göz açmadın.

Kini soyuq olmaz itin bir nəfəs,
Tülküyə tikdirdi nədən kürk bəs?!

Oldu kükürd ataşi bu zirzəmi,
Kim ki keçib getdi, xoş o xürrəmi!

Sən ədəb ilə yığ öz ağzında su,
Et bu kükürd çeşməsinə bir «tfu!»

Borcunu qaytar bu sütunsuz tağın,
Torpağa at torpağını torpağın.

Hər nə ki var, tərk elə ğeyrətlə sən,
Vasil ol azadlığa heyrətlə sən.

Kim ki bu yolda eləyir «mən-mən»i,
Həm məni yoldan eləyir, həm səni.

Təlx olur əqrəb yarası mardən,
Sancır o pünhani, bu aşkardən.

Xırdaca düşmən ki, bəladır böyük,
Eyləməsən fəhm, xətadır böyük.

Xırda demə xırda olan düşməni,
Xırdalığın yoxsa, edər yox səni.

Xırdaca bir mur təəccüb deyil,
Xırda şirin gözlərinə çəksə mil.

Evdə var oğru, nihan et varını,
Çöl doludur div, çağır Tarını.

Yolda ürək ğarət edənlər dolu,
Mənzilin ağzında kəsirlər yolu.

Qorx o gecə şəbxun edənlər ki var,
Xar, bu çöldən səni etsin kənar.

Karvan oğurlansa, yetər mənzilə,
Yüklü gəmi dönsə, dönər sahilə.

Görməyələr ta, yuxu tək ol nihan,
Qovmayalar ta, su kimi ol rəvan.

Qoymağa bu hücrəyə dəyməz ayaq,
Qoysan əgər, çıxmağını ver soraq.

Çıxmasan ondan cigərin qan olur,
Rəxtin ilə çıxmağa fərman olur.

Olmasa yerdən səfər etmək hünər,
Çərx həm etməz gecə-gündüz səfər.

Qalx, atınca yaxana div əl,
Tut ətəyindən ürəyin, dinə gəl!

Şər' səni səslər, ona et səma,
Təb' səni bəslər, ona et vida.



Şər' nəsimdir ki, cana tuş elə!
Təb' ğübardır, cahana tuş elə!

Şər' ilə çünki əli reyhanlısan,
Təb' ilə yox, şər' ilə iymanlısan.

Hər qapıya vermə səba tək nəfəs,
Hər nəfəsə etmə həva tək həvəs.

Sən işıq ol, özgə nə var kölgədir.
Öz cahanın var, bu cahan özgədir.

Çənbərin olmuş bu fələk çənbəri,
İndi bu çənbərdən elə baş bəri!

Hali edir halinə hərgah səni,
Ya ki, yaşından edir agah səni,

Vəhmi önündə dar olur meydanın,
Dövrü yanında kəm olur dövranın.

Axırı söz-söhbətin aram tapır,
Yad edən olmur, işin əncam tapır.

Ta ki bu aləmdə çəkirsən nəfəs,
Bir kəsin eşqi qapısın döy ki, bəs

Bir-iki dəm sən kimi bədnam ilə,
Olsa olur xoş belə bir cam ilə.

İki papaqlıq aparır bigüman,
Bircə qəba biçmək üçün asiman.

Kinli bu kafir nə ki etsən hədər,
Kin qələmiylə adına nəqş edər.

Hər qapı açsan, naz ola, ya şərəf,
Açdığın axır açılır sən tərəf.

Olsa gözün pərdəsi şuxluqla naz,
Sənlə həmin pərdə, həman hoqqəbaz.

Yaxşı-pisi görmüş o kəslər ki çox,
Yaxşını sevmiş, pisi əlbəttə yox.

Yolda gedən yolçu əlamət qoyur,
Pislik edən kimsə zəmanət qoyur.

Yaxşı, ya pis surət – o digər gedir,
Sənlə adındır ki, bərabər gedir.

Xar gül açsa həm adı «xar» olur,
Müşk ilə ənbər satan «əttar» olur.

Olsan əgər qəlb zərurət dəmi,
Sənsən, o gün, Tanrı, xəcalət dəmi!

Boşla bu bağrı daş olan əyyamı,
Daşla bu qanla dolu büllur camı!

Keç, bu civə günbəzə yox e'tibar,
Çək qələm, üstündə nə ki hərf var.

Bu qalanı həlqə kəmənd ilə tut,
Qalx, süvar ol bu səmənd ilə tut.

Hücrə edib doqquzayaq minbəri,
Ta adına xütbə desin çənbəri.

Sən çək ələm ki, hünərin vardır,
Mən ələm atdım, bu həm aşkardır.

Adəmiyəm mən, mələkə naz edən,
Nazla fələkdən yana pərvaz edən.

Qiymətimə qamətim ahəngdir,
Dövrümə bu dairə çox təngdir.



Yoxdu suyum, var əzəmət ümmanım,
Xəznədir arzum, yox ikən mərcanım.

Xəznələr üstündə fələk tək mənəm,
Himmət ayatıyla yolu rövşənəm.

## HARUNƏRRƏŞİD VƏ DƏLLƏK DASTANI

Haruna yetdikdə xilafət çağı,
Çəkdi baş Əbbasilərin bayrağı.

Bir gecə arxa çevirib övrətə,
Tutdu üzün isti suya, rahətə.

Dəlləyi qırxdıqca başından tükü,
Haruna tuş eylər idi ğəm yükü:

«Ey bilən ustad məni şad elə,
Sən özünə gəl məni damad elə.

Öz qızını namizədi-bəndə qıl,
Xütbeyi-təzvici pərakəndə qıl.

Pozsa da bu Harunun əhvalını,
Etdi həya, pozmadı öz halını.

İstidən əlbət belə çaşmış – dedi,
Qorxudan öz həddini aşmış – dedi.

Yoxsa, danışmaz belə, gözlər ədəb,
Yoxsa ki etməz bunu məndən tələb.

Təcrübə etdi neçə gün sonra həm,
Gördü həmin sikkə, həmin qəlb dirəm.

Bir neçə yol etdi belə imtəhan,
Adətini gördü dəyişmir cavan.

Tapmadı tədbir bu rəftarə o,
Sordu vəzirdən bu işə çarə o.

Ki: - «Qələmiylə başıma dəlləyim,
Gör nə yazıbdır, sən eşit, mən deyim.

Damadım olsun gərək o, söyləyir,
Gör bu ədəbsiz nə tələb eyləyir.

Ta başım üstündə qəza tək durur,
Həm mənə, həm gövhərimə daş vurur.

Ağzına xəncər, ələ ülgüc alıb,
Baş iki şəmşir arasında qalıb».

«Çox narahat olma – vəzir söylədi,
Bəlkə durub xəznənin üstə – dedi.

Gəlsə başın üstə, de o nadana,
Qoy ayağın qoysun o yerdən yana.

Cəng eləsə, qətlini et ixtiyar,
Yoxsa ki qazdır o yeri, gör nə var».

Qıldı riayət sözə sakit əmir,
Etdi o cür, hər nə demişdi vəzir.

Çəkcəyin əvvəlki yerindən ayaq,
Gördü ki, dəllək bu deyildi bayaq.

Gördü onu az danışan bir adam,
Üz-gözü, ağzı ədəb idi təmam.

Xəznənin üstündə gəlib ta durur,
Xatiri şahlıqdan onun dəm vurur.

Xəznədən hərgah çəkirdi qədəm,
Köhnə dükanını açırdı o dəm.



Harda ki durmuşdu, qazıb çapdılar,
Orda xəzinə var idi, tapdılar.

Xəznənin üstündə tutan kəs qərar,
Açsa ağız, xəznə edər aşikar.

Gənci-Nizami ki, qırar cadunu,
Sinəsinin saflığıdır, bil bunu.

## İYİRMİNCİ MƏQALƏ
## MÜASİRLƏRİN HƏYASIZLIĞI HAQQINDA

Əl çəkən aləmdə özündən bizik,
Torpaq əlində nə üçün acizik?!

Torpağa ülfət ki səni xar edir,
Torpaq əzəldən belə rəftar edir.

Hasilimiz ömr kimi təngdir,
Qafiləmiz həşrə qədər ləngdir.

Heyf bu bir cüt mələkə bəndimiz,
Bədnam edib divi də peyvəndimiz.

Odlu-yeriş hərzə, soyuq bir keyik,
Kül tək od ardınca soyuq bir şeyik.

Yox ürəyin nuru, var aludəlik,
Noldu o saf sinə, o asudəlik?!

O qaragün sübh gəlir dəmbədəm,
Ğaib edir sübhi-rəvan həm ələm.

Qaldı ağızda gülüşü ğəflətin,
Qalmadı canda həvəsi işrətin.

Torpağa bir sehr ilə tə'sir qıl,
Qurtar əlindən canı, tədbir qıl.

Qalx bu tordan ki, bu xunxarədir,
Huş ilə pərvaz eləmək çarədir.

Tülkü dişindən itidir qurd dişi,
Tülküyə bilmək edir asan işi.

Cəhd elə hər ləhzə vəfa ilə ol,
Olma özünlə ki, Xuda ilə ol.

Bir ürəyin torpağı ol, saf odur,
Səbzəsinin torpağı insaf odur.

Hər nə hünər ki ürəyin bəxş edər,
Tikmə vəfa tirməsinə nəqş edər.

Hansı vücud ki hünəri fərq olur,
Xoşlamasan gər, hünəri ğərq olur.

Xoşlasan, ayrı cür alır rəng bu,
Bir o qədər də verir o çeşmə su.

Kim ki tapır pərvəriş ehsan ilə,
Görsə hünər, bəslər onu can ilə.

Pak bu yer torpağın eylər hünər,
Yoxdu bu gün onda hünərdən əsər.

Onda ki bir yerdə hünər baş vurar,
Kimdə hünər yoxdur, ona daş vurar.

Ta ki, hünər sahibi gəlsin cana,
Ya hünəri düşsün onun nöqsana.

Görsə riyazətdə təmaşa deyər,
Fikrinə təşviş ilə sövda deyər.



Var isə, «sərxoş sözü» olmuş səxa,
Yoxsa, «ucuz bəndəlik» olmuş vəfa.

Gah səxavət olunur məsxərə,
Gah «üfunət» deyilir gövhərə.

Gah vəfa nəqşi vururlar buza,
Hərzə deyirlər Günəşə, ulduza.

Hansı nəfəs rahət üçün çarədir,
Bağrına bu tayifənin yarədir.

Dadsa əgər bir dodağın şəkkərin,
Əl uzadar civzəsinə Ülkərin.

Püxtə bir əncir olana həm müdam,
Sirkə satırlar xam üzüm tək təmam.

Kimdə hünər görməyə göz var dürüst?
Eyb gəzərlər hamı, amma ki süst!

Varı hamı dürr deyil ümmanın,
Təb'inə bəsdir bir hünər insanın.

Dəclə olur kor göz üçün bir gilə,
Mur çəyirtkə aparır mənzilə.

Gərçi şərəfdən beş-üçü dəm vurar,
Hər hünərə tə'nə dəmadəm vurar.

Gildə gilin gövhəri tək qarədir,
Canda canın ğüssəsi tək yarədir.

Gah dimağ üstə olur tüstü tək,
Gah çırağ üstə olur bir külək.

Kimlər olub gör cahanın sərvəri!
Kimlər olub namizədi, rəhbəri!

Bu iki-üç bədnam edir cəhd tək,
Sındıra bəlkə məni həm əhd tək.

Ay kimidir çərx ilə halım mənim,
Sınsa da var onda kəmalım mənim!

Cəhd necə olsa da biganədə,
Bu yolu vurmaz başa bu xanədə.

Ruh bağından təzə-tər hər sözü,
Nuh dananlar kimi görməz gözü.

Cəng elə, ey Xizr ələmi, həqq üçün!
Zikr elə, ey Nuh dəmi, həqq üçün!

Zülmlərindən ürək azad ola,
Onları yad etsə ürək, yad ola.

Pisliyini gör ki, nə əndazədir,
Susmağımı gör ki, nə avazədir!

Bir dür ilə mücrü salar qalmaqal,
Dolsa əgər qarnı, olar bəlkə lal.

Olsa yarım bir küp əgər cuş edər,
Dolsa mey ilə, onu xamuş edər.

**BÜLBÜL VƏ ŞAHIN DASTANI**

Bülbül, açan fəsl çəmənlər gülü,
Başladı bir şahin ilə ğülğülü:

«Sən necə susmaqla salıb vəlvələ,
Quşlar içindən topu uddun belə?

Ağzın açandan bəri səndən məgər,
Bir dəfə xoş söz eşidib bir nəfər?



Gəh sənə Səncər əli olmuş məqam,
Gəh sənə kəklik döşü olmuş təam.

Göz yumub-açınca ki mən hər nəfəs,
Ğeybdən hazir edirəm dürr bəs.

Ovladığım qurd-quş olubdur mənim,
Bağda tikanlar başıdır məskənim».

Söylədi şahin: – «Qulaq as, diqqət et,
Susmağı mən tək özünə adət et.

Bilməyim olmuşdur işi bir qədər,
Ki, yüz işimdən biri bilməz xəbər.

Get, səni məftun eləyib ruzigar,
Yox bir işin, min sözün amma ki var.

Qayə mənəm çünki, bu ovlaq yenə,
Şah əli, kəklik döşü vermiş mənə.

Sən ki, işin lağlağı olmuş təmam,
Qurd ye, tikan üstə otur, vəssəlam».

Xütbə Firidun adına olsa faş,
Təbl sədasına qoşar kimsə baş?!

Sübh, banından xoruzun açdı bəs,
Ki, bu gülüş məsxərədir bir nəfəs.

Çərx ki, fəryad o yerə yaddır,
Hansı baş o həlqədən azaddır?

Nəzminin avazını etmək bülənd,
Etdi Nizamini belə şəhrbənd.

## KİTABIN XƏTMİ HAQQINDA

Səbbəhəkəllah səbah, ey dəbir!
Düşdü əlimdən qələm, əl tut ki bir,

Çərx, edə gördükdə bu söz xirmənim,
Buqələmunluq qələmimdən mənim.

Sərf edib əlmas, qılıb iştiyaq,
Şahə düzəltdim balaca bir bıçaq.

Daşda qılınca dəmirim var idi,
Ağzı dəmirçi kürəmin dar idi.

Dövlət əgər olsa idi həmdəmim,
Ömrdə keçməzdi bu cür hər dəmim.

Fikr edirəm, bəlkə günah etmişəm,
Bunca vərəq mən ki siyah etmişəm.

Bu çadırın gərdəyi içrə nə var,
Bir neçə sübh içrə olub cilvəkar.

Əmlik ətindən ye, bu tüstü nədir!
Od vur o duzlanmış ətə, köhnədir!

Öndə get, ahəstəliyi vərdiş et,
Etsən əgər, diqqət ilə gərdiş et.

Hər söz əgər olsa ədəbdən kənar,
Eylə kənar, sənsən ona ixtiyar.

Çəkməsə həm şər'dən hərgah ələm,
Hərf mən olsam da, ona çək qələm.

Hər sözün öz haqqini mən vermişəm,
Ölkəbəölkə onu göndərmişəm.

Gər bu tərəfdə məni etmiş əsir,
Amma ki, ətrafdə olmuş əmir.



«Yer ki deyilsən – dedi dövran mənə,
Bağlı deyilsən yerə, tərpənsənə!»

Bikr sözüm tək edən həngamə yox,
Qaməti əndazəsinə camə yox.

Bir dizəcən nimtənəsi var hələ,
Yoxsa, oturmazdı diz üstə belə.

Qəddinə layiq ona paltar gərək,
Ta ayağa dursun ədəblə, görək.

Tutdu Nizami ki onu ziyvərə,
Tutdu ayaqdan-başadək gövhərə.

Cümlə nəzərdən, təzə ya köhnədir,
Hasilim avazədən özgə nədir!

Bunca bu həngamə ki var, yoxdu zər,
Qaldı bazar zəhməti, yoxdur digər.

Gəncə giribanıma vurmuş dügün,
Gənci-İraq yoxsa mənimdi bu gün.

Hayqırır: – «Ey bəndə! – cahan aşkara,
Gəncə hara, söylə, Nizami hara!»

Şahə bu gövhər ki saçır ziyvəri,
Söylə «mübarək!» ona bu gövhəri.

Şükr ki, yetdi bu kitab ünvana,
Ömr sona yetmədən əvvəl sona.

## ŞƏRHLƏR

B.1. Gənci-Həkim. Həkim: Qur'ani-Kərim. («Yasin» surəsinin 2-ci ayəsində Qur'an «Həkim» adlandırılır: «V-əl Qur'an-il həkim» – «Hikmətlə dolu Qur'ana and olsun ki»).

Digər tərəfdən, əgər «gənc» sözü ərəb dilində olan «kənz» məfhumunu ifadə edirsə, «Həkim» sözü də kinayə ilə «Allah» mənasını bəyan edir. Çünki, «kənz» – «fatihə» surəsinin on adından biridir və Qur'anda iki dəfə Xudavənd özünü «Həkim» adlandırır. Həmçinin, əgər «gənc» – ərəbcə «məxzən» sözünə müqabildirsə, «Həkim» sözündən məqsəd həkim Nizamidir ki, «Məxzən-ül əsrar» («Sirlər xəzinəsi») kitabını yazır və onu «Bismillah-ir rəhman-ir rəhim» ilə başlayır.

B.2. Qur'anın əvvəli ki, «Allah» sözüdür, yə'ni «Bismillah-ir rəhman-ir rəhim» ilədir, Allahın adı hər fikrin əvvəli və hər sözün axırıdır. Ey Nizami, sən də öz sözünü Allahın adı ilə bitir!

B.4. Köhnə cahan: əzəliyyət. Allah-təala əzəliyyətə görə qədimdir; yə'ni keçmiş zamanlarda Onun yox olan vaxtı olmayıb və gələcəkdə də heç zaman yox olmayacaqdır. Xaməyə gövhər peyvənd etmək – qələmin boynuna mirvari bağlamaq. Yə'ni Allah-təala Qələmin (lövhi-məhfuzu yazan Qələm nəzərdə tutulur) boynunu söz və kəlam boyunbağısı ilə ziynətləndirmişdir. (Qələm, həmçinin ilk yaradılmış vücudlardandır).

B.6. Allah-təala pərdəli fələkin pərdəsini açandır və pərdəli işləri bilənlərdən (ariflərdən) özünü pərdədə saxlayandır.

B.7. Allah-təala lə'l icad etmək qüdrətini Günəşin belində (sülbündə) qoymuşdur, torpağı güllər və səbzələrlə örtmüşdür, rəngsiz (şəffaf) sudan rəngarəng və əlvan güllər və qövsi-qüzeh xəlq etmişdir.

B.8. Allah-təala ruzidən əlavə alim və ariflərə elm və hikmət vermişdir və başqalarına lazımi ruzi ələ gətirmək üçün gündüzü qərar vermişdir. Bu məzmunda Qur'anda ayələr çoxdur. Bu beytə müvafiq olanları isə Qur'anın 78-ci (ən-Nəbə) surəsinin 11-ci ayəsi və 11-ci (Hud) surəsinin 6-cı ayəsidir ki, müvafiq olaraq onların məzmunu belədir: «Gündüzü isə dolanışıq [ruzi qazanmaq] vaxtı etdik». «Yer üzündə yaşayan elə bir canlı yoxdur ki, Allah onun ruzisini verməsin».

B.9. Allah-təala əqlin nəzirsiz telini qiymətli gövhərlə ziynətləndirmiş və əqlin gözünə nur bəxş etmişdir.



B.10. Allah-təala ibadət edən salihləri onların alınlarında olan ibadət nişanı ilə – öz məhəbbəti ilə dağlamışdır.

B.11. Əgər Allah-təala istəsə püxtə tədbirləri təsirsiz edər. İkinci misra Qur'anın 22-ci (Həcc) surəsinin 59-cu ayəsi və 58-ci (Mücadilə) surəsinin 3-cü ayəsinin məzmunudur. Bu ayələrdə deyilir: «Həqiqətən, Allah günahlardan keçən və bağışlayandır».

B.12. Vəhm edən – qorxan, zahid. Fəhm edən–tanıyan, arif. Allah-təala ğovğa günü (Qiyamət günü) Ondan qorxanların və Onu tanıyanların pənahıdır.

B.13. Allah-təala vücudda əzəli və həyatda əbədidir; yə'ni, qədimdir və mövcudatı vücuda gətirən və fani edəndir.

B.14. İki aləm Allah-təalanın cəlalı və əzəməti müqabilində heçdir, bizim əvvəlimiz və axırımız Allah-təalanın əzəməti ilə müqayisə məqamında bir nəfəsdir. («Əvvəlimiz-axırımız» deməkdən məqsəd insan ömrüdür).

B.15. «Limən-il mülk» – «Padşahlıq kimindir?!» Qur'anın 40-cı (Mö'min) surəsinin 16-cı ayəsindən iqtibas olunmuşdur. Qur'anda olduğu kimi, tərcümə olunmadan beytə daxil edilmişdir. Ayənin qısaca şərhi və məzmunu belədir: Qiyamət günü İsrafil mələk Allahın əmri ilə öz şeypurunu (Qur'anda ona Sur deyilir) çalar; o səsin dəhşətindən bütün insanlar və digər canlılar, eləcə də mələklər həlak olarlar. Sonra Allah-təala İsrafil və Əzrail mələklərə də əmr edər: «Ölün!» Onlar da ölər. Varlıq aləmində təkcə Allah qalar. O zaman Allah-təala nida edər: «Bu gün padşahlıq kimindir?!» Bu suala cavab vermək üçün bir nəfər tapılmaz. Onda Allah-təala özü bu sualın cavabını verər: «Qəhr edən yeganə Allahındır!»

B.17. Ən əzəli tə'lim alanlar – ənbiya və övliya. Bu beyt özündən sonra gələn beyt ilə əlaqədardır və ardınca gələn beyt – «bu söz»ün şərhidir.

B.18. Allah-təalanın elmi əzəli və mülkü əbədidir.

B.20. Canlı mövcudatın fəaliyyəti Allah-təalanın qüdrəti müqabilində bəndəlikdən başqa bir şey deyildir və eyni-ibadətdir.

B.21. Bu məzmunda olan ayələr çoxdur; o cümlədən Qur'anın 25-ci (Fürqan) surəsinin 60-cı ayəsində deyilir: «O, (yə'ni Allah) elə bir diridir ki, heç ölməz». Həmçinin, Qur'anın 28-ci (Qəsəs) surəsinin 88-ci ayəsində deyilir: «Onun (Allahın) zatından başqa, qalan bütün şeylər ölümə məhkumdur».

B.22. Soyuq atəş – həyadan üzün qızarması; isti su – göz yaşı. Allah-təala «göz yaşı» adlı isti suyu sənin gözlərində və «həya» adlı soyuq atəşi sənin yanaqlarında yaratmışdır.

B.23. Tərkib rövzəsi – bədən bağı; yə'ni, insanın cəsədi, ruhsuz bədən. Şairlər gözü nərgisə, üzü gülə, zülfü sünbülə, ağızı püstəyə, dodağı innaba, qaməti sərvə təşbih etmişlər ki, bunlar hamısı bağ ilə əlaqədar olan şeylərdir. Nizami bədən vəsfində son dərəcə gözəl təşbih işlədərək onu bağa bənzətmişdir ki, yuxarıdakı təşbihlərin hamısına şamildir. Hur–qara gözlü qadın. Kinayə kimi işlənmişdir və ruh nəzərdə tutulur. (Ruh–hur sözünün məqlub şəklidir).

B.24. Allah-təala sənə dağın dərinliyində mə'dənlər, torpağın üstündə otlar və heyvanat ətа etmişdir.

B.25. Nə qədər ki, Allah-təalanın kərəmi pərdədə idi və hələ insanı xəlq etməmişdi xar və gül, ney və şəkər biri digərindən fərq olunmurdu. Başqa sözlə, insan mövcudatın xeyrli və ya zərərli olduğunu bilәndən sonra onda təsəvvür yarandı ki, gül yaxşıdır, xar isə yamandır.

B.26. O, öz kərəmindən varlığı yoxdan xəlq etdi.

B.27-28. Bir–iki viranə kənd – yer üzü, yeddi iqlim. Gündüzün üzü–nura işarədir. Gecənin zülfü–zülmətə işarədir. Bu beytlərin məzmunu Qur'anın 21-ci (Ənbiya) surəsinin 30-cu ayəsindən iqtibas olunmuşdur: «Məgər kafir olanlar göylə yer bitişik ikən bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?!»

B.29. Allah-təala onda ki, fələk boyunbağısını qırıb səpələdi, yəni ulduzları səpələdi, gecəni ədəmdən çıxarıb aşkar etdi.

B.30. İki-üç çənbərə–fələk dairələri; yeddi dügün –yeddi asiman. (Şair yer kürəsini dügünə təşbih etmişdir).

B.33. Əbr ödü–buludun ödü; burada məqsəd dərya suyunun buxarıdır. Dəryaları buxarlandırıb dirilik suyuna bənzər saf bulaqları daşların dodağından rəvan etdi. Şərhi: yağış bir səfra mənziləsində buludu dəryanın ürəyindən qoparır və daşlardan həyat bəxş edən çeşmələr rəvan edir.

B.34. Səhər camı – Günəşə işarədir. Şəbrəng gil – qara torpağa işarədir. Günəşin şüalarını qara torpağa saçdı və Günəşin nurundan bir damla daşın ağzına saldı ki, bir lə'l vücuda gəlsin. Sənai deyir:

İllər gərəkdir ki, Günəşin [tə'sirindən] bir təbii daş

Ya Bədəxşanda lə'l olsun, ya Yəməndə əqiq olsun.

B.35. Su – yağış, od – Günəş şüalarına işarədir. Yə'ni, su ilə odu bir-birinə qarışdırıb, dəryanın bətnində ağ dürdanə və torpağın bətnində qırmızı yaqut yaratdı.

B.36. Böhran–xəstənin halının şiddətlə dəyişməsi. Torpaq qanı–suya işarədir.

B.37. Səfa bağını vücuda gətirib təravət verdi və söz quşunun avazını fələkə yetirdi.

B.38. Dil xurma ağacına, (nəxl) söz xurmaya, ikinci misrada isə söz dürrə, qulaq kinayə ilə sədəfə təşbih edilmişdir.

B.39. İkinci misra Qur'anın 21-ci (Ənbiya) surəsinin 30-cu ayəsinə işarədir: «Məgər kafir olanlar göylə yer bitişik ikən bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?!»

B.40. Zəmin türrəsi–Yerin konus şəklində olan kölgəsinə işarədir. (Yer kürrəvi olması səbəbindən kölgəsi konusvari olur). «Əsa» – asilik, əmrə itaət etməmək. Qur'anın 20-ci (Taha) surəsinin 121-ci ayəsinə işarədir: «Adəm Rəbbinin əmrindən çıxdı, amma mətləbinə yetmədi...».

B.41. Xarlıq və zilləti zərin üzündən yudu; Yə'ni qızılı əziz və qiymətli etdi.

B.42. Havanın cəngi–gecənin zülməti. Allah-təala gecənin zülmətini ulduzların vasitəsi ilə cəngdən təmizlədi və mehin (badi-səba) vasitəsi ilə reyhanlara ruh bəxş edib onları xəndan etdi.

B.43. Gilin cigəri–insanın cigəri. (insan torpaqdan yaradılmışdır).

B.44. Zöhrə–Nahid ulduzdur ki, onu fələkin mütribi adlandırırlar; nəğmə, rəqs və şadlıq ilahəsi hesab olunur.

B.45. Gecə–nafəyə təşbih edilmişdir. Gecə onun müşk satanı və hilal (təzə Ay) qulağı həlqəli ğulamıdır.

B.47. Söz ayağı–sözün qüdrət və imkanına işarədir. Əluzun olmaq–həddindən artıq hünərli olmaq. Beytin mə'nası: Söz bütün qüdrət və imkanına baxmayaraq Allah-təalanın əzəmət barigahının və ilahi hərəmxanəsinin keyfiyyətini bəyan etməyə acizdir.

B.48. Yol – nə qədər getsə də onun mahiyyətindən bir əsər görmədi. İkinci misra Qur'anın 6-cı (Ən'am) surəsinin 103-cü ayəsinə işarədir: «Gözlər onu [görüb] dərk etməz. O, gözləri dərk edər. O, lətifdir [cismlikdən uzaqdır] və hər şeydən xəbərdardır!»

B.49. Əql onun mahiyyətini (zatını) dərk etmək istədi. Bu ədəbsizliyinə görə onu (əqli) tənbeh etdim.

B.50. Pərgardan çıxan (vaqe' olan, vücuda gələn) «xət»-dir və burada mövcudata işarə olunur.

B.51. Sidrədə əyləşənlər və ərşdə gəzənlər – müqərrəb mələklər.

B.52. Fələk onun quludur və torpağın nəbzi onun şövqü ilə vurur.

B.53. Dərgahinin torpağı olmaq–xar, zəlil və heç olmağı izah etmək. Beytin mənası: Ürək ki, pak candır, yə'ni canın saf şirəsidir, Allah-təalanın dərgahı müqabilində özünün xar və zəlil olduğunu izhar edir. Burada ürək–əql və can–nəfs mə'nasında işlənmişdir.

B.54. İrəm–yaxud İrəmi-Zatul-İmad. Bu barədə Qur'ani-Kərimdə zikr olunur. Əsasən onu Şəddadın behişti bilmişlər və Ərəbistanın cənubunda yerləşdiyi xatırlanır. Deyirlər, elə ki, Şəddad Behişt haqqında eşidir, istəyir ki, bu dünyada bir behişt bağı saldırsın. Buna görə Ədəndə daşları qızıl və gümüşdən, divarları qiymətli daşlardan, cəvahiratdan bəzənmiş bir şəhər bina edir. Bina tikilib qurtardıqdan sonra onu görmək istəyir. Hud peyğəmbərin də'vətini qəbul etmədiyinə görə o bağa daxil olan vaxt ölür və həmin şəhər torpağın altında pünhan olur. (Deyilənə görə, imam Mehdi əleyhissəlamın zühuru zamanında bu şəhər aşkar olacaqdır).

Beytin mə'nası: Bütün nəbatat Allah-təalanın dərgahının əzəməti bərabərində bir danə (toxum) misalındadır və əgər İrəm bağını əhədiyyət bağının bir gülü ilə müqayisə etsək, İrəm əfsanədən başqa bir şey deyil və heç bir qiyməti yoxdur.

B.55. Şair özünü Allah-təalanın torpağı hesab edir (insanın torpaqdan yaranması e'tibarı ilə) ki, həmin torpaqda tovhid danəsi əkilmiş və kök atmışdır.

## BİRİNCİ MUNACAT

B.57. Kainat Sənin bayrağının altındadır; biz Səninlə qaimik, Sən isə öz zatınla qaimsən.

B.58. Sənin vücudunun şəkli və tərkibi (qarışığı) yoxdur və sənin bənzərin yoxdur. İkinci misra Qur'ani-Kərimin 42-ci (Şura) surəsinin 11-ci ayəsinə işarədir: «...Ona bənzər heç bir şey yoxdur...»

B.59-60. Allah-təala öz sifətləri ilə tanınır. Nizami bu beytlərdə Allah-təalanın «Həyy» (diri) və qədim olan sifətlərini vəsf edir.



B.61. Göy günbəz – asiman. İkinci misra Qur'ani-Kərimin 13-cü (Rə'd) surəsinin 2-ci ayəsinə işarədir: «Göyləri, gördüyünüz kimi, dayaqsız olaraq yüksəldən, sonra Ərşi yaradıb hökmü altına alan...». Həmçinin, Qurani-Kərimin 31-ci (Loğman) surəsinin 10-cu ayəsində deyilir: «Allah göyləri, gördüyünüz kimi dirəksiz yaratmış...»

B.62. Fələkin əyri dövranı – fələkin dairəvi hərəkəti. Cism–qazana, duz–cana təşbih edilmişdir. Nə qədər ki, ruh diri vücudun bədənində olur, bədəndə üfunət olmur. Duz da üfunətin qarşısını alan şeydir. Buna görə də canı duza təşbih etmişdir.

B.63. Əbləq–iki rəng, ala-bula: gecə və gündüzə işarədir. Qədəm ilə hay vurmaq–məcazi mə'nada, sür'ətlə çapmaq.

Ənəlhəq–Mənəm Allah. Beytin mə'nası: Sənin ayağın gecə-gündüzün əbləq [atına] hay vurduqda Qiyamət qopar və o gün Səndən başqa heç kəs Allahlıq iddiası edə bilməz.

B.64. Əgər taqət və səbat əta etməsəydi eşq Allahın adına təhəmmül edə bilməzdi; yə'ni bu əmrə təhəmmül edə bilməzdi.

B.65. Torpağın beli – məcazən, insan nəzərdə tutulur ki, insan torpaqdan yaranmışdır və torpaq üstündə yaşayır. Ağır yük–Qur'ani-Kərimin 33-cü (Əhzab) surəsinin 72-ci ayəsinə işarədir: «Biz əmanəti [Allaha itaət və ibadəti, şəri-hökmləri yerinə yetirməyi] göylərə, yerə və dağlara təklif etdik. Onlar onu götürməkdən qorxub çəkindilər. Çox zalim və çox cahil olan insan isə onu götürdü».

B.66. Göbəyin düşməsi–ağır yük götürdükdə, bir şeyə həddən artıq güc etdikdə, yaxud qorxudan baş verir. Beytin mə'nası: İnsan əmanət yükünü qəbul etdi, bu yük çox ağırdır və əgər Sənin kərəmin yerə şamil olmasaydı, yer ağır yük ilə hamilə olan insanın ağırlığına təhəmmül edə bilməzdi və göbəyi düşərdi.

B.67. Səcdə boyunbağısı–səcdə boynbağıya təşbih edilmişdir. Yə'ni, o səcdə (tə'zim, ibadət) bütün boyunların ziynəti və çəkdiyi yükdur və onu yerinə yetirmək hamının öhdəsində və boynundadır. Nizami burada Allahdan başqa şeylərə pərəstiş etməyin həram olması barəsində gələn ayələrin məzmununu nəzərdə tutmuşdur. Qur'ani-Kərimdə bu barədə ayələr çoxdur: o cümlədən, 4-cü (Nisa) surəsinin 59-cu, 11-ci (Hud) surəsinin 2-ci, 12-ci (Yusif) surəsinin 40-cı ayəsi bu məzmundadır. Bu ayələrdə deyilir: «Allahdan başqasına ibadət (pərəstiş) etməyin!» Əmr

tərzində olan bu xitab ayələri Allahdan başqasına sitayiş etməyi həram edir.

B.69. Saqi gecə–gecəni saqiyə təşbih etmişdir və sübhə işarədir. Yə'ni, gecənin saqisi Sənin sübh camının dilənçisidir. Sübh quşu–xoruz; Yə'ni sübh quşu Sənin adının aşiqidir.

B.70. Beytin mə'nası: Kəsrət pərdəsindən zahir ol və öz vəhdətini nişan ver.

B.71-72. Fələk və cahanın tərtib və nizam bağını (riştəsini) aç, zaman əlamətlərini batil et və ulduzların hərəkətini poz.

B.74. Zülmətilər–nura və zülmətə qail olanlar. (dualistlər).

B.75.Altıbucaq kürsü – Yer, altı cəhəti olduğuna görə altıbucaqlı kürsüyə təşbih edilmişdir. Doqquzayaq minbər–doqquz fələkə, asimana işarədir.

B.76. Ayın dairəvi daşını bu Yerin başına sal və Zöhrənin (fələkin mütribi adı ilə məşhurdur) camını Zühəlin (nəhs ulduzudur) daşına vur.

B.77. Gecəni gündüz edən gövhər (boyunbağı) – ulduzlar.

B.78. Yerdəki torpaq təpə və bir qəlib [torpaq] – insana işarədir. (insanın torpaqdan yaranması e'tibarı ilə).

B.79. Gecənin cəngi–gecənin qara rəngi. Əxbiyə – sə'd-ül Əxbiyə ulduzlarından biri (Ayın 25-ci mənzilidir). Cəbhə – dörd parlaq ulduzdan ibarətdir və ayın 10-cu mənzilidir.

B.82. Dörd ünsürün (ənasiri-ərbəə) tərtibi belədir: od yuxarıdadır və ondan aşağı havadır, sonra su və hamısından aşağıda torpaqdır. Beytin mə'nası: Dörd ünsürün təbii nizamını dağıt.

B.84. Hilal övcuündə olan dəstə – on iki bürcdən hər biri Hilal – Günəşdən nur alan hər bir səma cismi hilal şəklində görünə bilir. Pərdə – fələkə, xəyal – səmavi cismlərə işarədir.

B.88. Nurunu əqlin cana bəxş etmisən: Yə'ni, canın vücudu əql ilə rövşən olur. (can – nəfs mə'nasındadır). Baba Əfzəl deyir: «Nəfsin vücudu əql ilə rövşən olur. Əqli vücud bütün mərtəbələrdən artıq, şərafətli və davamiyyətlidir. Əqli vücud huşyarlıq və mə'rifət olur və nəfsani vücud mə'rifətlə rövşəndir». (Müsənnəfat, c.1, səh.29)

Zövqünü qəlbin dilə nəqş etmisən: Burada qəlb – əql mə'nasındadır. Misranın mə'nası: Əvvəlinci yaranan əqldir və axırıncı şey ki, əqldən onda zövq (dad) və nümunə qərar verilmişdir – sözdür. Baba Əfzəl deyir: «Əql nəfsin məbdə'idir (məbdə' – bir şeyin zahir və ya mövcud olduğu yer; mənşə', əsl, əsas), nəfsin məbdə'i isə maddi gövhərdir. Maddi gövhər cismin mayəsi və cism ünsürlərin mayəsidir, ünsürlər mürəkkəb cismlərin mayəsi və mürəkkəb cism vücuda gələn cismin mayəsidir. Vücudə gələn cismin mayəsi canlı cismin mayəsi və canlı cismin mayəsi dərk edən və danışan cismin mayəsidir». (Müsənnəfat, c.1, səh.29).



B.90. Sən bu bağa abi-həyat vermisən: Burada şair «bu bağ» deməklə insan vücudunu nəzərdə tutur. Şairlər bədən üzvlərinin hər birini bir bitkiyə – məsələn, qaməti sərvə və şümşadə, üzü – gül və laləyə, zülfü – sünbülə, dodağı innaba və s. təşbih etmşlər. Nizami burada təşbihi küll şəklində edir və «bağ» deyir ki, bütün bitkilər, meyvələr və güllər bu «bağ»ın içində vardır. Şair bu təşbihi «tərkib rövzəsi» kimi də işlətmişdir. (B.23).

B.91. Beytin mə'nası: Nəsrinin ğəmzəsi badi-səbadən deyildir; bəlkə, Sənin asitanın torpağını öz gözünə tutiya etmişdir ki, ğəmzəsi belə cadulu və cazibəli olmuşdur.

## İKİNCİ MÜNACAT

B.97. Biz dünyanın cah-cəlalına arxa çevirən evsiz-eşiksiz sərsərilərik və Sənin qulağı həlqəli qullarınıq.

B.102. Bizim boynumuzda qümri kimi Sənə bəndəlik nişanı olan həlqə vardır və biz Sənin bəndəlik nişanın ilə dağlanmış itlərinik.

B.103. Nizami özünə xitab edərək deyir: Ey Nizami, Allahın vəsfində mə'nalı və xoş sözlər bəyan etdin, bəlağət və fəsahətlə hünər göstərdin. Amma, bilməlisən ki, bu bəlağət və fəsahət Allahın tə'rifində çox naçiz və gərəksiz bir şeydir. Çünki, Allahı ən yaxşı sözlərlə tə,rif etsən də, etməsən də peşiman olacaqsan. Əgər tə'rif etsən, elə bir tə'rif ki, Allaha layiq olsun, edə bilməyəcəksən. Əgər tərif etməsən, öz sakit oturub qalmağından peşiman olacaqsan. (Burada Xacə Ədbüllah Ənsarinin dediyi söz yada düşür: «Danışmaq bir şəkərdir ki, xalis zəhərdir və susmaq bir zəhərdir ki, xalis şəkərdir»).

B.104. Qəlb – burada əql və təfəkkür mə'nasında işlənmişdir. Beytin mə'nası: Təfəkkürün o yüksəkliyə pərvaz etmək qüdrəti yoxdur. Mən hara, Allahın əzəmətinə tə'zim hara?! Başqa sözlə, təfəkkür Allahın vəsfində acizdir. Necə ki, mərhum Şeyx Sə'di deyir.

Nə vəhm quşu onun zatı fövqünə pərvaz edə bilər,
Nə fəhm əli Onun vəsfi ətəyinə yetə bilər.

B.105. Nə ürək – yə'ni, hansı cür'ət; bəhr – dərya, Allahın vəsfinə işarədir.

B.106. Sifətində – yə'ni, Sənin tə'rifində. «Mən ərəfəllah» – «Allahı tanıyanın dili süst olar» – hədisinə işarədir.

B.113. Əl açmaq – dua etmək, yalvarmaq. Beytin mə'nası: Əfv olunmağımız üçün başqalarından artıq biz əlimizi Sənin qarşında açmışıq və hamıdan artıq biz nalə edib ağlayırıq. (Əfv olunması üçün şiddətli ehtiyacını Allah-təalaya bildirir).

## RƏSULİ-ƏKRƏMİN (S) NƏ'Tİ

B.117. İlk lövhə – lövhi-məhfuz, kainatın ilk dəfə Allahın Qələmi ilə həyat və inkişaf məramnaməsi yazılan lövhə. Əhməd – Rəsuli-Əkrəmin (s) adlarından biridir. Əhməd qapısı – nur pərdəsində gizli olan Əhməd. Rəsuli-Əkrəmin (s) mübarək vücudu bütün peyğəmbərlərin axırıncısı olduğu üçün bütün peyğəmbərlərdən axırda məb'us olmuşdu: «Yaranışda peyğəmbərlərin əvvəlincisiyəm, məb'us olmaqda axırıncısıyam» – hədisi və digər – «Allahın ilk yaratdığı [şey] mənim nurumdur» – hədisi buna şahiddir.

Əhməd qapısı – burada qapı «Əhməd» sözünün əvvəlindəki «əlif» hərfinə işarədir və eyhamla «dərgah» (padşah sarayı) mə'nasını da ifadə edir. Beytin mə'nası: «Əlif» lövhi-məhfuzda nəqş olunan vaxt Rəsuli-Əkrəmin (s) adı olan «Əhməd» sözünün əvvəlində qərar tutdu.

B.118. Həlqəli «ha» – «Əhməd» adının ikinci hərfinə işarədir. İqlim vermək – hökumət və imarət (əmirlik) vermək. Tövq – fərman həlqəsi, xidmətçilərin boynunda gərdənbənd hökmündə olan fərman. «Dal» – «Əhməd» adının axırında olan hərf. Kəmər – kəmərbənd, belbağı. (tövq və kəmər əmirlik nişanələrindən idi). Beytin mə'nası: Söz, «Əhməd» adını təşkil edən hərflərdən gedir. Bundan əvvəlki beytdə mə'lum oldu ki, «əlif» qapıda dayanan və yuxarıda (başda) oturandır. Bu beytdə deyir: «Əlif» ki «Əhməd» sözünün əmiri və başda oturanıdır, «ha» ilə vilayət (əmirlik) və səltənət vermişdir, «dal» ilə tövq və «mim» ilə kəmər bəxş etmişdir. («dal» hərfinin tövqə və «mim» hərfinin kəmərə bənzər olması şairin nəzərində olmuşdur).



B.121. Turunc ağacının eyni vaxtda üstündə çiçəyi və meyvəsi olur. Bu mə'nada ki, onun bu ilinin meyvəsi gələn ilin baharına qədər ağacda qalır və ağacın üstündə meyvəsi olduğu halda yenidən çiçək açır.

B.122. «Kuntu nəbiyyən» – «Mən peyğəmbər idim, Adəm isə hələ su ilə palçıq [arasında] idi» – hədisinə işarədir.

B.123. Qədimlər Ayın yaşıl rəngdə olduğu fikrində idilər. Zəbərcəd – yaşıl rəngdə olan qiymətli daşlardan biridir. Məhəmməd-nişan - Rəsuli-Əkrəmin (s) çiynində nişan var idi ki, onun peyğəmbərliyindən bir əlamət hesab edirdilər. Beytin mə'nası: Ay üzüyü ki, asimanın zəbərcəd rəngli üzüyüdür, Rəsuli-Əkrəmin (s) nübüvvət möhründən nişan verir.

B.124. Aləm qulağı – cahan əhlinin qulağı. Yə'ni cahan əhli Rəsuli-Əkrəmin (s) fərmanına tabedir və öz qulağında ona itaət həlqəsini gəzdirir. Aləm «Məhəmməd»in «mim»inin həlqəsini sırğa kimi öz qulağından asmışdır. Burada «mim» hərfinin «aləm» sözünün axırında qərar tutmasına eyham vardır.

B.125. Xacə – ağa, böyük. Məsh xacəsi – çox məsh edən. Məsh etmək – dəstəmaz suyundan nəm olan əli başa və ayaqlara çəkməkdir ki, islam dilində hökm olunan nəmazdan ötrü vacibdir. Həzrəti – Rəsuli-Əkrəm (s) məsh xacəsi (çox məsh edən xacə) adlandırılmışdır.

Məsiha onun ğulamıdır və ondan tərbiyə almışdır. O – yə'ni, Məsiha pəyambər (xəbər gətirən) və bu – yə'ni, Məhəmməd (s) pəyam verəndir (xəbər verən, müjdə verəndir). Burada Qur-ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 119-cu ayəsinə işarə olunur: «[Ya Məhəmməd!] Biz səni [mö'minlərə] haqq ilə [Qur'anla] müjdə verməyə və [kafirləri] qorxutmağa göndərdik...»

Pəyambər - xəbər gətirən; burada müjdə verəndən xəbər gətirən mə'nasındadır. Zahirən, Qur-ani-Kərimin 61-ci (Səff) surəsinin 6-cı ayəsinə işarədir: «Onu da xatırla ki, bir vaxt Məryəm oğlu İsa belə demişdi: «Ey İsrail oğulları! Həqiqətən mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir peyğəmbərlə [sizə] müjdə verən Allahın elçisiyəm!..»

Beytin mə'nası: Bir ağadır ki, beş növbət nəmaz onun dininə məxsusdur və bir böyükdür ki, Allah onu «müjdə verən» – deyə yad etmişdir və həzrəti-İsa (ə) onun peyğəmbərliyindən adı (Əhməd) ilə müjdə vermişdir.

B.126. Ümmi – dərs oxumayan və yazıb-oxumaq bilməyən kəs. Zahirən – «Mən ərəbin ən fəsahətlisifəm» hədisinə işarədir. Beytin mə'nası: O, elə bir yazıb-oxumaq bilməyən kəs idi ki, Adəmdən İsaya qədər, yə'ni bütün peyğəmbərlərdən rövşən və fəsahətlə danışardı.

B.127. «Əlif» tək – «əlif» hərfi şaquli düz xətt şəklində yazılır; düzlük və doğruçuluq nişanəsidir. Əvvəl, axır - peyğəmbərlərin əvvəlincisi və axırıncısı. Peyğəmbərlərin əvvəlincisi olmasına – «Mən peyğəmbər idim, Adəm isə hələ ruh və cəsəd [arasında] idi» – hədisi dəlildir. Peyğəmbərlərin axırıncısı olmasına – «Əlinin məndən nisbəti Harunun Musaya (ə) olan nisbəti mənziləsindədir; amma fərq burasındadır ki, məndən sonra peyğəmbər gəlməyəcəkdir» - hədisi dəlilidir. (Kənz-ül ə'mal, c.2, səh 103).

Yuxarıda qeyd olunan mə'nalardan əlavə, Nizami «ənbiya» sözünün zahiri şəklini də nəzərdə tutmuşdur. Çünki, fars əlifbası ilə yazıldıqda «ənbiya» sözünün əvvəlinci və axırıncı hərfi «əlif» şəklindədir. Onda, beytin mə'nası belə olacaqdır: Əhd və vəfada «əlif» kimi düzsən və necə ki, «əlif» «ənbiya» kəlməsinin əvvəlində və axırında qərar tutmuşdur, sən də peyğəmbərlərin əvvəlincisi və axırıncısısan.

B.128. Pərgarın nöqtəsi – dairənin mərkəzi. «Ol!» pərgarı - «ol!» pərgara təşbih edilmişdir. «Ol!» – zahirən Qur'anın 36-cı (Yasin) surəsinin 82-ci ayəsindən iqtibas olunmuşdur. Ayədə deyilir: «Bir şeyi [yaratmaq] istədyi zaman Allahın buyuruğu ona ancaq: «Ol!» – deməkdir. O da dərhal olar».

Sözlərin ən pərgarı – sözlərin ən doğrusu və dürüstü.

B.129. Baş çəkib... – Yə'ni dünya ilə məğrur olmadı və dünya (maddi) işlərində dünyaya itaət etmədi.

B.130. Avazə – nəğmə; əndazə – miqdar.

B.131. İsmətlilər – mələklər, peyğəmbərlər və mə'sumlar. İsmət – nəfsi aludə olmaqdan qorumaq, mə'sumluq. Pərdə - hərəm; burada islam məzhəbi nəzərdə tutulur.

B.133. İkinci misradakı «fitnə olanlar» – məftun olanlar mənasındadır və «fitnə» sözü beytdə cinas kimi işlənmişdir.

B.135. Cavid ağırqütb – ağır və vüqarlı. Yünülseyr – tez ötüb keçən; Rəsuli–Əkrəmin (s) bu aləmdə ömrünün qısa olmasına işarədir.

B.136. Şəm'i–ilahi – ilahi mə'rifət nuru. Qur'ani–Kərimin 39-cu (Zümər) surəsinin 22-ci ayəsinə işarədir: «Məgər Allahın



köksünü [qəlbini] islam dini üçün açmaqla Rəbbindən nur üzərində olan kəs [qəlbi möhürlənmiş kimsə kimi ola bilərmi?!]»...

B.137. Günəş öz nurunu Məhəmməd əleyhissəlamın nurundan alır («Allahın ilk yaratdığı [şey] mənim nurumdur») və me'rac gecəsi elə parlaq və nurani idi ki, Günəş çeşməsi onunla müqayisədə sınıq hilal kimi görünürdü.

B.138. Təxtə oturdu – yə'ni, Ərş məqamına yetdi. Beytin mə'nası: Kəmər və tac sahibləri onun vasitəsilə və onun şəriətinə itaət etmək səbəbindən qüdrət tapdılar.

B.139. Şəbahəng – gecə yol gedən. Nizami «Xosrov və Şirin» məsnəvisində Rəsuli–Əkrəmin (s) mərkəbini, (minik) yə'ni Büraqı «nur» kimi vəsf edir:

Cəbrail Beytül-mə'murdan gəlib,
Nurdan [yaranmış] ildırım sür'ətli bir Buraq gətirdi.

Beytin mə'nası: Allah–təalaya hədsiz məhəbbətdən və Onun didarının (görüşünün) sonsuz şövqündən pərişan və ğəmgin olmuşdu. Ürəyinin açılması üçün əzmi–me'rac etdi və gecə yol gedən ağ atı səfər üçün hazir etdi.

B.140. Sübh süvariləri – mələklər və ulduzlara işarədir. Əbləq - ala-bula at; sübh vaxtı, zaman, gecə və gündüzə işarədir.

B.141. Çul çəkmək – böyük, rütbəli kəslərin minik heyvanlarının çulunu (yəhər örtüyünü) daşıyan xüsusi nökərlər olardı. Burada Nizami özünü çiynində çul daşıyan nökərə təşbih etmişdir.

## ME'RAC HAQQINDA

Me'rac – Rəsuli-Əkrəmin (s) asimana qalxmasıdır ki, o Cənabın mö'cüzələrindən biri hesab olunur.

B.142. Günüz sərvəri – Günəş; Həzrəti-Rəsuli-Əkrəmin (s) vücuduna işarədir. Nur saçan gövhər – Peyğəmbər Cənablarının vücuduna işarədir. Beytin mə'nası: Rəsuli-Əkrəm (s) gecə yarısı öz Günəşə bənzər vücudunu me'rac qəsdi ilə rəvan etdi.

B.143. Fələklər gözü – ulduzlar. Rəvan təxt–kəcavə. Məş'əl – padşahların və əmirlərin, gecə vaxtı hərəkət etdikdə və dayandıqda kəcavəsinin qabağında tutardılar.

B.144. Yətim dürr – Nizami Rəsuli-Əkrəmi (s) ona görə «yətim dürr» adlandırır ki, o Cənab hələ anadan olmamış atasını,

altı yaşında olanda isə anasını itirib yətim qalmışdı. «Dürr» adı verməyinin digər səbəbi odur ki, sədəfin içində incilərin sayı çox olduqca, onlar xırda olurlar. Bə'zən sədəfin içində tək bircə dənə inci olur; belə hallarda o tək inci çox iri və qiymətli olur, tək olduğu üçün ona «yətim dürr» deyirlər. Nizami Məhəmməd peyğəmbəri (s) yətimlik, paklıq və saflıq cəhətindən «yətim dürr» adlandırır.

Sədəf – dünya, aləm nəzərdə tutulur.

B.147. Oldu bu tordan qəfəs ilə rəvan – yə'ni bu dünyadan bədəni ilə yola düşdü. Can quşu – ruha işarədir. Həzrəti – Rəsuli-Əkrəmin (s) cismi və ruhu birlikdə me'raca gedirdi.

B.148. Qanad tökmək – şadlıq etməyə işarədir. Xirqə cırıb-sökmək – şadlıq etməyə işarədir.

B.149. Rəsuli-Əkrəmin (s) cismi və ruhu hər ikisi bahəm Allahın hüzuruna gedirdi. Qəlb–ruh, qəlib–bədənə işarədir.

B.150. Mil–yerin açıq və düz səthində göz ilə görünən məsafə. Təbərrük–bərəkət tapmaq, tovfiq. Yetdi təbərrük ona hər mil ilə–hərəkət sür'ətini təsvir edir. Beytin mə'nası: Hələ bir mil məsafə teyy etməmiş ikinci mil bərəkət tapmaq üçün onu birinci mildən alıb aparırdı. Başqa sözlə, sür'ətlə millər bir-birini əvəz edirdi və o, yüksəklərə qalxırdı.

B.151. Hər iki aləm – maddi aləm və mə'nəvi aləm. Beytin mə'nası: Hər iki aləmin məxluqu Rəsuli-Əkrəmi (s) görməyə möhtac idi. İndi ki, yuxarı qalxırdı, mələkut aləminin sakinləri onun camalını görmək, tə'zim və ehtiram etmək üçün baş əyirdilər.

B.152. Yetdi ayağə başı tə'zim ilə – yə'ni başını tə'zim və ehtiram üçün irəli tutub aşağı əydi.

B.153. Rəxş – at, Büraq. Hündür - axur Rəxş – atın hündür və yaraşıqlı olmasına işarədir.

B.154. Bəhrü zəmin – dərya və yer. Yə'ni, dərya və yer gövhər mə'dəni mənziləsində idi və Rəsuli-Əkrəm (s) bu mə'dənin mislsiz bir dürdanəsi idi və o qədər əziz və qiymətli idi ki, fələk öz başının tacına qoymaq üçün yerdən asimana apardı.

B.155. Gecə gövhəri – şəbçırağ, gecəni işıqlandıran gövhər. Qiymətli bir gövhərdir ki, gecə nur saçır. Rəvayətə görə, dəryada olan bir öküzdədir ki, gecələr dəryadan çıxıb otlamaq istədikdə bu gövhəri ağzından çıxarıb yerə qoyur və onun işığında otladıqdan sonra yenə ağzına qoyur və dəryaya gedir. Adamlar pusquda durub, hiylə ilə o gövhəri ələ keçirirlər.



Çərx öküzü – sur bürcü, on iki bürcün ikincisi. Yer öküzü – yuxarıda bəhs etdiyimiz öküzdür.

B.156. Sərətan – on iki bürcün dördüncüsüdür və o, xərçəng şəklindədir. On üç ulduzdan ibarətdir ki, doqquzu onun daxilində və dördü xaricindədir. Daxildə olan ulduzları taca təşbih etmişlər. Cövza – Əkizlər; on iki bürcün üçüncüsüdür ki, arxa-arxaya dayanmış əkiz uşaqlara bənzəyir. İnsan bədəninə oxşayan bu bürcün kəmərində bir düz xətt üzrə Nizam, Nitaq və Mintəqə adlı üç parlaq ulduz yerləşir. Nitaq – öz lüğəti mə'nasına görə «kəmər» deməkdir. Odur ki, Nizami bu beytdə «kəmər» deməklə həmin ulduzları nəzərdə tutur.

B.157. Xuşə – Sünbülə bürcü; on iki bürcün altıncısıdır. Əlində sünbül (başaq) tutmuş bir qız şəklindədir.

Xuşə ki, ondan tər idi sünbülü – yə'ni. Sünbülə bürcü ondan xoş ətr almışdı. Əsəd – Şir bürcü; on iki bürcün beşincisidir ki, şir şəklindədir.

B.158. Birinci misrada «qədər» və «qədr» sözləri «Qədr» gecəsi münasibətilə işlənmişdir. (Peyğəmbərin me'racı Qədr gecəsində vaqe' olmuşdur).

Zöhrə–Zöhrə səyyarəsi üfüqdən çox yuxarılara qalxmır. O, ya səhər – şərqdə, ya da axşam – qərbdə üfüqdən müxtəlif hündürlükdə olur, amma heç vaxt zenitdə olmur. Şərq üfüqündə o, səhərə yaxın görünməyə başlayır və gecənin qurtardığını bildirir. Buna görə də el arasında ona «Dan ulduzu» deyirlər.

Beləliklə, Zöhrə gecənin ölçüsünü xəbər verən, onu guya «tərəzidə çəkən» bir səma cismidir. Odur ki, Nizami onu «Gecəni çəkən» adlandırıb bildirir ki, Me'rac gecəsi Zöhrə Mizan (Tərəzi) bürcündə imiş; guya o, bu gecənin dəyərini bilmək üçün onu həmin tərəzidə çəkirmiş.

B.159. Süsənbər – nanəyə bənzər bir bitkidir ki, xoş ətrli yarpaqları ağ-qırmızımtıl gülləri və reyhan toxumu kimi toxumları vardır; əqrəb sancmış adamın yarasına qoyurlar. Neştər – əqrəb, arı və s. sancan heyvanların zəhərli ə'zası. Nuş – padzəhr, zəhərə qarşı işlədilən dərman. Əqrəb – on iki bürcdən səkkizincisidir ki, əqrəb şəklindədir. Beytin mə'nası: Öz süsənbər nəfəsindən fələk əqrəbinin neştərinə (quyruğuna) padzəhr töküb, onu zərərsiz və tə'sirsiz etdi.

B.160. Kəman – Qövs (Oxatan); on iki bürcün doqquzuncusudur ki, kəman və ox şəklindədir. Oğlaq – Dağ keçisi (Cədy) bürcü; on iki bürcdən onuncusudur.

Oğlaq zəhəri – Xeybərdə vaqe' olan bir əhvalata – yəhudi Harisin qızı Zeynəbin Məhəmməd əleyhissəlamı zəhərləməsinə işarədir: Harisin qızı Zeynəb bir çəpişi büryan edib soruşdu ki, Məhəmməd qoyunun (keçinin) hansı üzvünü daha çox xoşlayır. Dedilər ki, qol hissəsini. Zeynəb çəpişi tamam zəhərlədi və qol hissəsini götürüb peyğəmbərin qarşısına gəldi və dedi: Ya Rəsulillah, bilirəm ki, sən və dostların necə yorğun və acsınız. Sənə və sənə yaxın olanların adına təam hazırlamışam. Peyğəmbər əleyhissəlam təklifi qəbul etdi və öz yaxın adamlarından bir dəstə ilə onun evinə daxil oldu. Zeynəb tamam zəhər içində olan çəpişi Rəsuli-Əkrəmin (s) qabağına qoydu. Peyğəmbər əleyhissəlam əlini uzadıb bir tikə ondan ağzına qoydu. Büryan çəpiş aydın dil ilə Rəsulillaha dil açıb dedi: «Məni yemə, mən zəhərliyəm!» Peyğəmbər əleyhissəlam ağzına qoyduğu tikəni uddu və zəhər o Cənabın əziz bədəninə yayıldı. Allah-təala ona rəhmətlə bir nəzər etdi, o zəhəri onun bədənində tərə döndərdi və onun bədənindən xaric etdi ki, asanlıqla keçib getdi.

B.161. Yusif – Yə'qub peyğəmbərin oğludur və anasının adı Rahildir. Atası Yusifi çox istədiyindən qardaşları ona həsəd edirdilər. Gənc yaşlarında onu çölə apardılar və quyuya saldılar. Yoldan keçən karvanın adamları onu quyudan çıxarıb Misrə apardılar və orada satdılar. Yusif bir müddət xeyli məşəqqət çəkdikdən sonra Misr məmləkətinin hökmdarı (əzizi) məqamına yetdi.

Dəlv – Dolça bürcü; on iki bürcdən on birincisidir. Əlində dolçaya bənzər zərf tutmuş adama bənzəyir. Günəş Dəlv bürcünə daxil olan vaxt ona «Dəlv Yusifi» deyirlər.

Yunis – Bəni-İsrail peyğəmbərlərindən biridir. Mətta (ləqəbi Zunnundur) onun atasıdır. Yunis öz xalqının ona verdiyi əziyyətdən xilas olmaq üçün gəmiyə minib qaçmaq istədi. Lakin gəmidə adam çox və dəniz dalğalı olduğu üçün, gəminin ğərq olmaq təhlükəsi vardı. Gəmiçi bir nəfərin suya atılması ilə qalanlarını xilas etmək təklifini edəndə püşk atdılar. Püşk Yunisə düşdü; onu dənizə atdılar. Bir balıq (zahirən, delfin) onu udub, öz qarnında diri saxladı. Bir müddət (mənbələrdə bu müddət 40 gün, 3 ay və 6 ay göstərilir) dənizlərdə gəzdirdikdən sonra bir gün onu sağ-salamat halda sahilə çıxardı.



Balıq – Balıq (Hut) bürcü; on iki bürcün on ikincisidir. Bir-birinə kəndirlə bağlanmış iki balıq şəklindədir.

B.162. Quzu – Quzu (Həməl) bürcü; on iki bürcün birincisidir. Günəş Quzu bürcünə daxil olanda bahar fəsli başlayır.

Ülkər – Quzu (Həməl) bürcünün üstündə yerləşən topa halında olan ulduzlardan ibarətdir. Bə'zi astronomlar onu Buğa bürcünə daxil edirlər, bə'ziləri isə ona müstəqil bürc kimi baxırlar. Bu bürcə yeddi ulduz daxildir; onların hamısı xırda ulduzlardır, lakin onlar topa halında olduğundan parlaq və çox da gözəl görünürlər. Ərəblər ona Sürəyya, farslar Pərvin, türklər və azərbaycanlılar Ülkər, ya da «Yeddi qardaş» deyirlər. (qədimlərin əqidəsinə görə Ülkər ulduzlarının sayı altı olmuşdur).

Nizami be beytdə Ülkəri təxtə təşbih etmişdir. Bu və bundan yuxarıdakı beytin mə'nası: Rəsuli-Əkrəm (s) Günəş kimi «Dəlv Yusifi» oldu, yə'ni Dəlvə daxil oldu, sonra Yunis kimi Huta daxil oldu. Başqa sözlə, necə ki, Günəş Dəlv bürcünə daxil olur, sonra Hut bürcünə gedir və oradan Quzu bürcünə yetişir və bahar fəsli başlanır, Rəsuli-Əkrəm (s) də bu yolu teyy etdi və Ülkərdə təxt qurdu, bahar fəsli başladı və fələkdə mə'nəvi bahar peyda etdi.

Nizami Rəsuli-Əkrəmi (s) dəfələrlə Günəş adlandırmış və Günəşə təşbih etmişdir. «Leyli və Məcnun»da deyir:

Qalx gəl, yatmaq vaxtı deyildir,
Ay, sən Günəşin intizarındadır.

Günəş bir il müddətində öz hərəkəti ilə on iki bürcün hamısından keçir və ən xoş mövqe'i Quzu bürcündədir ki, (qədim təqvimlə bahar başlanır) «gül ləşgəri çöldə çadır qurur». Bu cəhətdən Nizami me'racda, o Həzrətin on iki bürcü seyr etməsindən və Quzuya (Həmələ) yetişməsindən söz deyir və Me'racın bahar fəslində vaqe' olmasını xatırladır.

B.165. «Ma zağ» – Qur'ani-Kərimin 53-cü (Nəcm) surəsinin 17-ci ayəsinə işarədir: «Göz nə [sağa-sola] yayındı, nə də uzağa getdi [hər şeyi olduğu kimi gördu]».

B.166. On dua – Qur'ani-Kərimdən on ayə. Qədim qarilərdə (Qur'an oxuyanlarda) qayda idi ki, hər gün öz şagirdlərinə on ayə tə'lim edərdilər. Zahirən, «Allahım məni ədəbləndirdi» hədisinə işarədir.

Etdi təvazö'lər ona ənbiya – peyğəmbərlərin ruhları o Həzrətin tə'zim və istiqbalına gəlmişdilər. Rəsuli-Əkrəm (s) hər biri ilə mülaqat etdi və hər birinə dua etdi; peyğəmbərlər bir-birilərinin günahlarının bağışlanmasını istədilər.

B.168. Gecə – nafəyə, Ay isə nala təşbih edilmişdir.

B.169. Buraq – Rəsuli-Əkrəmin (s) me'rac etdiyi gecə süvar olub asimana qalxdığı miniyin adı. Bərq ayağıyla – yə'ni ildırım sür'əti ilə.

B.170. Fərri-Hümay – Hümay xoşbəxtlik, böyüklük, dövlət və alicənablıq rəmzi olan bir quşdur. Bu qüş kimin başına otursa, o adam şahlığa, dövlətə və səadətə yetişər.

B.172. Sidrə – yeddinci asimanda olan bir ağacdır. Beytin mə'nası: Sidrənin [sinəsi] onun köynəyi olmuşdu; yə'ni Sidrə onu qucağına almışdı və Ərş onun qucağında qərar tutmuşdu.

B.175. Pərdə tutanlar– dərgaha müqərrəb olan mələklər.

B.179. Canın sərvəri – Rəsuli-Əkrəm (s). Beytin mə'nası: Nə qədər ki, o Həzrətin canında nəfəs vardı, yolu bədənlə gedirdi.

B.180-181. Hər şeydən mücərrəd oldu, can və ürək hər ikisi məqsuda yetdilər.

B.182. Əsl evi – bədənin əsl evi cismdir və bədən – varlığı göstərən «yox»dur.

Göz elə gördü, görə bilməz xəyal – göz, xəyalın vaqe' ola biləcəyi yerdir; başqa sözlə, göz bə'zən elə şeylər görür ki, xəyaldan başqa bir şey deyildir (məsələn, yuxuda gördüyümüz sürətlər, yaxud güzgüdə gördüyümüz şəkillər). Nizami deyir: Rəsuli-Əkrəmin (s) gözləri Me'rac gecəsində xəyalı olmayan göz olmuşdu. Yə'ni, hər nə ki, görürdü həqiqət idi və ardınca gələn beyt də bu beytin mə'nasını tamamlayır. Nizami deyir: Əgər Rəsuli-Əkrəmin (s) gözlərinin vəsfində desəm ki, xəyalın ona yolu yox idi, təəccüblü deyil; çünki, əzəli nuru olan bir göz xəyalata təslim olmaz!

B.184. Çıxdı təbiət yaxasından başı – yə'ni, təbiət aləmindən xaric oldu və mavərai (təbiət xaricində olan) aləmə tərəf yol başladı.

B.186. Ğeyrət – dünyəvi əlaqələrdən ayrılmaq tələbində mühibbin sə'yinə məhbubun nəzəri; yaxud, məhbubdan ğeyri hər şeydən əlaqəni kəsmək. (ğeyrət – məhəbbətdə zəruridir).

Heyrət – təfəkkür və hüzur vaxtı ariflərin ürəklərinə varid olan əmrdir ki, onların təəmmül və təfəkkürünə pərdə tutur.



B.189. Onda ki, tamamilə özündən mücərrəd oldu, həmin ləhzə öz səlamının cavabını Xudavəndi-aləmdən eşitdi ki, səlamın cavabı bu idi: «Ey Peyğəmbər, sənə səlam, Allahın rəhməti və bərəkəti olsun!» Sonra Peyğəmbər əleyhissəlam buyurur: «Səlam olsun bizə və Allahın salih bəndələrinə».

B.190-191. Vüsal əli Allah-təalanın əzəmət sarayının qapısından pərdəni atdı; hərəkət və seyr başa çatdı və ruh tamaşa etməyə başladı.

B.192. Xəyal afətindən pak olan bir göz ilə zəvalı olmayan ilahi nuru gördü.

B.193-195. Mütləq – mətlubun kamalıdır və Peyğəmbəri-Əkrəm (s) də Allahı mütləq şəkildə gördü. Bəli, Allah görüləndir. Mövcudatın ərəzsiz və cövhərsiz görülməsi mümkün deyildir; amma, Allahın görülməsi ərəzsiz və cövhərsizdir və O, ərəz və cövhərin xaliqidir. Gözləri kor olanlar Allahın görülən olduğunu demirlər və qəbul etmirlər. Deməli lazımdır ki, O gözlərdən gizli deyildir. (Şərhi: Qur'ani-Kərimin 6-cı (Ən'am) surəsinin 103-cü ayəsində deyilir: «Gözlər Onu [görüb] dərk etməz. O, gözləri dərk edər. O, lətifdir [cismlikdən uzaqdır] və hər şeydən xəbərdardır!»).

B.197. Mey – Allahın rəhmətinə işarədir. Onda ki, Rəsuli-Əkrəm həqq şərabından xoşhal oldu, ondan bir damla bizim üçün tökdü, yə'ni bizim əfv və bağışlanmağımızı istədi.

Şərab içənlər arasında qayda idi: – O məclisdə ki, dostları iştirak etmirdilər, içdikləri şərabdan bir udum yerə tökərdilər ki, bu həmin şəxsləri yada salmaq əlaməti idi.

B.208. Ey sözü ilə bizi xamuş edən – yə'ni, sənin sözünə e'tiraz və irad yoxdur; çünki, sənin sözün Allah-təalanın sözü mənziləsindədir.

## RƏSULİ-ƏKRƏMİN (S) BİRİNCİ NƏ'Tİ

B.210. Yeddi-sitarə çadırın əfsəri – yə'ni, yeddi fələkin tacı. Tac – müxtəlif filizlərdən Günəş şəklində düzəldib, böyük sarayların başında bərkidərdilər.

Xatəm - üzük; yə'ni, əgər peyğəmbərləri bir üzüyə təşbih etsək, Həzrəti – Rəsuli-Əkrəm (s) o üzüyün qaşı mənziləsində olar. Üzüyün qiyməti onun qaşı ilə olur və qaş üzüyün mühüm hissəsidir. Xatəm - həmçinin, möhrü olan üzük və sonuncu peyğəmbər olmaqla peyğəmbərliyin möhrüdür.

B.211. Tapqır – yəhərin qabaq və arxa hissəsində şey bağlamaq üçün qayışlar.

B.213. Sünbülü –yə'ni, zülfü. Sünbülə –Sünbülə bürcü, 26 ulduzdan ibarətdir. Gövhəri – yə'ni, zatı. Beytin mə'nası: Onun zülfü gündüzə nur saçan bir Sünbülədir və onun vücudu ki, həqqin günəşidir, Günəş lə'l ilə bəzəyəndir. Yə'ni Günəş öz nurunu və lə'l düzəltmək qabiliyyətini Məhəmməd əleyhissəlamın pak nurundan almışdır.

B.214. Dodaqlarında, dişlərini göstərən təbəssüm ona görə görünməz ki, sədəfin (hal və məhəll etibarilə məcazən mirvari mə'nasındadır) saflığına nöqsan yetirib, onu xəcalətli etməsin; başqa sözlə, onun dişləri mirvaridən saf və parlaq idi.

B.215. Gövhəri sındırmadı daş tək sədəf – yə'ni, onun dişləri sədəf daşını (mirvari) xəcil etmədi.

Daş nesin o gövhəri etdi hədəf?! – Ühud döyüşünə işarədir ki, onda o Cənabın mübarək dişini daş ilə sındırmışdılar.

B.216. Bağrı daş idi – yə'ni, daşın bağrı daş idi.

Sövda – insan bədənində olan dörd ünsürdən (qan, səfra, bəlğəm, sövda) biri; soyuq və quru xasiyyətə malikdir. Qədimdə bu əqidədə idilər ki, əgər dörd ünsür bir-birinə nisbətdə mötədil olsa, insan salamət olar. Əgər bu ünsürlərdən biri artsa insan xəstələnər, əgər bu hal davam etsə, ölümlə nəticələnər. Necə ki, mərhum Şeyx Sə'di deyir:

Bir-birinə müxalif olan dörd təbiət
Bir-biri ilə bir neçə gün xoş olurlar.
Bü dördün biri ğalib gəlsə,
Şirin can qəlibdən (bədəndən) çıxar.

Bu beytdə Nizami daşın bu xoşagəlməz işi görməsi səbəbini bəyan edir və deyir: Elə ki, bu sövda daşın ürəyində artdı, müalicə üçün müfərrih ardınca getdi. Müfərrih düzəltmək üçün lə'l və dürr sındırıb əzmək və bir-biri ilə qarışdırmaq lazımdır. Daş da öz ürəyinə müalicə etmək üçün o Cənabın lə'l dodağını və dürr dişini sındırıb əzdi və bunlardan müfərrih düzəldib öz xəstəliyini müalicə etmək üçün istifadə etdi. (şərhi: müfərrih bə'zi xəstəliklərin, o cümlədən təngnəfəslik, ürək sıxılması, ğəmginlik müalicəsində işlədilirdi).



B.217. Beytin mə'nası: Əgər o daşın müfərrihə ehtiyacı olmasaydı, dürr kimi dişi sındırmazdı və lə'l kimi dodağı zədələməzdi.

B.219. Rəsuli-Əkrəm (s) lə'l, cəvahir mücrüsünə bənzər kiçik ağızından dişini çıxartdı. Əgər daşdan (burada, atılan daşa eyham vardır) dürr çıxsa, təəccüblü deyildir. Qədimlər bu fikirdə idilər ki, zaman keçdikcə Günəş şüalarının tə'sirindən daşların içində qiymətli daşlar vücuda gəlir.

B.220. Sim-gümüş; ağ dişlərə işrədir. Diyət – qanbahası.

B.221-222. Qanbəha – min qızıl dinar, yaxud on min gümüş dirhəm idi. Ömər ibn Xəttabın dövründə diyət on iki min gümüş dirhəm idi. Beytin mə'nası: Daş guya qanbahasını gümüş ilə vermək istədi və gəlib o Həzrətin mübarək dişini və dodağını zədələdi. Nizami əvvəlcə təxmin (güman) edir ki, o Cənabın dişinin və dodağının zədələnməsinin diyəti torpaqda olan mə'dənlərdən Qiyamətə qədər hasil ola biləcək gümüşə bərabərdir; sonra qətiyyətlə deyir ki, daşlardan hasil olan bütün gövhərlər onun dişinin və dodağının diyəti olmağa kifayət deyildir.

B.223. Fəth, onun dişinin diyəti olmaq üçün can atırdı və can ilə, (yə'ni, səmimi-qəlbdən) düşmənin dişini çəkib çıxarmaq üçün can atırdı.

B.224. Ühud döyüşündə qələbədən sonra o Cənab aldığı yaranı yuyub təmizlədi və qanından bir qətrə də torpağa düşməyə qoymadı. Sonra buyurdu: «Bilirsiniz sizinlə nə edəcəyəm?» Onlar hamısı başlarını aşağı salıb, qorxudan əsməyə başladılar; güman etdilər ki, hamısını öldürəcək. Rəsuli-Əkrəm (s) yenə həmin sözü təkrar etdi və üçüncü dəfə də təkrar etdi. Bu vaxt bir qoca başını qaldırıb dedi: «Kərim və kərimzadəsən, kərim və kərimzadədən kərəmdən başqa bir şey zahir olmaz». Sonra Peyğəmbər əleyhissəlam dedi: «Sizinlə, Yusifi-siddiq öz qardaşları ilə etdiyi kimi edəcəyəm». Bu sözləri dedi və ağladı. Sonra buyurdu: «Mənə hər nə etdinizsə, hamısını bağışlayıram».

B.225. Dişini ağzından çıxartdı və Allaha şükr etdi.

B.226. Onun hər iki dünya süfrəsində olan ne'mətlərə diş vurmaq arzusu yox idi.

B.229-230. Bu hamı nəydi? – yə'ni bu qədər zəhmət nədən ötrü idi? Ona görə idi ki, onun kərəmini görəydilər. Çünki, o Cənabı yaralayandan sonra dua etdi və bu – kəramətin ən yüksək zirvəsi

idi. Yuxarıdakı beytlərdən birində buna işarə olunur; «Oldu kəramət adı ondan təmam».

Riştə dolu möhrə, demə mardən! – möhrə iki növ olur: bir növ'ü zəbərcəd mə'dənlərində olur və o, zəbərcəd rəngində, qaramtıl və kül rəngində olur. İkinci növ'ü isə bə'zi əf'ilərin baş hissəsində olur ki, əf'ini öldürüb götürdükdə əvvəlcə yumşaq olur, sonra tədricən daşlaşır. (Bu ilan möhrəsi padzəhr xasiyyətinə malikdir).

Nizami Rəsuli-Əkrəmin (s) dişinin sınması və dodağının yaralanmasını bəyan etməkdən məlul və ğəmgin olaraq deyir: Xar söz-söhbətini qurtar, o Həzrətin gülündən, yə'ni şadlıq bəxş edən və gözəl sifətlərindən söhbət et. Sən ki, öz sözünün riştəsini həyat bəxş edən möhrələr ilə, yə'ni o Cənabın nə'ti ilə ziynətləndirmisən, ilan söz-söhbətini tərk et.

## RƏSULİ-ƏKRƏMİN (S) İKİNCİ NƏ'Tİ

B.232. Candan da pak – yə'ni, ruhdan da pak. «Ruhi fidak!» – «Ruhum sənə fəda olsun!» Beytin mə'nası: Ey bədəni ruhdan (bizim ruhumuzdan) pak olan kəs! Ruha sən pərvəriş vermisən, mənim ruhum sənə fəda olsun! Rəsuli-Əkrəmin bədəni ruhdan daha pakdır. Bu mə'nada «Şərəfnamə»də deyir:

Onun bizim canımızdan saf olan vücudu
Bir ləhzəyə [oraya] gedib qayıdıbsa, rəvadır.

Bədrəddin Hilali deyir:

Canın sənin vücudunla əsla nisbəti yoxdur,
Sənin pak canın, pak candan yüz dəfə pakdır.

B.233. Nöqtə – dairənin mərkəzi. Zahirən, Qur'ani-Kərimin 21-ci (Ənbiya) surəsinin 107-ci ayəsinə işarədir: «Səni də [ya Məhəmməd!] aləmlərə [bütün insanlara və cinlərə] ancaq bir rəhmət olaraq göndərdik...»

Fars əlifbası ilə «zəhmət» və «rəhmət» sözləri bir nöqtə fərqi ilə eyni şəkildə yazılır: «Zəhmət» sözündəki «Z» hərfinin üstündə olan nöqtəni götürdükdə «rəhmət» oxunur. Yə'ni, sən zəhməti rəhmət ilə əvəz edənsən.



B.234. Sübhdəmin yolçusu – sübh vaxtı oyaq və razü niyaz ilə məşğul olan saliklər (ibadət edənlər). Yə'ni sən sübh vaxtı yoi gedənlərin yolunu işıqlandıran Ay, yolunu azmışlara isə yol göstərən şahsan.

B.235. Sənlə düşüblər yola – yə'ni, sən insanların doğru yola düşməsinə səbəbsən. Zahirən, Qur'ani-Kərimin 28-ci (Qəsəs) surəsinin 56-cı ayəsinə işarədir: «[Ya Məhəmməd!] Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma, Allah dilədiyini doğru yola salar...»

Kətxuda – rəhbər, sərvər. Kənd – dünya, aləm. Kənddə deyilsən – Rəsuli-Əkrəmin (s) rehlətinə (dünyadan getməsinə) işarədir.

B.236-238. Bu beytlərdə Rəsuli-Əkrəmin (s) Me'rac əhvalatına işarə olunur ki, həmin gecə o Cənab Allah-təala ilə mülaqat edir və öz ümmətinin bağışlanmasını tələb edir.

B.242. İkinci misrada «nafə» sözlərinin biri müşk, digəri isə göbək mə'nasında işlənmişdir. Nafə–Həcər-ül əsvədə (Kə'bədə olan qara daş) işarədir. Yer nafəsi – Yerin göbəyi; Kə'bəyə işarədir. Beytin mə'nası: Dünya əhli günah içində idi, sənin islam dinini dünyaya gətirməyin vasitəsilə günahlardan təmizləndi və Kə'bə Həcər-ül əsvədi səndən aldı. Peyğəmbər əleyhissəlam Məkkə şəhərində dünyaya gəlib, orada da peyğəmbərliyə məb'us olmuşdur. Nizami «Yer nafəsi» deməklə Məkkə şəhərini nəzərdə tutur. Digər tərəfdən, Kə'bə binasını yenidən bərpa etdiyi vaxt həcər-ül əsvədin o Cənabın mübarək əli ilə orada yerləşdirilməsinə işarə edir.

B.243. Sənin torpağın (qəbrin) olan məmləkətə sənin torpağından müşk ətri yayılır.

B.245. Təkbir – «Əllahu Əkbər» demək. Səccadə – nəmaz qılınan yer, üstündə nəmaz qılınan fərş. Təbaşir – Qamışın bir növ'ündən hasil olunan dərmandır və qədim təbabətdə təşnəliyin qarşısını almaq üçün işlədilərdi. Burada, Rəsuli-Əkrəmin (s) mübarək cəmalına işarədir. Beytin mə'nası: Kə'bə ki, sənin səcdə, nəmaz və ibadət qıldığın yer idi, sənin fərağında ğəmgindir və sənin cəmalını ziyarət etməyə təşnədir.

B.246. Dünya sənin təxt və tacınla hamilədir. Sənin təxtin – yə'ni, zəmin; sənin tacın – yə'ni, asiman.

B.247. Peyğəmbər əleyhissəlamın kölgəsi olmaması bəhsində təfsir və tə'birlər çoxdur. Deyirlər, o Həzrətin vücudu nur idi və bu cəhətdən kölgəsi yox idi; çünki, nurun kölgəsi olmur.

Həmçinin, deyirlər ki, o Cənab yer üzündə Allahın kölgəsi idi və bu cəhətdən kölgəsi yox idi; çünki, kölgənin kölgəsi olmur. Onun nübuvvət əlamətlərindən olan xəbərlərdə deyilir ki, başının üstündə bulud kölgə salırdı; vücudunun lətafətindən yerə kölgə düşmürdü. O Cənab Günəş idi – «Allaha tərəf də'vət edəndir və nurlu çıraqdır» – və Günəşin kölgəsi olmur.

Qur'ani-Kərimdə Xudavəndi-aləm o Cənabı «on dörd gecəlik Ay», «ulduz», «Günəş» və «nur» adlandırmışdır. Bu səbəbdən Nizami o Həzrəti bu beytdə Aya və digər məsnəvilərində Günəşə və nura təşbih etmişdir. «Yeddi gözəl»də deyir:

Onun kölgəsinin üzü ağ idi,
Bu nə sözdür – kölgə olan yerdə günəş?

Cami deyir:
Sənin vücudunun kölgəsi yoxdur, həqiqətən belə layiqdir,
Çünki, sənin pak cövhərin həqq nurundandır.

B.248. Dörd ələm – dörd məzhəbin (şafei, hənbəli, hənəfi, maliki) başçıları. Böyük şahların saraylarının qabağında gün ərzində üç-beş, yaxud yeddi növbət təbl döyülərdi ki, bu sultanlıq rəmzlərindən idi. Beytin mə'nası: Dörd məzhəbin başçıları sənin səltənət təxtinin dörd sütunu və beş növbət qılınan namaz sənin beş növbət döyülən təblindir.

B.250-251. Sən o zülfü dağılmış (qaranlıq) gecədə ayağını fələkin başına qoyanda fələkin qucağı dürr və zər ilə doldu və köynəyinin qoltuğu – yə'ni, Ay zərrin-zolaq oldu.

B.252. Səba sübh sədəfindən vəfa əli ilə (səmimanə) sənin ğaliyə ətrini saçırdı. Sübhü sədəfə təşbih etmişdir və nəticədə Günəş gövhərə təşbih olunmuşdur. Sədəfin xarici qara, daxili isə ağdır və Günəş gövhərinin məkanı sübh sədəfinin daxilindədir. (ğaliyə hazırlayanlar adətən ğaliyəni sədəf qabığında hazırlayırdılar).

Ğaliyə – müşk, ənbər və s. qarışığından alınan xoş ətrli maddədir ki, onunla saçı rəngləyirlər.

B.253. Hansı tərəfə ki, səba sənin ətrinlə üz tutdu, ənbər naçar aciz qaldı və öz bayrağını atdı; yə'ni, sənin ətrin ənbərin ətrindən daha xoşdur və ənbərin bazarını kasad edir.

B.254. Ənbərinə vermə ucuz dəm belə – yə'ni zülfünün ətrini səba yelinə ucuz vermə ki, iki aləm də ona dəyməz.



B.255. Sidrə – yeddinci asimanda bir ağacdır. Sidrə, fərş kimi sənin hüzurunu (eyvanını) ziynətləndirən bir haşiyədir, Ərş isə sənin eyvanına kürsü qoyan bir xidmətçidir.

B.256. Ruhun bacası – Rəsuli-Əkrəmin (s) vücudunun günəşinə işarədir. (Allaha tərəf də'vət edəndir və nurlu çıraqdır). Beytin mə'nası: Sənin vücudunun günəşi bərabərində Ərş bir zərrədir ki, o Günəş onu cəzb edər və özünə tərəf çəkər.

B.257. Sübhün əlində tutduğu ayinə – Günəşdir; yə'ni, əgər sənin vücudunun Günəşi tülu' etməsəydi, sənin nurun torpaq üstünə necə düşə bilərdi?

B.258. İki aləm – Rəsuli-Əkrəmə işarədir; torpaq qəfəs – qəbr. Xəznə deyilsən niyə torpaqda bəs? – yə'ni, yəqin bilirəm ki, xəzinəsən və həmin səbəbdən torpaq altında gizlədilmisən.

B.259. Nə qədər ki, sən bu torpaqda qərar tutursan (Qiyamət gününə qədər) xəzinəni torpaqda saxlamaq zəruri olacaqdır. Yə'ni, xəzinəni torpağa tapşıracaqlar və o ki xəzinə deyil, torpağa tapşırılmayacaqdır.

B.260. Fəqr – Rəsuli-Əkrəmin (s) buyurduğuna işarədir: «Fəqr mənim fəxrimdir və mən onunla iftixar edirəm». Bəs – bəsdir, kifayətdir. Şəm' – Günəş; Rəsuli-Əkrəmin (s) vücuduna işarədir. Pərvanə olmaq – yanmaq. Nizami «Xosrov və Şirin» əsərində «pərvanə etmək» ifadəsini «yanmaq» mə'nasında işlətmişdir:

Elə ki, gecənin mişkin tellərinə daraq çəkdilər,
Gündüzün çırağını pərvanə etdilər.

Beytin mə'nası: Nizami bundan əvvəl bəyan etdi ki, o Cənabın vücudu xəzinədir və bu səbəbdən torpaqda qoyulmuşdur. Yadına düşür ki, xəzinəni viranədə basdırırlar, buna görə də sözünə davam edərək deyir: Sənin xəzinənin viranəsi sənin fəqrindir; yə'ni, vücudun bir xəzinədir ki, fəqrinin viranəsində qərar tutmuşdur və vücudunun Günəşinin yandırdığı fəqət sayəndir. Yə'ni sənin sayən olmamasının səbəbi budur ki, sənin sayəni vücudunun günəşi yandırıb yox etmişdir (nur olan yerdə kölgə olmur). Həmçinin «bəs» sözündən məqsəd odur ki, nur təkcə sənin kölgəni yandırıb yox etdi, ondan başqa bir şey yandırmadı və hər şeyə hidayət nuru bəxş edib təravət verdi.

B.261. Quyu – Yerə işarədir. Quyunun kəndiri – Yerin on iki burcdən keçərək hərəkət etdiyi dairə. Çənbər – dairə xətti. Dol – Dolça bürcü.

Nizami «İskəndərnamə» məsnəvisində «torpaq» sözünü «Yer» mə'nasında işlətmişdir:

> Əgər Yusifin ayı quyudan çıxdısa,
> Bu çeşmə torpaqdan Aya qədər rəvan oldu.

Beytin mə'nası: O Həzrətin əzəmət və qüdrətini təsvir edərək deyir: Fələk sənin yolunun üstündə olan kiçik bir qum təpəsidir. Çünki, sənin səfərin fələkdən o tərəfə idi və yer sənin üçün quyu kimi və yerin hərəkət etdiyi dairə sənin quyunun kəndiridir.

Beytdə «quyu», «kəndir», «çənbər» və «dol» sözləri müra'atün-nəzir kimi işlənmişdir. Yerin (torpağın) quyuya təşbih olunmasından iki mə'na nəzərə çarpır: Əvvəlinci odur ki, ruhlar yuxarı aləmdən gəlib və bu quyuda bədən məhbəsində qalmışlar. İkincisi isə odur ki, suyun buxarı Günəşin hərarətinin tə'sirindən yuxarı qalxaraq asimanda donur və sonra yağışa, qara və şehə çevrilir. Burada, Nizami ikinci mə'nanı nəzərdə tutur.

Xülasə odur ki, bütün bunlar sənin xatirinə xəlq olunmuşdur. – «Əgər sən olmasaydın, fələkləri xəlq etməzdim» – (hədisi-qüdsi) bu müddəaya dəlildir.

B.262. İki hakim – Ay və Günəş. Qara-ağ – gecə və gündüzə işarədir.

B.264. Qalx – yə'ni, tülu'et və intizarında olanların qaranlıq gecəsini işıqlı gündüzə döndər və Nizaminin şe'r demək istedadını şənləndirib şadlıq bəxş edən et.

## RƏSULİ-ƏKRƏMİN (S) ÜÇÜNCÜ NƏ'Tİ

B.265. Mədəni – Mədinəyə mənsub. Mədəni pərdəli – Mədinə örtüklü. Mədinə niqablı. Məkki – Məkkəyə mənsub, Məkkə niqablı. Peyğəmbər Cənabları məkkəlidir və niqabı da Məkkə əhlinin niqabı kimidir. «Mədinə örtüklü» deməklə Nizami Rəsuli-Əkrəmin (s) Mədinə şəhərində dəfn olunmasını nəzərdə tutmuşdur.

Beytin mə'nası: Ey bəyənilib seçilmiş, sənin örtüyün Məkkə əhlinin örtüyü kimidir və Mədinə torpağında üzünü torpaq niqabı altına çəkib gizlətmisən. Sən Günəşsən, Günəş nə qədər kölgədə qalar?!



B.266. Əgər Aysan, həqq günəşinin nurundan bizə cilvələndir; (Ay öz nurunu Günəşdən alır) əgər gülsən, əhədiyyət (yeganəlik – Allahın sifəti) bağından bizim üçün ətr gətir.

B.268. Kürən – gündüzü kürən (sarı rəngli) ata təşbih etmişdir. Şəbrəng – gecə rəngli; gecəni qara rəngli ata təşbih etmişdir.

B.270. Sən fərman ver, qoy sikkəni sənin adına vursunlar (sikkə böyük şahların adına vurulardı) və şahlar öz acizliyinə iqrar etsinlər. Sən buyur ki, qoy xütbəni sənin adına oxusunlar (xütbə böyük xəlifənin adına oxunardı) ki, xəlifələr öz adlarına xütbə oxunmasından imtina etsinlər və xar olsunlar.

B.271. Vilayət – canişinlik məqamı (Peyğəmbərdən sonra hökmranlıq məqamı); islam məmləkəti, islam hökuməti. Bad – külək. Nifaq – ikiüzlülük. Badi-nifaq – nifaq küləyə təşbih olunmuşdur. Beytin mə'nası: Sənin türbətin (qəbrin) islam məmləkətinə ətr bəxş etdi; amma ixtilaf o xoş ətri islam məmləkətindən apardı.

Burada Fədiri-Xümm əhvalatına işarə vardır ki, Rəsuli-Əkrəm (s) Əli əleyhissəlamı öz canişini (vəli) tə'yin etdi, amma o Cənab vəfat etdikdən sonra münafiqlər xilafəti qəsb etdilər.

B.274. Bu çirkin fəsad əhlinin muzdunu kəs ki, qarınqulu, israfkar və talançıdırlar. Sənin onlara tapşırıb getdiyin mülkü geri al.

B.276. Qəlb – ordunun mərkəzidir ki, fərman verən və qoşunun əsas hissəsi orada yerləşir və adətən bayraq ordunun mərkəzində olur. Burada Nizami «yəğma» deməklə Bağdad şəhərini nəzərdə tutur ki, o dövrdə Əbbasilər xilafətinin mərkəzi idi.

B.277. Dini düşmənlərdən mühafizə etmək üçün pusquda durmuşlar; halbuki, özləri dini daxildən qara günə qoyublar və fəsada aparırlar.

B.278. Xəbərlərdə varid olmuşdur ki, şeytan Ömərdən qorxurdu və onun keçdiyi yerdən şeytan üç gün keçməzdi.

B.279. İbn Əsir, Əli əleyhissəlamın dilindən nəql edir: «Qara gözləri var idi, xoş və nüfuzedici; yumşaq saçları və gözəl rüxsarı vardı». Yəməni mah – gözəl üzə işarədir. Yəməni cübbə – yəməni kətan parçadan hazırlanmış cübbə.

B.280. Zülm əlində giriftar olan bir dəstə məzluma qüdrət bəxş et və bir ovuc münafiqi (nifaq əhlini) xar et.

B.281. Bu beytdən mə'lum olur ki, «Məxzənül-əsrar» («Sirlər xəzinəsi») Rəsuli-Əkrəmin (s) vəfatından 550 il sonra qələmə alınmışdır.

B.282. İsrafil – Allaha müqərrəb mələklərdən biridir və rəvayətə görə Qiyamət günündə çalacağı şeypur (Sur) ilə ölüləri qərbdən qaldırmağa mə'murdur. İki-üç qəndil – Günəş, Ay və asimanda olan ulduzlara işarədir. Qəndil – Günəş, yunancadır (kəndil) və çıraq mə'nasındadır.

Beytin mə'nası: Qalx və buyur ki, İsrafil bu iki-üç çırağı püfləyib söndürsün və Qiyamət başlansın. İsrafil iki dəfə öz şeypurunu çalacaqdır. Əvvəlcə çalanda bütün məxluqlar ölüb məhv olacaqlar, ikinci dəfə çalanda isə bütün ölülər dirilib ayağa qalxacaqlar.

B.283. Sən qeyb sirlərinə məhrəm ol, biz isə ölək. (İsrafilin şeypuru birinci dəfə çalması nəzərdə tutulur).

B.287-289. Barmağın ilə dairə çək və Allahdan istə ki, bütün müəyyən etdiyin şeyləri sənə bəxş etsin; Yə'ni, sənin tələbinə Allahın bəxşişi yəqindir. Təkcə zəhmətin bu olacaqdır ki, barmağının işarəsi ilə öz istədiyini müəyyən edib ayıracaqsan. sən öz cəmalından pərdəni götür və özünü nişan ver; ta ki, iki aləm sənə aşiqi-şeyda olub öz varlıqlarından əl çəksinlər.

B.290-291. Nizami səni sorağ etdikcə sənin xoş ətrinlə ürəyi şadlıq edir. Sən öz nəfəsindən ona səmimiyyət ətri bəxş etsən, bu inayət Firidun məmləkətini bir fəqirə bağışlamağa bərabər olar. Başqa sözlə, Nizamiyə inayət və mehribanlıq göstər.

## RƏSULİ-ƏKRƏMİN (S) DÖRDÜNCÜ NƏ'Tİ

B.292-293. Ey peyğəmbərlər tacının parlaq dürrü! Sən pakizələr dürrünə (pakizələr – dürrə təşbih olunmuşdur) tac bağışlayansan. Bu aləmdə sənin məzhəbinə itaət edənlər də, etməyənlər də sənin süfrənin qonaqlarıdır.

B.294. Beyt – şe'rin iki misrası. Beytin əvvəli – binanın əsası, binanın bünyadı. Qafiyə – beytin (şe'rin) misralarının axırında vaqe' olan, bəzi hərf və hərəkələri bütün şe'r boyu eynilə təkrar olunan müxtəlif mə'nalı sözlərin məcmuudur.

Beytin mə'nası: Zahirən, hədisi-qüdsiyə işarədir: «Əgər sən olmasaydın, fələkləri xəlq etməzdim». Nizami deyir: Varlığın əsasını sənin xatirinə yaratdı və sənin vücudun digər peyğəmbərlərdən əvvəl xəlq olundu, amma peyğəmbərliyin beytin axırında gələn qafiyə kimi hamıdan axırda qərar tutdu.

B.295-296. İşarət – Allahın fərmanına işarədir. İmarət – abadlıq. Beytin mə'nası: Binanın əsasını əvvəlinci kərpiclə başlayırlar və axırıncı kərpiclə başa çatdırırlar. Yə'ni, dünyanın abadlığı Adəmin vasitəsi ilə başladı və sənin vasitənlə kamala yetdi.

B.297. Sən Adəm ilə Nuhun iki bağ (iki sap) boyunbağısında bir dügünsən və bu boyunbağını sən onların boynuna bağlamısan (boyunbağıya düğün vurulmasa boyundan asmaq olmaz) və burada Rəsuli-Əkrəmin (s) şəriətinin hamı peyğəmbərlərin şəriətindən kamil olmasına eyham vardır.

B.298. Gülşəkər – qızıl gülün şəkər, yaxud bal ilə qarışığından hazırlanır ki, qədimdə mə'də pozğunluğu və ürək narahatlığını müalicə üçün işlənərdi. Beytin mə'nası: Adəm Behiştdə buğda yedi və bu təam onun üçün həzm edə bilmədiyindən münasib olmadı və Behiştdən xaric olunmasına səbəb oldu. Bundan sonra tövbə etdi və gülşəkər mə'də pozğunluğuna şəfa gətirən olduğu kimi, Həzrəti – Adəmin tövbəsi onun üçün gülşəkər tə'sirində oldu.

B.299. Sənin ətrin Adəmin tövbə etməsinə səbəb oldu, sənin qapının torpağı Adəm üçün gülşəkər oldu. Yə'ni, o həzrətin nuru peyğəmbərlərdən əvvəl mövcud idi və həmin nur müşkülləri açan idi.

B.300. Onda ki, ürək xəstəlikdən (günahdan) xilas olmaq üçün tövbəni intixab etdi və gülşəkərə ehtiyacı olmadı, gülşəkər dərman olmaqdan əl çəkdi; çünki, tövbənin əsərini öz tə'sirindən güclü gördü.

B.301. «Qəbul» – məqbul, bəyənilmiş; qəbul – topa təşbih edilmişdir. Ürək – müsabiqə meydanında topu vurmaq üçün hazır durmuş çovgan oynayana təşbih olunmuşdur və bu müsabiqədə bir neçə ürək iştirak etdiyinə görə şair «bir səf» ifadəsini işlətməklə onların çoxluğunu nişan verir. Beytin mə'nası: Məqbuliyyəti top şəklində hazir etdilər və ürək meydanında müsabiqəyə qoydular ki, bu topu hansı ürəyin aparması mə'lum olsun.

B.302-303. Hamıdan əvvəl Adəm topu ələ keçirmək istədi, amma onun atı (nəfsi) xuşəyə (buğda nəzərdə tutulur ki, Adəm onu yediyinə görə Behiştdən xaric olunmuşdu) meyl etdiyindən topu atdı və müsabiqədən kənar qaldı.

B.304. Dəstərxan – süfrə; burada ürəklərin müsabiqə meydanına işarədir. Çeşmə – burada şair «qəbul» topunu nəzərdə tutmuşdur. Tufan – Nuhun tufanı. Nuh öz ümmətini lə'nətləyib dua edir ki: «Ey Rəbbim! Yer üzündə bir nəfər belə kafir qoyma!» (Qur'ani-Kərmin 71-ci (Nuh) surəsi, 26-cı ayə). Beytin mə'nası: Nuh «qəbul» topunu aparmağı çox arzu edirdi. Onda ki, müsabiqə meydanına yetdi, «qəbul» topunu aparmağı arzuladı.

Amma, öz ümmətinə bəd dua etdiyinə görə onun ürəyi məqbuliyyət ləyaqətini əldən verdi və etdiyi duanın tə'siri ilə ümmətinin aqibəti tufan ilə əncam tapdı. Başqa sözlə, Nuh da Allahdan tufan (yə'ni, öz qövmünün məhv olmasını) istədi.

B.305. Yolda rəvan təxti neçə yol salıb-yə'ni, bu yolda bir neçə dəfə səhv və xəta edib ki, bu xətalar ibarətdir: Onda ki mağaradan bayıra çıxdı, ulduzları gördü, sonra Ayı gördü, sonra isə tülu' etmiş Günəşi gördü, dedi: – «Bu Allahdır». Bayram günündə bütləri sındırdıqda demişdi ki, mən bilmirəm; halbuki, bimar deyildi və bütlərin kim tərəfindən sındırıldığını ondan soruşduqda – «bəlkə onların bu böyüyü bunu etmişdir. Əgər danışa bilirlərsə, özlərindən soruşun!» – deyə cavab verdi. (Qur'ani-Kərimin 21-ci (Ənbiya) surəsi, 63-cü ayə). Halbuki, özü sındırmışdı, böyük büt sındırmamışdı. Həmçinin, Allahdan istədi ki, ölüləri necə diriltdiyini ona göstərsin. Allah-təala buyurdu: «Məgər iyman gətirməmisən?» İbrahim cavab verdi: «Niyə, amma ürəyim aram olsun, deyə bu xahişi etdim». (Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsi, 260-cı ayə). Bundan əlavə, zalim hakimin qorxusundan öz arvadını sandığın içinə qoydu və onu dördayaqlı [heyvana] yüklədi. Hkimin mə'murları xəbər tutdular, onu və arvadını hakimin hüzuruna apardılar. Hakim İbrahimdən soruşdu ki, bu arvadın (yə'ni, Saranın) səninlə nə yaxınlığı vardır? İbrahim dedi: – Mənim bacımdır. Halbuki, bacısı yox, arvadı idi.

Beytin mə'nası: Həzrəti-İbrahim Xəlil də ürəyinin «qəbul» topunu aparmaq ümidi ilə bu müsabiqədə iştirak etdi. Amma meydanın yolunun yarısına qədər ondan bir neçə xəta baş verdi və nəticədə «qəbul» topunu apara bilmədi.

B.306. Davud – İsrail padşahı, peyğəmbər və şair olmuşdur. Ğina ilhamı ilə zəngin olan «Nəğmələr» ondan yadigardır. Tövrata görə o, təkcə Calut Ğul ilə cəng etmişdir və onu bir fəlaxun (sapand) zərbəsi ilə öldürmüşdür.

Davuda ki, onda nəfəs təng idi – burada büxl, həsəd və tamah mə'nasındadır və Davudun Uriyanın arvadına olan məhəbbətinə işarədir. Uriya, Davudun qoşun böyüyü (sərkərdə) idi və onun Büt-şəb' adlı arvadı vardı. Davud ona aşiq olmuşdu və onun vüsalını o qədər arzu edirdi ki, axırda bu arzu Uriyanın qətlinə səbəb oldu.



Allah-təala Davudu tənbih etmək üçün iki mələki insan surətində onun yanına göndərdi. Onlardan biri digərindən şikayət edərək dedi: – Mənim vur-tut bircə qoyunum vardır, bu qardaşımın isə doxsan doqquz qoyunu vardır və istəyir ki, mən bircə qoyunumu da ona verim. Davud dedi: – O sənin bircə qoyununu öz qoyunlarına qatmaq istəməklə sənə zülm etmişdir. Davud bu hökmdən (qazilikdən) sonra başa düşdü ki, bu qəziyyə onun özü haqqında aşkar dəlildir. Çünki, hərəmxanada özünün bir neçə arvadı olmasına baxmayaraq, öz sərkərdəsi Uriyanın bircə arvadına da sahib olmaq təmənna etdi. (Bu barədə Qur'ani-Kərimin 38-ci (Sad) surəsinin 22-25-ci ayələrində bəhs olunur).

Beytin mə'nası: Davudun ürəyinin də bu müsabiqədə iştirak etmək üçün lazımi iste'dad və imkanı olmadı. Çünki, Davud təngnəfəs idi və təngnəfəslər belə yarışlarda iştirak etmək, at çapmaq və çovgan oynatmaq iste'dadına malik deyildir. Davud ki, Uriyanın arvadına tamah etdi, onun ürəyi üçün xəta idi və bu səbəbdən müsabiqədə topu apara bilmədi.

Həkim Nizami müsabiqə meydanından və «qəbul» topundan bu beytin ikinci misrasında digər incə bir mə'na ifadə etmişdir: – Davud xoş ləhn və xoşavaz olmasına baxmayaraq, onun sədası bu müsabiqədə lazım olan ahəng ilə müvafiq deyildi. Çünki, burada bəm nəva (fəqr və təvazö' şikəstənəfslik) lazım idi; amma Davudun avazında bu xüsusiyyət yox idi.

B. 307. Süleyman – Davudun oğludur, Bəni-İsrail peyğəmbəri və padşah olmuşdur. Tacı atıb, tutdu o həm məmləkət – yə'ni, şahlıq və məmləkət istədi. Burada Qur'ani-Kərimin 38-ci (sad) surəsinin 34-cü ayəsinə işarə olunur: «And olsun ki, Biz Süleymanı [etdiyi bir xəta üzündən] imtahana çəkdik. Taxtının üstünə bir cin oturtduq [və ya ruhsuz bir cəsəd atdıq]. Sonra o [peşiman olub tövbə etdi və yenidən öz mülkünə, öz taxtına] qayıtdı». Süleyman Allahdan qüdrət və əzəmət nöqteyi nəzərindən heç kəsə nəsib olmayan padşahlıq və səltənət istədi.

Tac – qəbul müsabiqəsində bəhs olunan ürəyə işarədir. Beytin mə'nası: Süleyman məmləkətə aludə olub, Allahdan padşahlıq istədi və bütün peyğəmbərlərin cəhd edib müsabiqədə ğalib istədiyi bir ürəyi istəmədi və öz səhvinin (padşahlıq istəməyinin) ardınca getdi. Buna görə də ədəblə kənara çəkildi və bu müsabiqədə iştirak etmədi.

B.308. Yusif – Yə'qub peyğəmbərin oğludur. Atası Yusifi çox istədiyindən, qardaşları ona paxıllıq edir və səhraya aparıb quyuya salırlar... Karvanla keçənlər onu quyudan çıxarırlar və Misrdə satırlar... Yusif bir müddətdən sonra xeyli məşəqqətə düçar olur, zindana düşür... və Misrin hakimi məqamına yetir. Su – qəbul müsabiqəsində iştirak edən ürəyə işarədir. Əyan – aşkar; yə'ni, Yusif də öz «ürəyini qəbul mövqeində» görmədi, Allahın inayətindən öz həqqində fəqət kəndirlə dolçanın quyuya enməsini gördü.

B.309. Xizr – müsəlmanların nəzərincə peyğəmbərlərdən biridir ki, Musaya rəhnümalıq etmişdir və rəvayətə görə zülmətdə dirilik suyunu tapıb içdikdən sonra əbədi həyat tapmışdır.

Quru – yə'ni, bəhrəsiz. Dumduru bulaq – dirilik suyu bulağı; həmin bulaq ki, Xizr İsgəndər ilə onu tapmaq üçün zülmətə getdi və Xizr o sudan içəndən sonra dərhal çeşmə gözdən itdi və İsgəndər ondan içməyə müvəffəq olmadı. Beytin mə'nası: Xizr dirilik suyu axtardı, tapdı içdi və əbədi diri qaldı. Bu imtiyaz ilə ətəyini yaş etdi və özü də dərk etdi ki, bu xəta ilə «qəbul» topunu ələ keçirmək üçün onun hərəkət və sə'yi faydasız olacaq. Bu səbəbdən, müsabiqədə iştirak etmək üçün hazırlaşmadı.

B.310. Musa əliboş qalıb – Qur'ani-Kərimin 7-ci (Ə'raf) surəsinin 143-cü ayəsinə işarədir: «Musa: «Ey Rəbbim! Özünü [camalını] mənə göstər Sənə baxım!» – dedi. Allah: «Sən məni əsla görə bilməzsən. Lakin [bu] dağa bax. Əgər o yerində dura bilsə, sən də məni görə bilərsən...» – deyə buyurdu...»

Tur – Tur dağı. Beytin mə'nası: Musanın əli də «qəbul» camı şərabından boş qaldı və bu şərabdan bir udum da ələ gətirə bilmədi; çünki, Tur dağı camı sındırmışdı və sınıq camda şərab qərar tutmaz. Yə'ni, Tur dağında Allahdan etdiyi tələb böyük xəta idi; çünki, Allah göz ilə görülən deyildir. Qur'ani-Kərimin 6-cı (Ən'am) surəsinin 103-cü ayəsində deyilir: «Gözlər Onu [görüb] dərk etməz. O, gözləri dərk edər. O, lətifdir [cismlikdən uzaqdır] və hər şeydən xəbərdardır!»

B.311. Danə – qəbul müsabiqəsində iştirak edən ürəyə işarədir. Töhmət içindəydi – İsa (ə) dünyaya atasız gəldiyinə görə anası Məryəmə tə'nə edirdilər və bu səbəbdən İsa (ə) töhmət içində idi; hətta, bə'ziləri İsaya «Allahın oğlu» deyə töhmət edirdilər. Beytin mə'nası: Həzrəti-İsa əsla «qəbul danəsi» qəsdində olmadı; çünki, onu töhmətlə ləkələmişdilər və paklığını sual altda qoymuşdular.



B.312. Beytin mə'nası: Nizami, zahirən Qur'ani-Kərimin 39-cu (Zumər) surəsinin 22-ci ayəsini nəzərdə tutmuşdur: «Məgər Allahın köksünü [qəlbini] islam dini üçün açmaqla Rəbbindən nur üzərində olan kəs [qəlbi möhürlənmiş kimsə kimi ola bilərmi?!]...» Həmçinin, 94-cü (İnşirah) surəsinin birinci ayəsini: – «[Ya Peyğəmbər!] Məgər Biz [haqqı bilmək, elm və hikmət dəryası etmək üçün] sənin köksünü açıb genişlətmədikmi?! [Allahın köksünü açıb genişlətdiyi kimsənin qəlbinə Şeytan vəsvəsə sala bilməz. O, qüdsiyyət kəsb edər, vəhy qəbul etməyə layiq olar!]» – nəzərdə tutmuşdur ki, onun şərhi belədir: Həlimə (Peyğəmbərin (s) dayəsi) Rəsuli-Əkrəmin (s) iki yaşında olanda heyrətlə asimana tərəf baxdığını gördü. Guya, nəyə, yaxud kimə isə tamaşa edirdi. Bu işin səbəbini soruşdu. Həzrət buyurdu: – İki cavan surətində iki nəfər gördüm ki, asimandan aşağı endilər. Birinin əlində zərrin teşt və o birinin əlində gümüşü aftabə (su qabu) vardı. Məni yuxuya verdilər (yatırtdılar), ürəyimi köksümdən (sinəmdən) çıxartdılar və o teştdə yudular; belə ki, mənə heç bir əziyyət yetmədi. Budur, asimana tərəf gedirlər, mən hələ də onları görürəm. Onlar Cəbrail və Mikail idilər və o Cənabın ürəyini yuduqları su isə dirilik suyu idi.

Kəlbi bu surənin nazil olması barəsində deyir: «Peyğəmbər (s) dedi: – «Öz Allahım ilə ədəbsizlik etdim, kaş etməyəydim. Dedim: «Pərvərdigara! Adəmə saflıq verdin, Nuha uzun ömr verdin, İbrahimi səmimi dostun etdin, Davuda xilafət verdin, Süleymana məmləkət verdin, İsaya rif'ət verdin. Mə'nası o oldu ki: – Mənə nə verdin? Allahım mənə o qədər xəl'ətlər və ətalar xatırlatdı ki, onlara olunan ətalar mənə olunan ətaların yanında gözə görünmədi. Biri o idi ki, dedi: – «Biz sənin köksünü açıb genişlətmədikmi?!»

Nizami bu vaqiəni öz qüdrətli təb'i ilə ziynətləndirir və demək istəyir ki, təkcə Həzrəti-Məhəmmədin (s) ürəyi Allahın «qəbul» möhrünü aldı, əvvəlki peyğəmbərlər bu mərtəbəni arzu etsələr də onlardan hər biri öz əməlləri ucundan bu tovfiqdən məhrum oldu.

Namə – qəbul (Allahın «qəbul» mövqe'ində olan ürək) nəzərdə tutulur. Ünvan – namənin əvvəli, sərlövhəsi, adı, başlanğıcdakı nişanı. Xütbə–bayram və cüm'ə günlərində (namazlarında) oxunan ayə, hədis və nəsihətlərdir ki, onda zəmanə padşahının və xəlifənin adı da çəkilir; burada nubuvvətə işarədir. Beytin mə'nası:

Qəbul sultanlığı səninlə müsəlləm oldu, qəbul xütbəsi və nubuvvət səninlə xətm oldu və sənin dövranında peyğəmbərlik sona yetdi.

B.314-315. Çərx – ata, Yer kürrəsi isə topa təşbih edilmişdir. Söhbət, meydanı fələk vüs'ətində, topu isə Yer kürrəsi əndazəsində olan çovgan oyunundan gedir. Beytin mə'nası: Sənin şəriətin hamı üçündür və bütün cahan meydanı onun ixtiyarındadır. Yer və yerdə yaşayanlar da cahanın bir hissəsi olduğu üçün sənin şəriətinin hökmü altındadır.

B.316-317. Beytin mə'nası. Nə qədər ki, yoxluq aləmindən fəna tozu gəlməyib və mövcudatı məhv etməyib, meydan sənindir, öz qüdrət atını çövlana gətir. Bu beytin məfhumundan belə nəticəyə gəlmək olur ki: – «Qüdrət və şöhrət əyyamı fəna gələnə qədərdir; başqa sözlə, ədəm və fəna müqabilində acizsən». Nizami bilafasilə ardınca gələn beytdə bu fikri ortadan götürür və deyir: – Fəna heç kəsdir və elə bir qüdrəti yoxdur ki, sənin rövnəqini aradan aparsın və nakəs ədəm qadir deyildir ki, sənin adını unutqanlığa tuş etsin.

B.318. Əl və ayaq bağlı olduqda heç bir fəaliyyət və iş görmək mümkün olmur.

B.319. Dili bağlı – dilsiz; cəmad, nəbat və heyvana işarədir. Sövdalı – ürəyi xəstə, ğəmgin. Cigər-dağlı – dərdli. Beytin mə'nası: Ey buzurgvar, ey nəfəsi və sözü dərdlilərin mərhəmi! Sənin nəfəsin cəmad, nəbat və heyvanın dilə gəlməsinə səbəb oldu və onlar sənin risalətinin haqq olduğunu bəyan etdilər. Şərhi: Mənbələrdə və rəvayətlərdə deyilir ki: – «Daş və ağac o həzrətə salam etdilər, ahu onunla danışdı, qızardılmış (bişmiş) çəpiş onunla danışdı, qum onun əlində təsbih etdi».

B.321. Vergi – bu söz orijinalda «əbre» kimi getmişdir. Çadırlarda məskun olanlardan və gəmi ilə müsafirət edənlərdən hər adam başına nəqd pul şəklində alınan az miqdarda rüsum (gömrük) vergisi idi. Altı günün vergisi – asiman, zəmin və onların arasında olan məxluqata işarədir. (Kainatın altı gün ərzində yaranması e'tibarı ilə).

Beytin mə'nası: Sənin kuyin yeddi fələkin qibləsidir və sənin zülfün o qədər əziz və qiymətlidir ki, əgər aləm və aləmdə yaşayanları onunla müqayisə etsək, aləmin qiyməti sənin zülfünün bir teli qədərdir. (Şərhi odur ki, rüsum haqqı adam başına yığılırdı. Fərz edək ki, bu vergi hər adam başına bir dirhəmdir: əgər onu başda olan tüklərin sayına bölsək, bir telin



rüsum haqqı bir neçə min dirhəmə bərabər olacaqdır. Nizami deyir ki, bütün kainat sənin bir telinin rüsum haqqı qiymətindədir).

B.323. Qələmin hərf (söz) yazan hissəsi onun üzüdür, yə'ni xarici tərəfidir, yazdığı yer isə kağızın üzüdür. Hər bir mövzunu yazan kəs həqiqətdə orada olan mətləbi oxuyur. Qələm həm yazır, həm də oxuyur. (bu mə'nada ki, yazan odur). Nizami deyir: Qələm üzdə yazılanı oxuyandır, sən üzdə yazılanı qələmdən artıq oxuyursan və əql məğzin (beyinin) içi əndazəsində xəbərdardır; amma sənin xəbərdar olmağın əqldən artıqdır. Yə'ni, qələmdən artıq oxuyursan və əqldən artıq bilirsən.

B.324. Hərfə ayaq vurdu sənin barmağın – yə'ni, tərk etdi, baxmadı, vaz keçdi. Beytin mə'nası: Sənin barmağın hərf və kəlmələri tərk etdi ki, (yə'ni, yazı yazmadı) sənin yazdığına hər kəsin və nakəsin barmağı dəyməsin. (Rəsuli-Əkrəmin (s) ümmi olmasına işarədir).

B.325. Hər kəsin sözünə e'tiraz və nöqsan yeri olması ehtimalı var, amma sənin sözün elə sözdür ki, heç kəsin ona e'tirazı yoxdur.

B.326. Sənin məzhərin, yə'ni qapının torpağı qovut-şəkər tozudur və sənin şəkərin (yə'ni, dodağın və ağzın) innab və püstədir.

B.327. Təmaşa – seyr və səfər mə'nasındadır. Beytin mə'nası: Sənin qapının bir ovuc torpağı ki, şəkər tozu mənziləsindədir, eşq vadisi salikləri üçün qırx günlük azuqədir. (Burada, qırx gün xəlvətdə oturub ibadət edən və riyazət çəkənlərə eyham vardır).

B.328. Təzə-tər sübh-sübhi – sadiq. Sübhi-nicat-zülmətdən nicat verən sübh. Torpağınam – yə'ni, səndən ötrü torpaq ilə yeksan olan bir ölüyəm. Abi-həyatsan mənə – sən mənə can verən bir su mənziləsindəsən.

Beytin mə'nası: Sən mənə zülmətdən nicat verən sübhi-sadiqsən, mən sənin torpağınam, aşiqinəm və bir ölüyəm ki, abi-həyatım sənsən, mənim həyatım sənin inayətinə bağlıdır.

B.329. Pak torpağın – yə'ni, sənin türbətin, qəbrin. Qürbət bağın – qəbr mə'nasında işlənmişdir. Beytin mə'nası: Sənin qəbrini ziyarət etmək mənim ruhumun behiştidir, sənin türbətin mənim ruhumdur və mənim dövlətimdir.

B.330-331. Mən o bağ üstə – Peyğəmbərin (s) pak türbətinə işarədir. Beytin mə'nası: Sənin qəbrinin pak torpağı gözlərə nur bəxş edən sürmə kimidir; mən onu öz gözlərimə çəkirəm və ğulam kimi sənin xidmətində atının çulunu öz çiynimdə gəzdirirəm.

B.332. Ğaliyə – müşk, ənbər və s. qarışığından hazırlanan qara rəngli xoş ətrli maddədir ki, onunla saçları rəngləyirlər. Beytin mə'nası: Nizami sənin xidmətində atının çulunu çiynində daşımaqla bir məqama yetər ki, böyüklər Nizaminin qəbrinin torpağını öz başları üçün ğaliyə edərlər. (Şərhi: Ğaliyə ətr və boyaqdan əlavə dərdisəri dağıtmaq üçün də faydalıdır və işlədilirdi).

## MƏLİK FƏXRƏDDİN BƏHRAMŞAHIN MƏDHİ

B.333. Nizami özünü dairənin mərkəzində yerləşən nöqtəyə və dairə xətti vasitəsilə hasara alınmış kəsə (məhbusa) təşbih edir.

B.334. Hüma-qədimlər bu quşu səadət rəmzi hesab edirdilər ki, guya kimin başına kölgə salsa, onu xoşbəxt edər. Fərr – şə'n, şövkət. Beytin mə'nası: Gəncədən bir yerə çıxmaq qüdrətim yoxdur; başımın üstündə sayə vardır, amma bu sayədə mənim üçün hüma fərri yoxdur.

B.335. Tapqır – atın yəhərinin ön və arxasında şikar və s. asmaq üçün istifadə olunan qayışlar. Beytin mə'nası: Ayağımın torpaqda olmasına baxmayaraq, əlim fələkin tapqırındadır; yə'ni, torpaqda oturub fələki seyr edirəm.

B.336. Başı diz üstə qoymaq – müşahidə və kəşf halına işarədir ki, bu halda adətən başı diz üstə qoyurlar. Dizin başını qədəm etmək – başı diz üstə qoymaq və fikrə getmək.

B.337. Üzümün son dərəcə rövşən və parlaq olması səbəbindən dizimin üstü ürək aynası oldu. Yə'ni, onda ki, başımı dizimin üstünə qoyuram, ürəyimin parlaqlığı və paklığı təcəlla edir.

B.339. Ta mənə bir ayinə rövşən görüm – yə'ni agah, rövşən və mənə şərəf ola bilən bir şəxs görüm.

B.343. Xizr çeşməsi kimi rövşən rə'yli, İsgəndər rəftarlıdır, Məcəsti açandır. (yə'ni, müşkülləri həll edəndir) Burada həmçinin, İskəndərin Xizr ilə dirilik suyu ardınca zülmətə getməsinə işarə olunur.

B.344. Onun şə'ni yaranışda əvvəl dərəcədədir və məqsəd ayəsi ona nazil olmuşdur.

B.345-347. Fəxrəddin Bəhramşahın atasının adı Davud və babasının adı İshaqdır. Həzrəti-Süleyman, Davudun oğludur və məmduhun atasının adı Davud olduğuna görə Nizami deyir:



Sənin Süleyman şərəfi və mərtəbəsi varındırsa, təəccüblü deyildir, çünki Davudun oğlusan və bu nisbət sənə Süleymanlıq mərtəbəsini bərqərar etmişdir. İshaqın bayrağını sən ucaltmısan və sənin ziddinə gedən ismailidir. (İsmaili – batiniyyə məzhəbinin ardıcılları).

B.349. Mübariz cəngavərləri Bəhram (Mirrix) ilə müqayisə edirlər. Onun bəhramlığı – yə'ni, onun adının Mirrixə nisbəti vardır və döyüş vaxtı Mirrix-tə'sirlidir. Bəhram-Gur – beşinci Bəhram, Sasani şahlarının on beşincisi. (421-438 m)

B.356. Simab saçan çeşmə – Günəşə işarədir. Beytin mə'nası: Günəş onun bəxşiş edən əli ilə müqayisədə özünü ona hərif (tay, müqabil) görmədi.

B.357. Məmduhun kəmərbəndi saf lə'llər ilə ziynətlənmişdir. Bu lə'llər o qədər parlaq və qiymətlidir ki, Günəşin lə'l yüklü kəmərinə məsxərə edir. Başqa sözlə, Günəş kəmərinin lə'li məmduhun kəmərinin lə'li ilə müqayisəyə qabil deyildir.

B.358. Göy pəncərə – asiman və ulduzlara işarədir. Beytin mə'nası: Düşmənlərindən kim onunla vuruşub qüdrətini göstərmək istəsə, asiman onu məhv edər.

B.359. Fələk təbli – göy gurultusuna işarədir. Ay şüşəsi – Ayı şüşəyə təşbih etmişdir. Şərhi: Şüşə mə'mulatı hazırlamaqda nəfəs vermək (püfləmək) bir üsul hesab olunur. Yə'ni, şüşə xəmirinin içərisinə çubuq vasitəsilə nəfəs verib, onu hübab (köpük, qabarcıq) şəklinə salırlar. Əgər həddən artıq üfürsələr, (nəfəs versələr) hübab dağılar.

Burada eyham vardır ki: – onun arifanə nəfəsi Ayı yox etmək qüdrətindədir.

B.361. Onun əli səxavət camıdır; əbədi olsun ki, onun bu əməli baqiyatdandır. (Baqiyati-salihat – xeyr işlərdir ki, insandan sonra baqi qalır).

## BƏHRAMŞAHA SİTAYİŞ

B.362. Adəmin gövhəri – torpaq; Yerə işarədir. Aləmin gözü – Günəş. Beytin mə'nası: Torpaq sənin vücudunun səbəbi ilə şərafət tapmışdır və Günəşin gözü sənin vücudunun səbəbindən rövşən olmuşdur. (Günəş – nurlu gözə təşbih olunmuşdur).

B.363. Naz-asudəlik, xoşgüzəranlıq. Doqquz qarın – fələkin doqquz qarnı. Beytin mə'nası: Doqquz fələk sənin zəfərini hasil

etmək üçün birləşiblər. Fələkin doqquz qarnı, sənin asudəlik (asayiş) və şadlığını bəsləyir və vücuda gətirir.

B.364. İki balıq – biri o balıqdır ki, Yerin altındadır və onun belində öküz var və öküzün buynuzunda yer qərar tutmuşdur. (qədimlərdən bə'zilərinin əqidəsinə görə). Digəri isə o balıqdır ki, asimandadır və balıq (Hut) bürcü adı ilə məşhurdur. Beytin mə'nası: Sənin qılıncının ziynəti üçün iki balıq qulağı sədəf təşkil edirlər və mirvari bəsləyirlər.

B.366. Qılıncın çeşməsi – qılıncın suyu, qılıncın cövhəri. Beytin mə'nası: Sənin qılıncının suyu öz səfası rəngi və rəvanlığı ilə Fərat suyu kimidir və dirilik suyu şüşəsini torpağa tökmüşdür. Yə'ni dirilik suyunu qiymətdən və rövnəqdən salmışdır və eyhamla bildirir ki, düşmənlərinin həyat şüşəsini sındırmışdır.

B.367. Hər kəs sənin qəhr (qəzəb) tufanından arxayın (qorxusuz) yuxuya getsə, Nuh kimi gəmidə otursa da sənin qəhr tufanın onu ğərq edər.

B.368. Xosrovu cam – Keyxosrovun camı, yaxud dünyanı göstərən camdır ki, hər kəsi və hər yeri göstərərdi. Keyxosrov Bujəni tapmaq üçün bu camdan istifadə etmişdi. (Keyxosrov – Keylər sülaləsinin üçüncü padşahıdır).

Cəm – yaxud Cəmşid, Pişdadilər sülaləsinin böyük şahlarındandır. Xalqa libas tikməyi, gəmiçiliyi, təbibliyi öyrətmiş və Novruz bayramının əsasını qoymuşdur. Zöhhak onu təxtdən salmış və ərrə (mişar) ilə iki yerə bölmüşdür. Beytin mə'nası: Sənin camın Keyxosrovun dünyanı göstərən camı kimidir və səniin huşun Cəmşidin huşu kimidir. Sənin kölgən rəncidələr (gün vuranlar, günün altında işləyib əziyyət çəkənlər) üçün asayiş və xoşbəxtlikdir.

B.374. Ruzigar cahana hökmranlıq üzüyünü sənin adına yazıb və sən zəmanənin Süleymanı olduğun üçün küləki sənin ixtiyarında olmağı qərar vermişdir.

B.377. Əgər Firidun şərab içdikdə səni xatırlamasa, Zöhhak ilanı çiyinlərindən çıxıb onu həlak edər. Firidun – Təhmürəs nəslindəndir və körpə ikən Zöhhak onun atasını öldürmüşdür. Anası onu xilas etmiş və inək südü ilə böyütmüşdür. Dəmirçi Gavə xalqı Zöhhaka qarşı qiyama qaldırır və ona qalib gəldikdən sonra Firidunu çağırıb təxtə əyləşdirir.



Zöhhak – Bivərəsp onun ləqəbidir ki, guya padşahlığından əvvəl on min atı var imiş. (Bivər – pəhləvi (qədim fars) dilində – on min, əsp isə at deməkdir). Firdovsi deyir:

Hamı ona Bivərəsp deyirdi,
Pəhləvana bu adı vermişdilər.

«Şahnamə»də deyildiyinə görə, İblisin fitnəsi səbəbindən öz atasını öldürür; İblis onun iki çiynindən öpür və ğeyb olur. Bundan sonra İblisin öpdüyü yerdən iki ilan çıxır və Zöhhaka çox əziyyət verir. İlanları nə qədər kəsirlərsə, yenə də çıxır. Təbiblər ona əlac edə bilmirlər və nəhayət bir gün İblis təbib surətində zahir olur və dərdinin dərmanının insan beyni olduğunu ona deyir. Ondan sonra hər gün iki cavan öldürüb, beyinlərini həmin ilanlara yedizdirirlər. Zöhhak İrana ğalib gəlib Cəmşidi öldürür və təxtə oturur. Xalq onun zülmündən cana gəlir və dəmirçi Gavə (Zöhhak onun iki cavan oğlunu öldürmüşdü) xalqı Zöhhaka qarşı ayağa qaldırıb onu təxtdən salır. Sonra Firidunu səltənətə də'vət edib təxtə əyləşdirir. Firidun Zöhhakı əsir edib, Dəmavənd dağında zindana saldırır.

B.384. Bayquş – nəhs və uğursuzluğu ilə tanınan bir quşdur ki, adətən xarabalıqlarda yaşayır. Hüma – xoşbəxtlik rəmzi ilə tanınan bir quşdur; deyirlər, onun kölgəsi hər kəsin başına düşsə, dövlətə və səadətə yetər. Beytin mə'nası: Sənin ruzigarın elə bir xoşbəxtlik dövrüdür ki, Hüma quşu kimi səadətdən və bərəkətdən müjdə gətirir. Böyüklər ki, sənin hüzuruna gəlirlər, başlarını ayaq yerinə qoyurlar; yə'ni, asitanını öpmək üçün başlarını yerə əyirlər.

B.385. Sənin ədalətin yaxşılıq və ehsan ilə tanınmış və hər tərəfə yayılmışdır. Xalq sülh və səfa içində yaşayır, biri digərindən şikayət etmir və şikayətin bazarı kasad olmuşdur. Sənin əlin şikayətin bazarını kasad etdiyi üçün o, səndən şikayət etməyə getmişdir.

B.387. Yeddi fələk bu qədər əzəməti ilə sənin zatının gövhəri ilə müqayisədə kiçik bir mücrü (hoqqə) mənziləsindədir və səkkiz Behişt bu qədər vüs'ət ilə sənin bayrağının bir parçasıdır. Başqa sözlə, sənin bayrağın altında kafirlərlə mübarizədə hasil olan savab (xeyr) işlər səkkiz Behiştdən artıqdır.

B.390. Badi-səbaya ədəb öyrət ki, söz çırağını xamuş etməsin və söz çırağını rövşən et. Yə'ni şairlərə verdiyin bəxşiş ilə söz çırağının nurunu artır və ona can ver.

B.391. Nizamiyə xəl'ət göndərib şərəfləndir və bu kitabı qəbul etməyinin müjdəsini Nizamiyə yetir.

B.392. Mənim sözüm can bəxş etmək qüvvəsindədir, amma sənin hüzurunun söz süfrəsi çox rəngin və əlvandır ki, mənim bu sözüm onun müqabilində çox zəif və gücsüzdür. (Nizami bu beytdə öz məmduhunu eyhamla şair və söz sərrafı kimi tə'rif etmişdir).

B.393. Bu dənizin, mə'dənin – şairlərə işarədir. Beytin mə'nası: Sən bağışlayan əlinlə şairlərə mirvari ver, lə'l kimi sözlərinlə onları təşviq et.

B.394. Bədxahlarına peykandan lə'l ver, qılıncından isə gövhər. Yə'ni, peykan yarası ilə və qılınc gövhəri (cövhəri) ilə bədxahlarına cavab ver. (Burada peykan və «peykani» adlanan lə'l növ'ünə eyhamla müşabihət vardır).

B.397. Sənin fəthin bayraq kimi baş çəkib ucalsın və sənin düşmənin qələm kimi öz başını əldən versin. (qələmi yonmaq üçün başını kəsirlər).

## KİTABIN NƏZMİNƏ SƏBƏB HAQQINDA

B.398. Bu gül – «Məxzənül-əsrar» kitabına işarədir. Sözə nəfəs vermək – burada, şe'r demək mə'nasındadır. Zəng ilə səs salmaq – vücud zahir etmək, söz demək. (Ağız və dil zəngə təşbih olunmuşdur).

B.400. Başqalarının sözlərindən borc almamışam, ürəyim əmr etdiyini şe'rə gətirmişəm. Başqa sözlə, bu şivədə söz demək öz təşəbbüsüm, öz yeniliyimdir.

B.401. Yeni bir hoqqə (məharət) göstərib təzə qəlibdə, yeni tərzdə heykəl yaradıram.

B.402. Sübhsifət – yə'ni, təzə və bikr. Səhər sehri – sübh vaxtının cadusu; nura işarədir. Beytin mə'nası: «Məxzənül-əsrar» kitabına bakirə, iffətli, ədəbli və hicablı qızlar kimi tərtib vermişəm.

B.403. Mayəsi şahlıq və gədalıq onun – yə'ni, əsası və qüdrəti səltənət və irfandır (allahşünaslıq). Beytin mə'nası: Bu əsərdə irfan və səltənət mayəsi vardır və ilahi sirlərdən bir xəzinədir.

B.404. Şəkkər – şirin sözə işarədir. Şəkkərinə qonmadı milçək – yə'ni, ona əl dəyməyib və bikrdir. İkinci misrada milçək – kitabdakı kəlmə və sözlərə işarədir. Beytin mə'nası: Bu kitabın şirin sözləri bikrdir və ona heç bir əl toxunmayıb və başqalarının şirin məzmunlarından mayə götürməyib.

B.405. Nuh – ulul-əzm peyğəmbərlərdən biridir ki, nəsəbi Adəmə çatır. Uzun illər öz ümmətini doğru yola (dinə) də'vət edir, amma onlar doğru yola gəlməməkdə israr edirlər. Xudavənd böyük tufandan Nuhu xəbərdar edir və Nuh düzəltdiyi gəmi ilə öz xanədanını və tərəfdarlarını, həmçinin müxtəlif canlılardan xeyli götürüb həlakətdən nicat tapır.

Bəhr – dərya; burada, irfana işarədir. (istiarə kimi işlənmişdir). Qalxan atmaq – aciz qalmağa işarədir. Xizr – müsəlmanların nəzərində peyğəmbərlərdən biridir ki, dirilik suyu çeşməsindən su içəndən sonra əbədi diridir. Çeşmə – irfan çeşməsi. Dolçanı qırmaq – Dehxudanın lüğətnaməsində «naümid olmaq» mə'nasında izah olunur və həmin beyt şahid gətirilir. Amma «bir şeyi qiymətsiz hesab etmək və onu atmaq» mə'nasındadır.

Beytin mə'nası: Nuh ki, dəryada tufana müsəllət oldu, irfan dəryasının barabərində acizdir və Xizr ki, dirilik suyu içib əbədi həyat tapdı, irfan çeşməsinin bərabərində öz mayəsinin, yə'ni, dirilik suyunun qiymətsiz olduğunu dərk etdi.

B.406. Bu gözəllik sahibinin xatirinə bütün şahların adına fal atdım, fal sənin adına düşdü və sənin bəxtin gətirdi.

B.407. İki namə – iki kitab. Şərəf şanına gəldi – yə'ni, şərəf məqamına yetdi. Burada iki Bəhramşah adlı padşaha işarə olunur: Birincisi – Bəhramşah ibn Məs'ud Yəmin-üd Dövlə Ğəznəvidir (512-547 h.) ki, Həkim Sənai Ğəznəvi «Hədiqət-ül həqiqət» kitabını onun adına yazmışdır. İkincisi–Fəxrəddin Bəhramşah ibn Davud ibn İshaqdır ki, Azərbaycanda hakimiyyətdə olmuşdur. (550-622 h.) və Nizami «Məxzənül-əsrar» kitabını onun adına yazmışdır. Beytin mə'nası: İki kitab, iki Bəhramşah adı ilə fəxr məqamına yetib bəyənildi.

B.408. Köhnə mə'dən zəri – Sənainin «Hədiqət-ül həqiqət» məsnəvisinə işarədir. Bu təzə bəhr içrə saçır gövhəri – Nizaminin özünə və «Məxzənül-əsrar» əsərinə işarədir. Nizami «Məxzənül-əsrar» məsnəvisini səri' bəhrində (müftə'ilün, müftə'ilün, fa'ilün) nəzmə çəkmişdir və bu bəhrdə məsnəvi deyən əvvəlinci şairdir.

Beytin mə'nası: Həkim Sənai qədim mə'dəndən qəlibə qızıl tökdü, «Hədiqə» kitabını nəzmə çəkdi və mən (Həkim Nizami) təzə bəhrdən mirvari çıxartdım. Yə'ni, «Məxzənül-əsrar» kitabını yeni bəhrdə və yeni üslubda (səbkdə) qələmə aldım.

B.409. Rum sikkəsi – Rum məmləkətinə mənsub sikkə. Rum sikkəsindən məqsəd rum qızılının ağ olmasını nişan verməkdir. Rəqəm vurmaq – yazmaq, nəqş etmək. Beytin mə'nası: Həkim Sənai söz bayrağını Ğəznədə qaldırdı və Bəhramşah Ğəznəvinin adına bağladı. Həkim Nizami öz yazdığını rum sikkəsinə nəqş etdi, yə'ni Rum şahı Bəhramşahın adına bağladı. Şərhi: Nizami «Məxzənül-əsrar» əsərində Bəhramşahı Ərmən və Rum şahı adlandırır:

Xas edib ondan bu cahanı umum,
Mülkü həm Ərmən o şahın, həm də Rum (B.351.)

B.410. Gərçi söz o sikkədə – Sənainin sözünə işarədir. Zərimin sikkəsi – məmduhu Fəxrəddin Bəhramşaha işarədir. Beytin mə'nası: Həqiqətən, Sənainin sözləri qızıl kimidir, amma mənim qızılımın sikkəsi Sənainin malından artıqdır. Başqa sözlə, mənim və Sənainin sözləri hər ikisi qızıl kimidir, fərqi budur ki, mənim məmduhum onun məmduhundan artıqdır.

B.411. Yük, bar – mal-dövlət, azuqə. «Məxzənül-əsrar» kitabına işarədir. Xəridar – Nizaminin məmduhuna işarədir. Şərhi: Sənainin «Hədiqə»si beytlərin sayı nöqteyi-nəzərindən «Məxzənül-əsrar» məsnəvisindən dörd dəfədən artıqdır. Sənai özü həmin kitabda beytlərin sayının on min ədəd olduğunu deyir:

Bu kitabda olan [beytləri] hesabladıqda,
On min ədəd beyt saya gəldi.

Həmin kitabda başqa yerdə isə beytlərin sayının «şəhadəteyn» (La ilahə illəllah və Mühəmmədən Rəsulullah) hərflərinin sayı ilə bərabər olduğunu deyir ki, onların hərflərinin ayrı-ayrılıqda hər birinin sayı on ikidir. (Hal-hazirdə əldə olan mükəmməl nüsxələrdə beytlərin sayı on bir min beş yüzdən çoxdur). Beytin mə'nası: Hərçənd mənim azuqə və malım Sənainin malından azdır, amma qarşı-qarşıya qoyduqda mənim xəridarım Sənainin xəridarından artıqdır.

B.412. Şivə-şe'r səbki, üslub. Ğərib – nadir və yeni, bədii. Keçmə – yə'ni, qəbul et. İkinci misrada «ğərib» təəccüblü mə'nasındadır. Beytin mə'nası: Yeni səbkdə qələmə alınmış bu kitabı istiqbal et və bu kitabı qələmə alanın hacətini yerinə yetir. Əgər şairini nəvaziş etsən, heç də ğəribə və təəccüblü olmaz.



B.413. Bu ürək açan sözlər bağ naxışları kimi əlvan və gözəldir; çırağ kimi nur və şö'ləni başqa ocaq və manqaldan borc (burovuz) götürməmişdir, Günəş kimi nur və hərarəti özündəndir. Başqa sözlə, bu kitabın xəyal avazı onu deyənin (şairin) öz zehnindən doğmuşdur və başqa yerdən götürülməmişdir. (çırağı yandırmaq üçün başqa nur mənbəindən istifadə edirlər).

B.414. Bu iki tikə (loğma) sözə sənin süfrən üçün tərtib verdim. Bu iki tikəyə əl dəyməyib və heç bir əluzunluq edənin əli ona çatmayıb. Şərhi: Şair iki tikə sözü (şahlıq və gədalıq) aşağıdakı beytdə bəyan edir:

Mayəsi şahlıqla gədalıq onun,
Məxzəni-əsrarı Xudalıq onun. (B.403.)

B.415. Gər duzu varsa – yə'ni, ürəyə yatan və şirindirsə (yuxarıdakı beytdə işlənən «iki tikə» sözə işarədir). Beytin mə'nası: Əgər sənin süfrən üçün tərtib verdiyim bu iki tikə [söz] duzlu və xoşagələndirsə ye, sənə nuş olsun; əgər duzsuzdursa, ümidvaram ki, xatirindən silinəcəkdir.

B.417. Dəbdəbə – qədimdə təntənə, şöhrət üçün çalınan təbl. Şair öz məmduhuna bəndəlikdən dəm vurmasını təntənə, şöhrət yayan təbl səsinə təşbih edir.

B.419. Xidmətim vəfa ilə başa çatar; yə'ni, bu xidmətin müqabilində bivəfalıq olmaz və bir nəticə ələ gələr. (Nizami bəlkə də Sultan Məhmud Ğəznəvinin Firdovsiyə etdiyi bivəfalığı xatırlamış və bu beyti demişdir).

B.420-421. Mədh deyən şairlər ki, bu əbədi dərgaha gəlib orada qalır və üzlərini o dərgaha qoyurlar, Nizamini görən kimi onu özlərindən böyük hesab edirlər və ayağa dururlar. Yə'ni, onların məqamı Nizaminin məqamından aşağıdır. Nizaminin məqamı özgədir və onların məqamı bir başqadır, onlar Nizaminin barabərində bir kəs hesab olunmurlar.

B.422. Mənzil – mövqe', məqam, mərhələ. Mərhələ – mənzil, məsafə. (gedilən yol məsafəsi). Bir mənzil 6 fərsəxdir və təxminən 36-km-ə bərabərdir. Beytin mə'nası: Mən onları bu mərhələdə (şairlik) tərk etmişəm, onları arxada qoymuşam və onlardan bir mərhələ qabaqdayam.

B.423. Söz əlması – sözün əlmas qılıncı. Sözü əlmasa təşbih etmişdir. (qiymətdə, möhkəmlikdə və itilikdə).

B.424. Bu – başqalarından bir mərhələ qabaqda olmağa işrədir. Payə – dərəcə, mənzilət. Beytin mə'nası: Hərçənd «başqalarından bir mərhələ qabaqda olmaq» məni tayımbərabərim olmayan bir dərəcəyə və mənzilətə yetirir, amma mənim ayağım bu mərhələdə dayanıb yerində durmur və yerində saymır, daha da yüksəklərə getmək fikrindədir. Yə'ni, başqalarından qabaqda olmağıma baxmayaraq, yenə ucalmaq və tərəqqi etmək arzusundayam.

B.425. Övc – səyyarələrin (xüsusən, Günəşin) ən yüksək vəziyyəti, mərkəzdən ən uzaq olan nöqtəsi. Məmduhunu Günəşə təşbih edir və deyir: Günəşin övcü bülənddir, mən ona tərəf uçmaq istəyirəm ki, öz himmətimdən bir səmər hasil edim.

B.433. Sözü saf çeşmə suyuna, özünü isə çeşməyə təşbih etmişdir. Beytin mə'nası: Sözü sənin qapına çeşmə kimi rəvan etmişəm və mən çeşmənin qumu kimiyəm ki, bu yerdə qalmışam. Yə'ni, çeşmənin qədr-qiyməti onun suyunun qədr-qiymətidir, yerdə qalanı qumdur.

B.434. Necə ki, Günəş zərrəni qəbul edir, ümidvaram ki, mənim sübh dualarım müstəcab olar və istədiklərim əməl libası geyinər.

B.435. Gövhər – şairin məmduhuna göndərdiyi sözlərə və şe'rlərə işarədir. «Xosrov və Şirin»də deyir:

Söz gövhərdir, [söz] deyən qəvvasdır,
Xas gövhər çətinliklə ələ gəlir.

Can cövhəri – şairin dediyi sözlərə və şe'rlərə işarədir. Qurşağın üstündə – yə'ni, kəmərindən asılmış (nəzər duası, gözmuncuğu). Beytin mə'nası: Ürəyim dərya olmuşdur və sənə söz gövhərləri nisar edir: sözlər və dualar ki, mənim ruhum mənziləsindədir, sənin üçün nəzər duası və gözmüncuğu hökmündədir.

## SÖZÜN FƏZİLƏTİ HAQQINDA

B.438. Allahın ilk yaratdığı şey əql olmuşdur, söz isə əqlin təzahürüdür. Ona görə də Nizami deyir ki, qələmin ilk hərəkətində onun yazdığı əvvəlinci şey söz olmuşdur. Həm də ilk yaranış Allah tərəfindən «kon» («ol») sözü ilə əmələ gəlmişdir. Ona görə də xilqətin əsası söz ilə bağlıdır.



Burada deyilən «qələm» Allahın Qələmidir ki, özünün divanxanəsində o, lövh üzərində ilk dəfə bütün Kainatın həyat və inkişaf məramnaməsini yazmışdır. Əlbəttə, bu yazılar sözdən ibarət olmuşdur; odur ki, ilk yaranış da sözdən başlamışdır. Nizami sonrakı beytlərdə bunları bəyan edir.

B.439. Xəlvət – tənhalıq; burada məqsəd odur ki: – Onda ki, tənha Allah var idi, heç bir şey vücuda gəlməmişdi. Cilvə – aşkar olma, peyda olma.

B.440. Ürək – insanlıq həqiqəti, natiqə qüvvəsi. Torpaq – insanın əslinə işarədir ki, torpaqdan yaranmışdır. Beytin mə'nası: İnsanı natiqə qüvvəsi fəzilət sahibi etmişdir və əsli torpaq olan insan o təbiətinə (keyfiyyətinə) görə şöhrət tapmışdır.

B.443. Nizami deyir ki, insan deyilən şey elə onun sözüdür, bədən isə onun canı üçün müvəqqəti bir ev – «mehmanxanadır». Doğrudan da insanı insanlıq dərəcəsinə çatdıran şey onun ruhu, canı və əqlidir; əql isə özünü sözlə aşkara çıxara bilir, insan söz vasitəsilə öz insanlığını sübuta yetirir, özünü heyvanlardan fərqləndirir. İnsanın canı olduqca söz deyib danışa bilir, canı çıxdıqda nitqi də kəsilir. Elə buna görə də Nizami deyir ki, «söz bizim canımızdır».

İnsanın ömrü qurtaranda bu müvəqqəti «eyvanı» tərk edib gedir. Necə ki, Cəlaləddin Rumi deyir:

Mələklər aləminin quşuyam, bu torpaq aləmindən deyiləm,
Bədənimdən iki-üç günlüyə mənə bir qəfəs düzəldiblər.

B.444. Söz quşu – söz quşa təşbih olunmuşdur. Şərhi: Nizami bu beytdə öz zamanında mövcud olan rabitə vasitəsinə işarə etmişdir ki, o dövrdə məktubla xəbər aparıb-gətirən göyərçinlərdən istifadə olunurdu. Nizami bundan özünə məxsus məharətlə belə bir gözəl təsvir yaratmışdır. Beytin mə'nası: Hər bir fikri və mətləbi xəbər vermək və bildirmək üçün sözdən (məktub, yaxud dil ilə) istifadə olunur.

B.446. Söz nə qədər ki, dil ilə deyilməyir, yaxud yazıya alınmayır, fikirdir; onda ki, dil ilə deyilir, yaxud yazıya alınır, sözdür. Yə'ni, fikir sözün əvvəli və söz fikrin axırıdır.

B.455. Sözün məqamı şə'nində söz çoxdur və müxtəlifdir.

B.456. Sözü – arğacı və ərişi can telindən toxunmuş parçaya (paltara) təşbih etmişdir. Bu iddianın doğruluğunu və bu təşbihin

dürüstlüyünü isbat etmək üçün deyir: Əgər belə olmasaydı, can bu telin əvvəlini (ucunu) tapa bilməzdi. (Yə'ni canın 'sözdən xəbəri olmazdı). Nizaminin bu beyti Fərruxi Sistaninin aşağıdakı beytini yada salır:

İnək karvanı ilə Sistandan yola düşdüm,
Ürəkdən eşilmiş, candan toxunmuş libas ilə.

B.457. Təbiət diyarı – təb' sahibi, zövq sahibi, şe'r demək istedadı sahibi olmaq. Şəriət möhürü – Allah hökmü, Qur'ani-Kərim.

B.460. Sözün peyki – qələm və dilə işarədir.

## MƏNZUM SÖZÜN MƏNSUR SÖZDƏN ÜSTÜNLÜYÜ

B.465. Sərsəri söz – vəznə çəkilməmiş, dərin düşüncə və sə'yin məhsulu olmayan söz.

B.466. Nüktə – lətif və gözəl söz. Mövzun – şe'r vəznində olan.

B.469. Şe'r – iki bərabər misrası olması səbəbindən tərəziyə təşbih olunmuşdur. söz tərəzisi – şe'rin əsası, əruz və qafiyə elmi.

B.471. Fikir atəşə təşbih edilmişdir; şairlər bu atəşlə müqərrəb mələklər dəstəsindən olurlar.

B.472. Pərdə – ilhama işarədir. Nubuvvət – burada, vəhyə işarədir.

B.473. Kibriya – Allah-təala. Səf – Allahın vəliləri.

B.474. İki məhrəmnəzər-peyğəmbərlər və şairlər. Məğz – peyğəmbərlərə, qabıq – şairlərə işarədir.

B.475. Xurma – şirin və gözəl sözə işarədir. Süfrə – şairlik süfrəsi nəzərdə tutulur. «Candan olan parədir» – deməklə Nizami şirin sözün can (ruh) kimi əbədiliyinə işarə (eyham) edir. Əsədi Tusi şirin sözü canın fərzəndi hesab edir:

Söz can kimidir, ona görə də köhnəlmir,
Çünki, şirin söz canın fərzəndidir.

B.476. Gil dimdiyi – yə'ni, dil,

B.477. Bir neçə acgöz məddah şairlər hikmət çeşməsi olan sözün suyunu (abrını) aparıblar.



B.478-479. Bu hücrə – bu dünyaya işarədir. Bu hücrədən artıq sərə – o dünyaya işarədir. Öz məişəti tə'minində mə'nəvi ehtiyacı olan bir şairin bundan artıq bir sarayı vardır. Əgər dizi üstü (yerdə dizləri bükülmüş vəziyyətdə oturmaq) vilayət fəth edəndirsə, şair öz başını heç bir qapının astanasına (Allah dərgahından başqa) qoymaz. Başqa sözlə, onda ki, başını dizinin üstünə qoyur, fikrə gedir və öz daxilində ğərq olur, söz vilayətinə sahib olur. Belə bir şəxs hər qapıya baş qoymaz.

B.480. Şair başını dizi üstə qoyub mə'nəvi seyrdə olduqda iki cahanı öz ağuşuna alır, yə'ni iki cahana sahib olur.

B.484. Gah bu hoqqəylə çıxar hoqqədən – yə'ni, bu oyunbaz fələklə oyunbazlıq edər; gah bir möhrədən oyunbazlar kimi on möhrə ələ gətirər, yə'ni bir möhrədən on möhrə edər. (necə ki, Günəş qürsü qurub etdikdə onlarla ulduz peyda olur).

B.485. Təb'atının cövlan etməsi – təb'in rəvan olmasına işarədir. «Leyli və Məcnun» məsnəvisində deyir:

Sözün meydanı geniş olmalıdır ki,
Təb'atı cövlan edə bilsin.

Onda ki, şair təb' atını cövlana gətirib şirin və gözəl şe'rlər deyir, ruh (can) onun dodaqlarını öpmək üçün dodağa gəlir. (bu şirin və gözəl şe'ri deməsi xatirinə).

B.486. Lə'l – lətif və gözəl sözə işarədir. Çərx yumurtası – Günəşə işarədir. Qədimdə bu fikirdə idilər ki, lə'l mə'dəndə Günəş şüalarının tə'sirindən yaranır. Mövləvi «Məsnəvi» də deyir:

Çox illər gərəkdir ki, Günəşin tə'sirindən,
Lə'l rəng və parlaqlıq tapsın.

B.491. Müştəri – Bərcis ulduzu; ona fələkin qazisi və Sə'di – Əkbər də deyirlər. Bu sehr – yə'ni, söz cadusu. Zöhrə – Nahid; fələkin mütribi və nəvazəndəsi adı ilə məşhurdur.

Harut – Babil ğuyusundan başı aşağı asılmış iki mələkdən birinin adıdır, onlar Allahın əzabına giriftardırlar. Deyirlər ki, cadugərlik onların vasitəsilə yerdə rəvac tapmışdır. (Kəşf-ül əsrar, c.1. səh. 295)

B.492-498. Bir neçə məddah şair sözü abırdan saldı, onlar sözün suyunu (abrını, şərəfini) bir tikə çörəyə satdılar. Bu

dəstədən olan şairlər sözün ayağına dügün vurub onu dustaq etdilər. Bunlar sözü israf edib yersiz xərc etdilər və qızıla satdılar, söz sikkəsini rövnəqdən, şairliyi və şe'ri abırdan saldılar. Günəş kimi rövşən bir sözü daşa (yə'ni, qızıla) verən kəslər şəbçırağı (yə'ni, gözəl və rövşən sözü) bir daşa dəyişdirdilər.

B.500. O kəs ki, sultandan zərbaf libas alıb geyinir, axırda həmin sultanın qılıncından, yaxud oxundan yara alır. Necə ki, Əmir Müizzi ilə belə bir təsadüf baş vermişdi: Sultan Səncərin kamanından çıxan bir ox şairin sinəsinə sancılır. Hərçənd şair aldığı yaradan həmin ləhzə ölmür, amma bir müddət sonra həmin yara səbəbindən dünyadan gedir.

Əmir Müizzi bir qəsidəsində bunu nəzmə çəkmişdir:

Allaha şükr ki, sultanın oxu ilə
Mən bəndə günahsız, müftə ölmədim.

B.504. Şəriət elmlərini mükəmməl bilməyincə şairliyə meyl etmə. (Beytdə – «şər'», «şe'r» və «ərş» kəlmələri ilə «məqlub» sən'əti işlənmişdir).

B.505. Cövza–Cəbbar (Orion) bürcüdür ki, ona Cövza da deyirlər. Ayaq üstə dayanmış, belində qılınc və əlində əsa tutmuş adama bənzəyir. Onun belində (kəmər yerində) Nizam, Nitaq və Mintəqə adlı üç ulduz vardır ki, ortadakı ulduza «Nitaq-ül Cövza» (Cövza kəməri) deyirlər.

B.506. Şe'r səni şəriət səbəbindən, dinin bərəkətindən sidrənişinlik məqamına yetirər, dərgaha müqərrəb edər.

B.507. «Əş şüəraü üməra-ül kəlam» – şairlər sözün əmirləridir. (Peyğəmbər əleyhissəlamın dilindən hədisdir). Şe'r ilə əmirlik məqamına yetərsən; çünki, şairlər sözün əmirləridir.

B.508. Aram oturma, çünki fələk də hərəkətdədir, fələk məqamına ucalan və şirin söz deməyə sə'y et.

B.509. Başını sal yana – yə'ni, təvazökar ol.

B.512-514. Yaxşı bir söz (şe'r) dedikdə fəxr etmə, hər sözü tez pəsənd etmə ki, sözün məqamını uca edə bilərsən. Hər kəs bu yolu (gec pəsənd etmək yolunu) tutsa, Günəşdən və Aydan zirək olub topu aparar; başqa sözlə, sözü fələkdən yüksəyə qaldırar.

B.517. Cəbrail və İsrafil– hər ikisi müqərrəb mələklərdir.

B.518. Şairlik riştəsini hər yetənin əlinə vermə və şe'r xirmənini payimal olmağa qoyma.



B.521-522. Mənim şe'rim arifanə bir ibadətgah bünyad etmişdir və şairi meyxanədən (yə'ni, saraydan və mədhiyyə zəncirindən) azad etmişdir. Zahid öz xirqəsini və rahib (məsihi) öz zünnarını atıb (yə'ni, özlərindən mücərrəd olub) tələsik mənə tərəf gəlir.

B.524. Mənim şe'rimin avazı İsrafilin Suru kimi ölüləri də dirildər. (İsrafil Qiyamət günü Suru çalacaq və ölülər dirilib məhşər ayağına gələcəklər).

B.525. Bütün bədəni və canı olanlar mən söz cadugərinə məftundurlar.

B.527. Zöhrə dastanı: Kitablarda nəql olunan hədislərə və müfəssirlərə görə, asimanın mələkləri bəni-adəmin zülmündən, qan tökməyindən, pozğunluğundan və digər pis əməllərindən təəccübləndilər və dedilər: Xudavənda, bu torpaqdan yaratdıqlarını və torpaqda yaşayanları bəyənib hamıdan artıq qərar verdin, onlar Sənin fərmanına itaət etmirlər. Rəbbüləaləmin dedi: Əgər onlarda olan şəhvət sizdə olsaydı, sizin halınız da onların halı kimi olardı. Hamı dedi: Sənin eybsiz və pak dərgahına şükr olsun. Biz sənə asi olmarıq və Sənin fərmanına xilaf iş görmək layiq deyildir. Rəbbüləaləmin dedi: Gedin, aranızdan iki mələk ayırıb gətirin, onlara bəni-adəm sifəti və şəhvət verək. Harut ilə Marutu seçdilər ki, hamıdan artıq müt'i və idabətkar idilər. Allah-təala adəm övladında olduğu kimi onlarda şəhvət yaradıb Yerə, xalq içində yaşamağa göndərdi və buyurdu: Şirk qərar verməyin, zina etməyin, şərab içməyin, nahaq qan tökməyin, donuz əti yeməyin, cövr və cəfanı xoşlamayın. Onlar gəldilər, xalq içində oldular və bir gün onların yanına çox gözəl bir qadın gəldi. O qadının məhəbbəti onların ürəyinə düşdü və bir-biri ilə sözləşib onu öz evlərinə gətirdilər və ondan kam tələb etdilər. O qadın başına döyüb fəryad etdi, sonra dedi: Əgər sizin məndən muradınız varsa, gərək bütpərəst olasınız,şərab içəsiniz, qatil olasınız. Onlar dedilər: Bu bizim işimiz deyil, bizi bunlardan nəhy ediblər. O gün keçdi, o biri gün yenə bu söhbət təkrar oldu və cavab həmin oldu. Sonrakı üç gün həva (şəhvət) son həddə çatdı və onların səbri tükəndi. Dedilər ki, bu deyilənlərdən şərab içmək daha asandır (yüngüldür); bilmədilər ki, şərab içmək bütün cinayətlərin mayəsidir. (Peyğəmbər əleyhissəlam şərabı «ümmulxəbais», yə'ni, «xəbislər anası» adlandırmışdır). Şərab içdilər, məst oldular və o qadından öz kamlarını aldılar. Bu vaxt

onlara bir nəfər yaxınlaşdı; bu əhvalatı aşkar edəcəyindən qorxaraq, onu qətlə yetirdilər. Bələliklə, həm qətl, həm zina, həm də şərab içmək onlardan vücuda gəldi. Xudavəndi-aləm bu halı asimanın mələklərinə xəbər verdi və onları bu vəziyyətdə gördülər... və Allah-təala o qadının surətini dəyişdirib ulduz etdi; indi o, parlaq ulduzdur, ərəblər ona Zöhrə, əcəmlər isə Nahid deyirlər.

Harut və Marut öz bəd əmməllərinə görə (deyildiyinə görə, tilism və cadugərliyi xalqa onlar öyrətmişlər) Qiyamət gününə qədər Babil quyusunda başı aşağı asılmış vəziyyətdə qalacaqlar.

Ulduzlara nur – burada, Günəşdən nur alan səyyarələr nəzərdə tutulur və «xatirim» deməklə şair öz şe'r demək iste'dadına (təb'inə) işarə edir və nəticədə öz təb'ini Günəşə təşbih edir.

Beytin mə'nası: Nizami kimi söz sehrkarı olan bir şairin yaşadığı dövrdə Gəncə şəhəri Harutu yandırır, yə'ni, Harut öz-özünə yanır və həsəd aparır ki, Gəncə şəhərində Nizami kimi söz sehrkarı olan bir şair vardır. Nizami isə fəryad edib deyir ki, Gəncə mənim üçün Babil və Babil quyusu kimidir. Mən bü şəhərdə şəhrbənd (dustaq) olmuşam və bir yana çıxa bilmirəm. Qeyd edək ki, şair bütün əsərlərində Gəncədə şəhrbənd olmağından dönə-dönə şikayət etmişdir.

B.528. Zöhrə – şairin zövqünə işarədir. Məntəqə – Gəncəyə işarədir. Mizani -ölçülmüş, vəznli. Məntiqi ruhanidir – sözü, bəyanı dinidir.

B.529. Həlal sehr – şe'r və fəsih söz. Sübh vaxtı olan nuş –oruc tutanların sübh vaxtı yedikləri təam. Nəsx qılır – yə'ni, batil edir. Nüsxeyi-Harut – Harutun cadugərlik üçün yazdıqları və öyrətdikləri.

B.530. Şəkli-Nizami –Nizaminin surəti və çöhrəsi; burada bədən (cism) mə'nasındadır. Sehri-həlal – şe'rə işarədir.

## ÜRƏYİ DƏRK ETMƏK VƏ HƏQİQƏTLƏR TƏLƏBİNDƏ

B.531. Qalxanı atmaq – məğlub olmaq, təslim olmaq; burada, Günəşin ğürub etməsinə işarədir. Qalxanı suya atmaq – zəif və natəvan olmaq.

B.533. Onun ləşgəri – yə'ni, Günəşin ləşgəri. (ulduzlara işarədir). Xəncər çəkmək – ulduzların parlamasına işarədir.

B.534. Muncuq – əsasən ağ və mavi rənglərdə olan möhrədir ki, göz dəyməmək üçün at, öküz və digər heyvanların boynundan asılardı.



B.535. Gecə tifli – gecəni tiflə (körpə uşağa) təşbih etmişdir. (gecə fələkin qucağında qərar tutmuşdur). Gündüz – zəngə (zınqırov) təşbih olunmuşdur və Günəşə işarədir. Gecə, Yer kürrəsinin konus şəklində olan kölgəsidir ki, onun başı asimana tərəfdir.

Körpə uşaqları məşğul etmək üçün ayaqlarına zəng bağlardılar. Şair gecəni sinəsi üstə (üzü üstə) düşmüş, iməkləyən (sürünən və yol gedən) və əlini dayəyə (asimana) tərəf uzatmış bir uşağa təşbih etmişdir. Dayə isə uşağı məşğul etmək üçün Günəş zəngini gecə uşağının ayağına bağlamışdır ki, onun səs-sədası ilə dolansın və onu heç cür tuta bilməsin.

B.536-537. Sövda – malixulya xəstəliyi; beyin pozğunluğu (iltihabı) ilə əlaqədar pərişanlığa və divanəliyə səbəb olur, hətta ölümlə nəticələnir. Mə'cun – bir neçə tərkibdən hazırlanmış dərman. Fərəh mə'cunu – müfərrih; təngnəfəsliyi və ğəmginliyi aradan qaldırır, şadlıq əmələ gətirir. İsa yeli – İsanın ölünü dirildən nəfəsi.

Beytin mə'nası: Dayə, gecə uşağının sövdasına əlac etmək üçün torpaqdan şəfa bəxş edən mə'cun düzəltdi və bu mə'cun Məsiha kimi öz nəfəsindən sövda atəşinə su səpib onu söndürdü.

B.540. Batinini çəkdi üzə zahirən – yə'ni, daxili mahiyyəti aşkar oldu. Hökm – hökmi-ilahi, qəzavü qədər. «Kanə min əl kafirin» – Qur'ani-Kərimin 38-ci (Sad) surəsinin 74-cü ayəsinə işarədir: «Yalnız İblisdən başqa! O [səcdə etməyə] təkəbbür göstərdi və kafirlərdən oldu».

B.541. Oyun – gecə oynanılan oyundur ki, pərdə dalından surətlər (kölgələr) göstərirlər və bu Ayın işığı vasitəsilə olur.

B.542. Şəbrəm – çöllərdə bitən, qədim təbabətdə qulunc, məfasil (sümük birləşmələri bəndləri, oynaq) və s. xəstəliklərin müalicəsində istifadə olunan bir bitkidir. Zöhrə – Zöhrə ulduzunu əlində dəf tutmuş mütrib qadın kimi təsvir etmişdir.

B.543. Şair deyir ki, mən o gecə mə'nəvi bağın bülbülü idim.

B.544. Saçdı nə atəş cigər ümmanı gör! – qan-yaş töküb ağlamağa işarədir.

B.545. Bu dügün – ğəm və kədərə işarədir.

B.547. Sənin pak atəşin vardır, nə üçün ağlayırsan? Torpaq – bədənə işarədir. Yel atı – ah və naləyə işarədir.

B.548. Təb gətirən torpağı tabutə ver – yə'ni, bədənini ölü təsəvvür et. Nur saçan atəşi yaqutə ver – yə'ni, sənin vücudunda

ki, ülvi bir cövhər vardır, daşı gövhər ilə dəyişdir. (Nür saçan ataş Günəşin nuruna işarədir və burada Nizaminin vücudu Günəşə təşbih olunmuşdur).

B.549. Ox az at – yə'ni, bədgüman olma.

B.550. Bir kəsin ayağında (qapısında) suyunu tökmək – xidmət etmək deməkdir. Beytin mə'nası: Əgər xidmət etmək bacarığın varsa, bu xidməti ürək xüsusunda yeinə yetir; yə'ni ürək xidmətində ol.

B.551. Mavi küp – asimana işarədir.

B.552. Beş yolvuran əntər – insanda olan beş duyğu: görmə, iybilmə, dadbilmə, eşitmə və toxunma. Yolvuran – burada üç mə'nada işlənmişdir: Birincisi–oğru, yolkəsən; ikincisi – avaz oxuyan; üçüncüsü–yoldan çıxaran. Yuxarıdakı beytdə küpün içində xoş avaz ilə oxumaqdan və səsin yaxşı yayılmasından söhbət getdiyini nəzərə alsaq, bu beytdə «yolvuran» ifadəsindən məqsəd «avaz oxuyan»dır; çünki, ikinci misrada «yol» nəğmə mə'nasında işlənmişdir.

B.553-555. Ərşdə pərvaz edənlər bədən yükündən xilas olub dərgaha müqərrəb olurlar və onlar mələklərdən də artıqdır. İki aləmdən üz döndərənlər ürəkdən aldıqları ruzi ilə dolanırlar. Göz və qulaq arzu olunan həddə deyil, onlar ancaq hissiyyat (duyğu üzvləri ilə dərk olunan) aləmi üçündür.

B.556. Göz nərgisə bənzədilmişdir. Çiçək – gözün xaricində əmələ gələn ağ, yaxud qırmızı civzələr, çiçək xəstəliyi.

B.557. Gül və nərgis – qulaq və göz (istiarə kimi işlənmişdir).

B.559. Dəllallıq – vasitəçilik. Qırx ilə yığılan – ömr nəqdidir.

B.566. İlk səhər – sübhi-kazib, səhərin açılmasından bir az əvvəl olan ala-toranlıq. Sonrakı – yə'ni, sübhi-sadiq, həqiqi sübh, dan yeri sökülən vaxt.

B.571. Bir-iki aludə dost – beş duyğu üzvü. Həlqə tək qapı üstə qərar etmək – hərəkətsiz olmaq.

B.572. Bu su ilə – yə'ni, bu şərəf ilə.

B.573. Surətü can mülkü – maddi aləm və ruh aləmi.

B.574. Kərəm – bəxşiş. bir gilə – bir qətrə kərəm feyzidir ki, Allah-təala bütün Kainatı ondan xəlq etmişdir.

B.575. Xələf – layiqli və pərhizkar fərzənd. Xilafət – padşahlıq.

B.576. Ürək xütbəsi sultanidir, yə'ni, insan bədəninin sultanlıq xütbəsi ürək adına oxunur. Xətiblər xütbə oxuyan vaxt Allaha həmd və Peyğəmbərə nə'tdən sonra xütbədə zamanın padşahı olan xəlifənin adını çəkirdilər və bu, qüdrət və hakimiyyət nişanəsi, həmçinin xalqın bey'ət əlaməti hesab olunurdu.

B.577. Ədim – aşınmış xoş ətrli dəri. Süheyl – Gəmi bürcündəki parlaq ulduzdur ki, yay fəslinin axırında tülu' edir və meyvələr o vaxt yetişir. Yəməndə çox yaxşı müşahidə olunur, buna görə də ona Süheyli-Yəmani deyirlər. Süheylin nuru bə'zi vaxtlarda və bə'zi nöqtələrdə dəriyə yaxşı tə'sir edir, bə'zən də pis tə'sir edir. Sə'di deyir:

Süheyl parlayıb bütün aləmə özünü göstərir,
Bir yerdə dağarcıq edir, bir yerdə ədim.

Tüfeyl – çağırılmayan yerə qonaq gedən adam, müftəxor.

Ğ.578. Dimağ – beyin. Yağın çırağa yetməsi – çırağın nurunun artmasına işarədir; burada, mə'rifətə yetmək və bəsirət mə'nasındadır.

B.579. O məclisdə başdan-ayağa qədər qulaq oldum və can hatifinin dediklərini ürək qulağı ilə dinlədim.

B.580-581. Mə'nəviyyatdan daha artıq bəhrələndim və şirin sözlü oldum. İsti bulaq – gözə işarədir. Soyuq su – göz yaşına işarədir. Bədənim ürək eşqindən, yə'ni, ürəyi ziyarət etmək eşqi ilə qaynar qazan kimi idi.

B.582. Yolvuran – duyğu üzvlərinə işarədir.

B.585. Ruh tağı – ürək mehrabı. Döndü topa çovgan olan qamətim – yə'ni, başımı dizimin üstünə qoydum.

B.586. Başımı əllərim arasına alıb alnımı dizimin üstünə qoymuşdum.

B.587. Nizami topu təsvir edir. Kürrəvi cismlərin, o cümlədən, topun hər bir nöqtəsini həm onun başı, həm də ayağı hesab etmək olar. Çovganın başı ayaq şəklindədir. Nizami bu beytdə öz oturduğu vəziyyəti (başı iki əli arasında və alnı dizinin üstündə) iki şeyə – əvvəl topa, sonra isə çovgana təşbih etmişdir.

B.588. Şair demək istəyir ki, kəsrəti vəhdətdən bir nümunə (timsal) görürdüm və bir şey (həqiqət) yüz şey şəklində olmuşdu.

B.589. Həmsəfər – əql və batini hisslərə işarədir. Batini hisslər: hissi-müştərək, xəyal, vəhm, hafizə, mütəsərrifə.

B.593. Tərkib – cismdə mövcud olan maddələr. Pərdədən azad elədi tərkibi – yə'ni, məni maddədən mücərrəd etdilər.

B.597. Yeddi xəlifə (ruh xəlifələri) – yeddi üzvdən ibarətdir: ürək, ağ cigər, qara cigər, öd, dalaq, böyrək, mə'də.

Yeddi nağıl – yeddi xəlifə bir əsli əfsanənin (insan ruhu) yeddi fər'i (budağı) mənziləsindədir.

B.598. Mülk – bir padşahın hökmranlığında olan məmləkət. Dövlət olan mülk – yə'ni səadət mülkü cahanda deyil, bu torpaqda – ürək vilayətindədir.

B.599. Nəfəsabad – ağ cigərə işarədir; bəqası və abadlığı e'tibarı ilə nəfəslə əlaqədardır. Yarımisti – nəfəs çəkdikcə içəri daxil olan oksigen (hava) qismən bədənin istisinə məsrəf olunur və digər hissəsi nəfəslə bədəndən xaric olur. Başda – yə'ni, yuxarı başda (burada, sinə nəzərdə tutulur). Günorta şahı – Günəş (bu mə'nada ki, günorta ən hərarətli olan xətdir və Günəş həmin nöqtədə həmişə eyni yüksəklik dərəcəsində olur). Burada «günorta şahı»ndan məqsəd – ürəkdir.

B.600. Qırmızı atlı – qəlb. Lə'lqəbalı – qara cigər.

B.601. Təlx cavan – öd kisəsi. Xılt yeyən həbəş – dalaq.

B.602. Əldə kəmənd tutan – mə'də. Simzireh misbədən – böyrəyin üstünü örtən piy pərdəsi və böyrək.

B.606. Ürək öz dili ilə dilə gəlib dedi: – Quş (ruh, həqiqi mə'rifət) tələb et, bu bədən yuvasından uç.

B.607. Mənim atəşimin tüstü ilə nisbəti yoxdur; başqa sözlə, mənim atəşim sənin bildiyin atəşdən deyildir. Tazə duz – ruh, can. Tazə duz, duzlanmış ilə müqayisəyə qabil deyildir; çünki, duzlanmışın duzu olsa da, duz deyildir.

B.609. Qarun – rəvayətlərə görə Həzrəti – Musanın müasiridir, bə'ziləri isə onu Musanın əmisi oğlu hesab edirlər. O, var-dövlətə həris, paxıl, xəsis və həddən artıq sərvət sahibi olmuşdur. Belə ki, onun xəzinələrinin açarlarını bir neçə pəhləvan yerdən güclə qaldırardı.

Ona çox öyüd-nəsihət verdilər ki, dünya malına məğrur olma, malını xalqın xeyri yolunda sərf et, qəbul etmədi. Hətta, Musaya qarşı əxlaqsız bir qadınla hiylə qurdu ki, Musanın qövmünün hüzurunda Musadan şikayət etsin və onu zina etməkdə ittiham etsin. Sabahı gün sübh açılanda Qarun bəni-İsrail camaatının qabağında üzünü Musaya tutub dedi: Aya, Tövratda varid olmayıb ki, zina edən şəxsi səngsar (daşqalaq) etmək lazımdır? Musa dedi: Bəli. Qarun dedi: Onda sən Tövratın hökmünə və öz dediyinə görə gərək daşqalaq olasan, çünki filan qadın ilə zina etmisən. Musa qadını hüzuruna tələb etdi və ona and verdi ki, işin həqiqətini camaatın hüzurunda bəyan etsin. Qadın dedi: Qarunun dedikləri iftiradır və şəhadət verirəm ki, Qarun yalançı, Musa isə pakdır. Bu əhvalatdan sonra Musa onun haqqında



qarğış etdi. Xudavənd güclü zəlzələ yaratdı və yer Qarunu, evini və xəzinələrini öz ağuşuna çəkdi.

Beytdə deyilir: Mən Qarunun xəzinəsi deyiləm, səninlə olmasam belə, səndən xaric də deyiləm.

B.610-611. Onun isti nəfəsi (tə'sirli sözləri) məni utandırdı, mən xamuş oldum və həyadan ona bəndəlik həlqəsini ədəb qulağıma saldım.

B.612. Qərar – əhd, peyman.

B.613. Riyazət – nəfsi ram etmək yolunda çəkilən zəhmət, pərhizkarlıq.

## BİRİNCİ XƏLVƏT

B.614-616. Ustad – bu söz orijinalda «rayiz» kimi getmişdir və dəvəni, atı və s. heyvanları ram edən mə'nasındadır. Biz bu sözü «ustad» kəlməsi ilə əvəz etməyi münasib bildik. Burada söhbət riyazətdən gedir və şair deyir: Bu kəndir – yə'ni riyazət kəndiri düyünlərlə dolu idi, yə'ni dünyəvi əlaqələr çox möhkəm idi və bu düyünlərin açılacağını təsəvvür etmək olmurdu.

B.617. Xacə – ürək. Xudavənd – sahib.

B.612. Torpaq – bədənə işarədir.

B.622. Misr – bədənə işarədir. Zindan – bədənə işarədir.

B.623. Uyquya çəkdi gecə göz gövhərin – yə'ni, gecə sona yetdi və sübh açıldı.

B.624-625. Sübh gecənin qaranlığını nur ilə əvəz etdi. Xacə bir əli çırağın (burada «çırağ» sözündən məqsəd «eşq»dir və şair 631-ci beytdə – eşq o yerə çəkdi ki axır ələm – bunu aşkar deyir) yaxasından, o biri əli ilə mənim əlimdən tutub bir bağa gətirdi.

B.628. Bağrı yanan və belinə xidmət kəməri bağlayan bir aşiq oldum.

B.630-632. Hər tərəfə gedib fəxr edirdim və nazlanırdım. Nəhayət, eşq elə bir yerdə öz bayrağını qaldırdı ki, vəfa (dostluq, səmimiyyət) nişanəsi göründü və mehin mülayim, ürəyə yatan sözləri İsa nəfəsi kimi mənim ürəyimə can verdi.

B.634. Piyadə ol və özünü özündən kənar et; yə'ni, tamamilə mücərrəd ol.

B.639. Vüs'əti çox idi və fələk xətti dairəsi ilə çəkilmişdi.

B.643. O çəmənin tər-təzə otları şir kimi əlində şəkər tutmuşdu; yə'ni tər-təzə otlar şirin şirə ilə dolu idi.

B.648. Həzrəti-İsa beşikdə danışmışdır. (Bu barədə Qur'ani-Kərimin 19-cu (Məryəm) surəsində ayələr vardır). Həzrəti-Musanın mö'cüzələrindən biri o idi ki, əlini qoltuğuna salıb çıxarardı və əlindən nur parlayardı.

B.649. Faxtə – qümri; göyərçindən kiçik, boynunda tövq (həlqə) nəqşi olan torpaq (kül) rəngli quşdur.

B.652. Türk səmən – yə'ni, ağ rəngli səmən gülü. Aypara – bayraqların başına və çadırların sütununun üstünə bərkidilərdi.

B.655. Qaqum – ət yeyən məməli heyvandır; onun dərisi ağlığı və yumşaqlığı ilə məşhurdur. Sincab – çox gözəl (kül rəngli) dərisi vardır. Bu beytdə səbzəyə işarədir.

B.656. Bağın müəyyən yerlərində tikanlardan çəkilən çəpərlər şəbəkəsində olan dəlik və yarıqlar. Al-sarı ələm – qırmızı və sarı güllərə işarədir. Pəncərələr – şəbəkələr. Göy sarı – yə'ni, səbzəyə tərəf, çəmənə tərəf.

B.657. Dirəm – ağacın ayağına tökülən yarpaqlara işarədir (ağacın ayağı kölgənin çox olduğu yerdir).

B.658. Nəsimin tə'sirindən yarpaqlar tərpənirdi və kölgələr hərəkət edirdi; Günəşin nuru kölgə ilə bərabər olurdu, guya kölgə Günəşin nurunun kənarı ilə söhbət edirdi.

Suyu zikr edən kəsə (zikr edən kəsin əlində təsbih olur və etdiyi zikrləri təsbihin danələri ilə sayır) və qum dənələrini təsbihin danələrinə təşbih etmişdir. Mə'nası: suyun etdiyi zikrin tə'sirindən qum dənələri hərəkətə gəlirdi və suyun axarı ilə gedirdi.

B.659. Göncə qolunu gülün boynuna salmışdı və uşaq kimi gülün sinəsində qərar tutmuşdu. Gül ğönçənin başını-gözünü öpürdü və gülün dodağı bu təmasdan ğönçənin kirpiyi ilə yaralanmışdı. Sünbül, nəsrindən busə aldı və sünbül «qılınclı» olduğu üçün bu busədən nəsrin yara aldı.

B.661. Söyüdün bədəni sehrdən əsirdi, sehri onun bədənindən çıxarmaq üçün lalə öz məcmərindən (manqalından) ona tüstü verirdi.

B.663. Gül kürəni – gül kürən (sarı) ata təşbih edilmişdir.

B.665. Süfrəsi göy riştəli busitan – çəmən. Ərşin ürəyi – Günəşə işarədir. Dörd ünsür (su, torpaq, külək, od) nəzəriyyəsinə görə onların bir-biri ilə düyünündən (bağlılığından, rabitəsindən) səbzə göyərir.

Fərşin canı – yə'ni, Yerin (torpağın) canı; suya işarədir. Burada Qur'ani-Kərimin 30-cu (Rum) surəsinin 24-cü ayəsinə işarə olunur: «Sizə həm qorxu, həm də ümid verən [sizi vurmasından qorxduğunuz, dalınca isə yağış yağmasına ümid bəslədiyiniz] ildırımı göstərməsi, göydən yağmur endirib öləndən sonra [onunla] torpağı diriltməsi də Onun qüdrət əlamətlərindəndir».



B.670. Huri gözü – dirilik suyu çeşməsinə işarədir. Gün bulağından aparırdı nuru – yə'ni, Günəşin nurunu rövnəqdən salırdı.

B.673. Qırqovul sərv ağacını çox sevir və onun başında oturur. Ona görə də ovçular qırqovul ovlamaq üçün meşədə sərv ağacı axtarırlar. Turacın dırnaqlarının izi və yeri zəncir həlqələrinə bənzədiyinə görə şair onu zəncirə təşbih etmişdir. Mə'nası: Turac sərv ağacının altından yol keçirdi və onun ayaqlarının izi sərvin ayağına bağlanmış zəncirə bənzəyirdi. Həqiqətdə isə qırqovulun qanının tökülməsinə sərv səbəb olmuşdu və buna görə də turac sərvi zəncirə çəkmişdi.

B.674. Çəmən qaziləri – quşlara işarədir; burada quşlar şəriət hökmü (fətva) verən qazilərə təşbih olunmuşdur.

B.675. Bayquşun ürək sirri – bayquşun nəhs olmasına işarədir. Belə hesab edirlər ki, əgər abad bir yerdə otursa, tezliklə xaraba olar.

B.680. Kəndiri zər Yusif – Günəşə işarədir. Səmən – ağ, sarı və qırmızı rənglərdə olan xoş ətrli güldür.

B.681. Qədimdə yəhudilər müsəlmanlardan fərqlənmək üçün öz libaslarının üstünə sarı rəngli parça tikərdilər. «Yədi-beyza» – ağ əl; Həzrəti-Musanın mö'cüzələrindən biridir ki, əlini qoltuğuna qoyub-çıxardıqda Günəş kimi parlayardı.

B.684. Günəş – çörək qürsünə və Ay – o çörəyin dodağını (kənarını) dişləyənə təşbih olunmuşdur. Ay hilal şəklində idi və buna səbəb Günəşin parlaqlığı idi.

## HƏQİQƏT MÜŞAHİDƏSİNDƏ

B.691. Ayın işığı kətan parçanı (paltarı) üzdüyü kimi, o ayın (gözəlin) gözəlliyinin fitnəsi Ayı yandırıb-yaxdı. Belə təsəvvür edirdilər ki, Ay işığı kətan parçanı üzür.

B.693. Onun gözəlliyinin nurunun tə'sirindən göz yaşı tökdülər.

B.694. Duzla qarışmış şəkər – məlahət və şirinlik; şirin təbəssüm və ürək açan sözlərə işarədir. Onun məlahəti və şirinliyi gözəl üzlülərin şirinliyini və rövnəqini aparmışdı.

B.698. Təbərxun – qırmızı rəngli bərk ağac; qırmızı söyüd, innab ağacı; keçmişdə quş ovlamaq üçün alət. Təbəri – Təbəristana (Mazəndarana) məxsus, təbəristanlılar kimi. Mərcanı – yə'ni, dodaqları. Təbərzəd – nəbat, ağ qənd.

B.700. Gündüzü sədəfə təşbih etmişdir. Sədəfin daxili ağdır və Günəş də sədəfin içində iri dənəli bir mirvari mənziləsindədir; amma sədəfin xarici qara rəngdədir.

«Leyli və Məcnun»da deyir:

Gecə, kürəyinin sədəf kimi qaralığı ilə
Balıq və Ay ilə küştü tuturdu.

Adətən, ğaliyəni sədəfin içində hazırlayardılar. Nizami «Şərəfnamə»də deyir:

Çərxin Ayı sanki sədəf idi,
Kərx əttarı onda ğaliyə hazırlayırdı.

B.701. Çiçək – çopur, çiçək xəstəliyi.

B.702. Cəz'– ağ və qara rəngdə olan ziynət daşıdır (oniks). Ona süleyman möhrəsi və yəmən daşı da deyirlər; gözə işarədir. Lə'l – qırmızı rəngli qiymətli daşdır; mə'şuqun dodağına işarədir.

B.706. Ağız mücrüsündə möhrə (inci kimi dişlər) olduğu üçün bağlamışdı və bir möhrə ölçüsündə çıxış yolu qoymuşdu.

B.707-708. Sifəti (surəti) pul kisəsinə, bədəni isə həlqəyə təşbih etmişdir. Mə'nası: Onda ki eşq o hoqqə və möhrəni gördü, süfrə açıb oyunbazlıq etməyə başladı. Necə ki oyunbazların ətrafına toplaşıb, bir qədər tamaşa etdikdən sonra bellərindən pul kisəsini açıb onlara pul verirlər, mən də eşqin oyunbazlıq etdiyini görüb kəmər və həlqə kimi belimdə və ruhumun boynunda olan surət kisəsindən və maddi bədəndən mücərrəd oldum.

B.709. Dirilik suyu içində və ürək məhzərində idim, cismani əlaqələrdən mücərrəd olmuşdum. Amma, su adamın başından aşdıqda ğərq olduğu kimi, mən də bu gözəllik və şadlığın şiddətindən elə bir halətdə idim ki, ğərq olmağa başladım və iş o yerə yetdi ki, səbr cilovunu əldən verdim.

B.710. Əqlimizi cin vurdu və divanələr kimi zəncirə çəkdi. Əfsungər cini (pərini) vird ilə (dalbadal təkrar olunan dua və yaxud əməl ilə) xoş əhval və səlamətlik bəxş etmək üçün çağırır. Burada isə tamamilə tərsinə alınır – pəri əql əfsungərini zəncirə çəkir.

B.711. Ğəmə şadlıq ilə çarə etmək istəyən ürək bihudə bir iş gördü; bu, Günəşin üzünü palçıq ilə örtməyə bənzəyir.



B.715. Pərdədə oturan o gözəl üzlü saflığı göstərən güzgü idi; yə'ni, saf bir ürək idi. İxlas – saf dostluq, pak əqidə, fəqət Allahı tələb etmək. Fəzil ibn Əyaz deyir: «Adamların xatirinə bir əməli tərk etmək – riya, onların xatirinə yerinə yetirmək – şirkdir. İxlas – bunların hər ikisindən xilas olmaqdır».

B.716. Fikrə getdim və mə'rifətə yetdim.

B.717. Yəqin – bəsirət.

## GECƏ İŞRƏTİ VƏSFİNDƏ

B.719. Xacə – ürək. Bir gecə ürək həmdərd və həmdəm olmaq arzusu ilə öz dostları ilə məclis qurdu və bir yerdə oturdu.

B.722. Buxur – yandırıldıqda xoş ətr saçan hər bir maddə (ud, səndəl və s.). Yusifin köynəyi – Yusifin həmin köynəyi ki, Həzrəti-Yə'qubun gözləri onun ətri ilə yenidən nur tapmışdı.

B.723. Şihnə – gecə keşikçisi (gecə şihnəyə təşbih olunmuşdur).

B.724. Pərdə qananlar – musiqişünaslar; ariflər. Pərdə tutanlar – xəlvətdə oturanlar; sirlərə məhrəm olanlar.

B.725. Nət' – üstündə oturmaq üçün aşılanmış dəridən olan fərş. Süheyl dəri fərş üstündə rəqs edirdi və sitarələrin başına lə'l səpirdi (yətim dürr– burada, ulduzlara işarədir).

B.726. Cigər şəm'i – cana işarədir. «Xosrov və Şirin»də deyir:

Ruhun ağacına cigərdən su verdi,
Əqlin çırağına gözdən piy verdi.

Ürək atəşi – eşq.

B.727. Məcmər – mənqəl, buxurdan. Adətən, məcməri təbəqin içinə qoyub məclisə gətirirdilər ki, döşəməyə od düşməsin və udun yaxşı yanması üçün şəkərdən istifadə edirdilər. Udu şəkərlə qarışdırardılar, sonra yandırardılar. Təbəqin içində olan məcmərin yanında ud və şəkər qoyardılar ki, lazım olduqda odun üstünə atsınlar. Nizami bu beytdə həm məcmərdə şəkərlə yanan udu, həm də təbəqdə məcmərin yanında şəkərlə qarışmış udu təsvir etmişdir.

B.728. Nizami gülab qətrələrini gövhərə təşbih edir, şəm'in şö'ləsini isə əmmaməyə bənzədir. Əmmamə ilə – deməklə səpilən zərin miqdarını göstərir – yə'ni, əmmamə-əmmamə.

Şəm'in zər səpməsi – onun nur saçmasına və parlaqlığına işarədir (şişə qucaq-qucaq gövhər və şəm' ovuc-ovuc zər səpirdi).

B.729. Noğul – şərab içdikdən sonra yeyilən şirin, turş və s. çərəz. Göz – badam, dodaq isə şəkər tökürdü (ikinci misrada «ləffü nəşri-müşəvvəş» işlənmişdir).

B.730. Şəkər və badam şirin söhbətdə idilər, Zöhrə və Bəhram (aşiq və mə'şuqa işarədir) eşq ilə uymuşdular.

B.731. Verilmiş və'də yada salındı, xatırlandı. Gülüş (xəndə) onun dodağına dilənməyə (sədəqə almağa) getdi ki, ondan nuş edib şirin olsun. Yə'ni verilmiş və'də yada salındı və o, təbəssüm etdi.

B.732. Pələngi– pələngi libas, əlvan parça. Nafeyi-ahu–müşkə işarədir. Şir – şəhvətə işarədir. Bu arifanə və əhvalı firavan olan məclisdə yumşaq tülkü dərisi ayaq altına döşənmişdi və müşk ətri şəhvətpərəst nəfsi ram etmişdi.

B.740. Ədəm (yoxluq) bu məclisdən qovulmuşdu, bu məclisə bəqa və əbədilik bəxş olunmuşdu.

B.741. Xət – məktub, namə. Nizami dövründə göyərçinlərdən məktub aparıb-gətirmək üçün istifadə edirdilər. Süreyya quşu – Süreyya ulduzlarına işarədir. Bə'zi astronomlar onu Buğa bürcünə daxil edirlər, bə'ziləri isə ona müstəqil bürc kimi baxırlar. Bu bürcə yeddi ulduz daxildir; onların hamısı xırda ulduzlardır, lakin topa halında olduğundan parlaq və çox da gözəl görünürlər. Farslar ona Pərvin, türklər və azərbaycanlılar isə Ülkər, ya da Yeddi qardaş deyirlər. Beytin mə'nası: Fərəh və şadlıq hər tərəfi əhatə etmişdi və Süreyya övcündən o tərəfə keçmişdi.

B.742-743. Sübh quşu – xoruz. Atəş – yanmaq və narahatlıq. Xoş-duzlular – gözəllər, məlahətlilər. Mə'nası: Ulduzlar hərəkətsiz idilər və gecə keçib getmirdi. Xoruz və sübh yuxuya getmişdilər, havanın işıqlanmasından bir xəbər yox idi.

B.744-745. Qapı əğyarın üzünə bağlı idi; pərilərin zülfü divanə aşiqlərin boynunda zəncir olmuşdu. Müştərinin o məclisdə (çənbərdə) olan ürəyi, yə'ni o məclisə can atan ürəyi üzük həlqəsi dairəsi boyda olmuşdu.

B.749. Fındığı şəkkər kimi – yə'ni kiçik ağzı şəkər kimi idi. Badamı təng – yə'ni, gözləri məğrur. Xətti təzə – cavanların üzündə və dodağı üstündə çıxan təzə tük. Püstəsi innabrəng – dodağı innab rəngli.

B.750. Gecə xətti – qara xətt. Sehri-həlal – şe'r. Babili ğəmzə və hindu xal – sehr və cadugərliyə işarədir. «Şərəfnamə»də deyir:



Cahanı hindu kimi tüstüyə bürüyürsən,
Rövşənlikdən yəğma və Xəllux kimi edirsən.

Beytin mə'nası: Mə'şuqun sehrli ğəmzəsi və cadugər xalı fındıq kimi kiçik və şirin ağzından, badam kimi gözlərindən, dodağının üstündə göyərən tükdən və innab rəngli dodağından şe'r qoşmuşdu və qara xətt (üzdə bitən tüklər) ilə rüxsarına yazmışdı.

B.754. Ğəmzə – göz və qaş ilə işarə etmək. Ox atmaq-nəzər etməyə işarədir. Beytin mə'nası: Göz qaş kamanı ilə atmadığı nəzər oxlarını atıb hədəfə vururdu və baxanı ayaqdan salıb yerə yıxırdı.

B.755-756. Ürəyin nəfəsi həyat bəxş edirdi və torpağın ağzında dirilik suyu var idi. Gül-çiçək ətr saçırdı, Ay fələk kimi ürəyin yəhərini çiyninə alıb gəzdirirdi.

B.757. Çöhrə, dodaq şəkkərü badam saçır – «ləffü nəşri mürəttəb» işlənmişdir; yə'ni, çöhrəsi şəkər saçırdı, dodağı badam tökürdü. Gül pənah (himayə) üçün şəkər üstə qaçır və «gülşəkər» vücuda gəlirdi. (Gülşəkər-gülqənd, qızıl gülün ləçəklərindən şəkər tozu ilə qarışdırılıb hazırlanan mürəbbə').

B.759. Ağ gümüş – ağ dəri (əndam) və ağ üzə işarədir. Beytin mə'nası: Onun qara saçları ağ əndamına tökülmüşdü və elə xoş ətrli idi ki, müşk – söyüdə ətr bəxş edirdi. (müşk-söyüd-xoş ətrli gülləri olan bir söyüd növ'üdür ki, bahar vaxtı bal arıları onun gülündən şirə çəkir).

B.760. Günəş – mə'şuqun gözəl üzünə işarədir. Beytin mə'nası: Mə'şuqun ağ buxağında ki su qurşaq bağlayıb həlqələnmişdi, rüxsarının günəşinin parlaqlığı tə'sirindən göy qurşağı (qövsi-qüzeh) kimi gözəl və əlvan olmuşdu. (Qövsi-qüzeh – Günəş şüalarının havadakı yağış damcılarından keçərkən sınması nəticəsində göydə görünən rəngarəng yarımdairə şəkilli qurşaqdır).

B.761. İbrahim – Bəni-Sam peyğəmbərlərindəndir; Xəlil, Xəlilüllah, Xəlilürrəhman onun ləqəbləridir. Atasının adı Tarəxdir, Azər onun əmisidir. İbrahim öz tayfasını yeganə Allaha tərəf də'vət etdi...və Nəmrud fərman verdi, böyük tonqal qalayıb onu atəşə atdılar, amma Allahın əmri ilə atəş onu yandırmadı və o, sağ-salamat qaldı...Misr və Fələstinə səfər etdi və yüz iyirmi yaşında olarkən qayıtdı... sonra Kə'bə evini bina etdi...

Xudavənd öz oğlu İsmaili qurban kəsməyi əmr etdi və Allahın əmrini icra etdiyi vaxt oğlunun əvəzinə bir qoç kəsməyə fərman oldu...Deyilənə görə, yüz yetmiş yaşında olarkən dünyadan getmişdir. Saradan İshaq (Bəni-İsrailin atası) və Hacərdən İsmail (ərəblərin ulu babası) adlı iki oğlu olmuşdur.

B.764. Xirməni – yə'ni, gülün xirməni.

B.765. Tuğra–fərmanların yuxarı hissəsində «Bismillah» sözünün üstündə olan yazı (xətt). Bu xətt qövs şəklində olurdu, zəmanə sultanının adını və ləqəblərini (yaxud, ad və ləqəblərin baş hərflərini) əhatə edirdi və bu, həqiqətdə padşahın imzası hökmündə olurdu.

B.766. Hamı o nurdan sərsəmlər kimi oldu. Hindlilərin əqidəsinə görə, sərsəmlik xəstəliyinə tutulanlar nur (işıq) gördükdə, onun tə'sirindən xəstəlikləri daha da şiddətlənir.

B.768. Cam zər idi simdə–sarı rəngli şərabı zərə, büllur camı gümüşə təşbih etmişdir.

B.771. Səbr o mərhələdə (pərdədə) binəva (biçarə və xamuş) idi, fitnə isə cuşa gəlmişdi.

## İKİNCİ XƏLVƏT

B.774. Əzəli fərş – mavi fələkə işarədir.

B.775. Səcdə – nəmaz qılan adamın bədəninin yeddi üzvünü (alın, iki əllərin içəri hissəsi, iki düz, ayağın iki baş barmağı) xüsusi qaydada torpağa (yerə) qoyması və lazımi dua oxuması. Burada şükr etmək, Allahdan mərhəmət diləməyə işarədir. Nüktə-məzmun.

B.776. Türklərin (gözəllərin) gülüşü o qədər şirin idi ki, şəkər o gülüşlərdən və öz şirinliyinin kəmliyindən ğəmgin idi və gözləri elə qara idi ki, sanki ahuların gözlərindən sürmə (qara rəng) oğurlamışdı (ğarət etmişdi).

B.777. Belə təsəvvür edirdilər ki, Ay işığı kətan parçanı süzgün edir.

B.778. Ay gecədən keçmişdi (vaz keçmişdi) və o gecənin gözəlliyinin tə'siri ilə səhərə qədər bir yerdə qərar tutmuşdu və o gecəni tərk etmək istəmirdi.

B. 779. Mə'şuq ğəmzə oxunu atan vaxt can bu oxu qəbul etmək və ehtiramını bildirmək üçün (qarşısında yeri öpmək üçün) onu qarşılayırdı.



B.780. Mə'şuq o qədər gözəl və nurani idi ki, şəm' ona baxdıqda nurunun şiddətindən gözü yaşla doldu (mə'şuqun nurunun şəm'in nuruna ğələbəsini təsvir edir) və çırağın gözünə ağ saldı. (çırağ–şəm' mə'nasında işlənmişdir).

B.784. Belə təsəvvür edirdilər ki, Ay nuru divanəliyi şiddətləndirir.

B.786. Ürək arzu edirdi ki, kaş gündüz bu gecənin qara pərdəsini yandırıb məhv etməyəydi, yə'ni sübh açılmayaydı. Kaş bu gecə salamət qalıb Qiyamət sübhünə qədər davam edəydi və Qiyamət sübhünə peyvənd olaydı.

B.789. «Gecən xoş!» – xudahafizləşib getmək; tərk etməyə işarədir.

Beytin mə'nası: Mənim fəqət o gecə xoş bir şadlığım var idi, o gecə sona yetəndən sonra xoş günüm olmadı.

B.792. Fələk lə'li – Günəşə işarədir. Kan qazmaq – qaranlığa nüfuz etmək, qaranlıqda yol getmək. Ay qaranlıqlarda yol gedir (mə'dən qazır) ki, Günəş lə'linə yetsin və onun nurundan istifadə etsin. Başqa sözlə, Ay ki nur aşiqidir, o gecənin eşqi ğəmindən hər gecə öz canını qazır; yə'ni, belə bir gecəni tapmaq üçün hərəkətdədir.

B.793. Məzhəbi gündüz ilə düşmən olan gecə də (nur zülmətə müxalifdir) belə bir rövşən gecənin arzusundadır.

B.794-796. Sübh açıldı və göz yaşlarım bədənimə (eyvanıma) tərəf axmağa başladı. Bulud (göz yaşı) rəqs edə-edə bu bağa (vucud bağı, bədən) tərəf gəldi və Günəşin üzünü örtmüş kudurət ğübarını (Günəşin paltarı) yuyub təmizlədi; yə'ni, ağladım və təsəlli tapdım.

B.797. Günəş – ürəyə, ruha işarədir. Səbu – su qabı, kuzə; insanın bədəninə işarədir. Beytin mə'nası: Günəşin düzəltdiyi bir hövzə su olan çeşmə, yə'ni ürək günəşi torpağın vücüdunda təcəlla etmişdir. Torpağın vücudu çeşmədən su götürən səbu kimi sınıb və məhv olub oradan gedəndir; fəqət çeşmənin suyu əbədidir.

Nizami demək istəyir ki, mənim və sənin vücudunda olan dirilik suyu əbədidir, halbuki mənim və sənin bədənin gec-tez su yolunda şikəst olacaq səbu kimidir.

B.801. Körpünü qırmaq – taqətsiz və bəhrəsiz olmağa işarədir.

B.809. Zəhr – narahatlığa işarədir. Gecə əf'isi – gecəni əf'iyə təşbih etmişdir. Möhrə – ilan möhrəsi; ilanın başında olur, onu çıxaran vaxt yaşıl və qismən kül rəngində olur, ona padzəhr də deyirlər. Burada padzəhr mə'nasında işlənmişdir. Gün möhrəsi –

Günəşi möhrəyə təşbih etmişdir. Beytin mə'nası: Bütün ğəmlərimlə bərabər fələk mənə ümid verdi və gecənin qara ilanı axırda mənə zülməti məhv edən Günəş kimi bir padzəhr bəxş etdi.

B.810. Bixəbərəm gər... – Sə'dinin dediyi kimi:

Ey səhər quşu, eşqi pərvanədən öyrən,
Ki, o aşiqin canı getdi, avazı gəlmədi.
Bu aşiqlik iddiası edənlər bixəbərlərdir,
Xəbəri olanlardan bir xəbər gəlmədi.

B.811. Beşik – irfani xəyalat və onun həqiqətlərinə işarədir. Səhər nuru – sübh, sübhi-sadiq. Xaqani deyir:

Gecə yol gedənlər sübhi-sadiqdə can kə'bəsini gördülər,
Kə'bəyə məhrəm olanlar sübhü üryan gördülər.

B.812. Nizami bu beytdə ğafilləri məzəmmət edir və deyir: Ey günlərini şadlıq, həva və həvəslə keçirən və ondan xəcalətli olan, həqiqətdə qara günlər keçirmisən və sənin gecələrin gündüzlərindən də qara olmuşdur.

B.813-815. Sifət – tə'rif, vəsf. Mə'rifət – agah olmaq, xəbərdar olmaq. Gecə – tənhalıq mərhələsinin vəsfidir, yə'ni, hər vaxt ki, insan özü ilə xəlvət edir, irfan istilahında «gecə» adlanır; onda ki, şəm'dən söz deyilir, «irfani nəzər» və «bəsirət» nəzərdə tutulur. O gecəyə və məclisə nisbət verilən ud və gülab isə eşq ilə ğəmgin və dərdmənd olanların naləsi və göz yaşıdır.

B.816. Yuxarı aləmdə olan bu qədər gözəlliklər ki, şərh olundu. Qədr gecəsinin mücərrəd surətlərinin nurundan ibarət idi.

B.817. Cəngli pərdə – fələk və asimana işarədir. Zənci saçı rəngli pərdə – gecə, xəlvət və tənhalıq.

B.818. Sübh ki, pərvanəlik eylər – yə'ni, yanmağa öyrənmişdir. (Günəş tul'u etdikdə sübh «yanır» və yox olur). Şəm'-Günəş, ürək günəşi, ruh günəşi.

B.819. Cəhd elə bu şəm'ilə, yə'ni ürək günəşi ilə sən də dağ ol (yan) bəlkə Nizami kimi çırağ, yə'ni mə'rifət nuru tapasan.



## BİRİNCİ MƏQALƏ

## ADƏMİN SİFƏTİ HAQQINDA

B.820. Əvvəl eşq xəlq olunmuşdur, sonra insan və buna görə də eşqdən əvvəl ədəmdə insan varlığından bir xəbər yox idi.

B.822. Sonbeşiyi idi – yə'ni, pərizadələrdən sonra vücuda gələn uşaq idi. Şərhi: Adəmdən əvvəl cinlər (pərizadələr) yerdə yaşayırdılar.

B.823. Birinci misrada Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 30-cu ayəsinə işarə olunur: [Ya Məhəmməd!] Sənin Rəbbin mələklərə: «Mən yer üzündə bir xəlifə [canişin] yaradacağam», – dedikdə...».

İkinci misrada isə Adəmin buğda yeyib Behiştdən xaric olmasına (ələm tək enmək) və Adəmin tövbə etməsinə və tövbəsinin qəbul olunmasına (ələm tək ucalıq tapmaq) işarə olunur.

B.824. «Əlləmə Adəm» – Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 31-ci ayəsinə işarədir: «[Allah Adəmi yaratdıqdan sonra] Adəmə bütün şeylərin adlarını [isimlərini] öyrətdi».

«Xəmmərə tinə» – hədisi-qüdsiyə işarədir: «Adəmin palçığını öz əlimlə 40 sabah yoğurdum».

B.825. Adəmin gövhəri bulanıqdır, çünki torpaqdan yaranmışdır; həm də saf və xalisdir, çünki ruhdan bəhrələnmişdir, ruhu vardır. O, məhəkdir, ona görə ki, İblisin əmrə itaət etməməsi onun vasitəsilə aşkar olunmuşdur. Adəm xalis qızılın mis ilə qarışığından alınan qızıl kimidir, yə'ni maddə və ruh aləmindən qarışıq bir tərkibdir. Adəm sərraf kimidir, çünki saf ilə saf olmayanı (yaxşı ilə pisi) fərq etmək qüvvəsi vardır.

B.826. Adəm mələkləri heyrətdə qoyan cavan nəzirsiz gözəldir. Şərhi: Adəm cavan xəlq olunmuşdur. Adəm bir ayna idi ki, bütün bəşərin təsvirini, yə'ni öz övladlarının təsvirini vermək qüvvəsi var idi.

B.828. İki beşik – maddi və ülvi aləmə işarədir. İki ilik-cism və cana işarədir.

B.829. Zindanilər – insanlara işarədir. (Ruhun torpaqdan yaranmış bədəndə məhbus olması e'tibarı ilə). Həmçinin: «Dünya mö'minin zindanıdır». Ruhanilər – mələklər; Allahın Adəmə öyrətdiyi adları mələklərə o öyrətmişdir.

B.830. Bakirə rəhmət – pakizə və yeni rəhmət; yə'ni, pakizə və yeni rəhmət insan xilqətində işlənmişdir. Başqa sözlə, insan

xilqəti vasitəsilə Allah-təalanın pakizə və yeni rəhməti aşkar olunmuşdur.

B.831. Yox dili – yə'ni, dili söz tutmayan, təzəcə danışmağa başlayan uşaq. Qırx günlük uşaq – 824-cü beytin şərhində verilən hədisə işarədir. Qırx yaşlı pir – kamil pir; Cəbrəilə işarədir.

B.832. Gözəl xətt ilə eşq məzmununda yazılmış məktuba eyham vardır.

B.832. Fələk quşları-mələklərə işarədir. Danə – mələklərin adları Adəmdən eşidib öyrənməsinə işarədir. Torpağa baş əymək – mələklərin Adəmə səcdə etməsinə işarədir. (quş dən yeyərkən başını aşağı əyir).

B.835. Behişt paltarlarını, ziynətlərini və Behişt bağını tərk etdi.

B.836. Buğda danəsinin qiymətsiz olduğunu izah edir; yə'ni, Adəm hətta təşəkkür və minnətdarlıq izhar edən bir söz qədər qiyməti olmayan danədən ötrü tora düşdü.

B.838. Məğrur olan – itaət etməyən, asi; İblisə işarədir. Burada Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 34-cü ayəsinə işarə olunur: «[Ya Peyğəmbər!] Biz mələklərə: «Adəmə səcdə edin!» – dedikdə, İblisdən başqa hamısı səcdə etdi. [Yalnız] o, lovğalanaraq [səcdə etməkdən] imtina etdi və kafirlərdən oldu».

B.839. Səkkiz bağ – Behiştə işarədir.

B.842. Sənin vücuda gəlməyini arzu etməsi səbəbindən buğda yemək onun üçün xeyli əhəmiyyətsiz və asan oldu.

B.844.Buğdanın kürrəvi cismlər kimi ayağı və başı yoxdur. Daşı – yə'ni, qiyməti və e'tibarı. Azuqə – yaşayış vasitəsi. Burada Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 36-cı ayəsinə işarə olunur: «Biz də [Adəmə, Həvvaya və Şeytana]: «Bir-birinizə düşmən kəsilərək buradan kənar olub yer üzünə enin! Yerdə sizin üçün müəyyən vaxta qədər [ömrünüzün axırınadək] sığınacaq və yaşayış vasitələri var», – dedik».

B.845. Adəmin Behiştdən kənara atılmasına işarədir və burada buğdanın torpağa atılmayınca bitməməsinə eyham vardır.

Oldu əzilməklə üzü ağ belə – Adəmin itaətsizlik edib buğda yeməsinə və bunun müqabilində tənbih olunub Behiştdən xaric olunmasına işarədir ki, Qur'anın 20-ci (Taha) surəsinin 121-ci ayəsində deyilir: «...Adəm Rəbbinə asi oldu və yoldan çıxdı...» Burada, həmçinin, buğdanın əzildikdə üzü ağ olub una çevrilməsinə eyham vardır. Şərhi: Adəm Behiştdən xaric olduğu



vaxt üzü qaraldı və tövbə etdikdən sonra Cəbrailin rahnümalığı ilə oruc tutdu və bədəninin dərisi ağ oldu.

B.848. Rəzil – İblisə işarədir ki, Adəmi yoldan çıxarıb, onun buğda yeməsinə səbəb olmuşdur.

B.852. Buğda danəsini iki yerə bölən düz xətt ağıza təşbih edilmişdir.

B.855. Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 37-ci ayəsinə işarədir: «[Nəhayət] Adəm Rəbbindən bə'zi xüsusi kəlmələr öyrənərək [Həvva ilə birlikdə o kəlmələr vasitəsilə] tövbə etdi. Doğrudan da O [Allah] tövbələri qəbul edəndir və mərhəmətlidir».

Sə'dinin aşağıdakı beyti bu məzmuna çox yaxındır:

Ən yaxşı bəndə odur ki, öz təqsiri üçün,
Allah dərgahından üzr istəsin.

B.859. Solmuş gül – torpağa işarədir. Sərəndib – Hindistanın cənubunda bir adadır. Rəvayətə görə, Adəm Behiştdən həmin adaya enmişdir və orada özünə mənzil etmişdir. Deyirlər ki, onun ayağının izi orada daşın üstündə qalmışdır. İbn Bətutə yazır: «Bizim atamızın qədəmgahı hündür və geniş qaya (ada) üstündə qərar tutmuşdur və ayaq yeri batıq şəklindədir».

Nizami İskəndərin dilindən deyir:

Sərəndibin işlərini qarışdırdım,
Adəmin qədəmgahına qədəm qoydum.

B.860. Adəmin dərisinin rəngi tövbə etməmişdən əvvəl qara idi.

B.861. Nilçilik – matəm saxlamağa işarədir. Adəm Allahın əmrinə itaət etməməsindən ğəmgin idi və peşimançılıqla ağlayırdı.

B.862. Tövbəsi qəbul olunanda ğəmdən xilas oldu və o qədər ağladı ki, göz yaşlarından ayaqları altında göy otlar bitdi.

B.863. Xəta türkü – ağlıq və gözəlliyə işarədir. Xəta zülfü – gözəl və ürək açan, gözəlliyi ilə ürək ğarət edən zülf.

B.865. Adil – ədalətli (torpaq üçün sifətdir). Torpağı adil adlandırır; çünki, buğdadan buğda bitirir, arpadan arpa. Vəqf – ümumun istifadəsi üçün bir kəs tərəfindən ayrılmış mülk mal və digər şeylər.

B.866. Doqquz çadır – doqquz fələkə (bu mə'nada ki, dünya da onun içindədir) işarədir.

B.868. Ud, məcmərin nəfəs çəkib xoş ətr saçmasından ötrü yana-yana nalə etməyə düçardır. Başqa sözlə, əsl məqsəd xoş ətrdir, udu yandırıb kül etmək deyildir və əsl məqsəd palangərin rahatlığını tə'min etməkdir ki, ulağın belinə palan qoyulur, əsl məqsəd ulağa əziyyət vermək deyildir.

B.869. Sən xəlq olunmadan əvvəl sənin işini tərtib etdilər, sonra səni yaratdılar və lütfə (mərhəmətə) laiyq olduğunu qərar verdilər; bu vasitələr hamı sənin xidmətindədir.

Mərhum Şeyx Sə'di bu məzmunu çox gözəl bəyan edir:

Bulud, külək, Ay, Günəş və fələk itaətdədirlər,
Ta ki, sən ruzi hasil edəsən və bixəbər olmayasan.
Hamı sənin üçün sərgəştə və itaətkardır,
Heç insaf deyil ki, sən itaət etməyəsən.

B.871. Xəzan (qocalıq) gələnə qədər əsl məqsədin yolunda əzm et və çarə axtar; necə ki, su öz təbii məkanına yetmək üçün sür'ətlə aşağıya, atəş isə yuxarıya gedir. Şərhi: suyun hərəkəti yuxarıdan aşağıya, atəşin hərəkəti isə aşağıdan yuxarıya olur.

B.875. Səni aciz və zəif xəlq ediblər. Qur'ani-Kərimin 4-cü (Nisa) surəsinin 28-ci ayəsinə işarədir: «Allah istər ki, üzərinizdə olan ağırlığı yüngülləşdirsin, çünki insan [şəhvətini cilovlamaq və itaətin çətinliyinə dözmək baxımından] zəif yaradılmışdır».

B.878. Yaxşı odur ki, tünd yerişdən qalmayasan; yə'ni, tünd yeriyəndə tez yorularsan və düşüb bir yerdə qalarsan, əgər ahəstə yerisən, yolda qalmazsan. Sə'di deyir:

Öz gözümlə gördüm ki, biyabanda
Ahəstə gedən iti gedəndən qabağa düşdü.
Sür'ətlə gedən səmənd [at] yorulub qaldı,
Dəvəçi isə ahəstə keçib getdi.

B.879. Saf su – yüngül su. (saf su yüngül olur, tez soyuyur, tez də isti olur, saf suda bişən (hazırlanan) hər şey tez bişir və bulanıq olmur, saf su vəzncə başqa sudan yüngül olur).

B.881. Qaf – əfsanəvi dağdır. Ağırcan–tənbəl, süst, bağrı daş.

B.884. Sən ayna kimi bütün əndazələri qəbul edirsən, yə'ni. bütün cismlərin sürətini qəbul edirsən, amma «heç» kimi hamıdan



xalisən. Başqa sözlə, hamı səndə təcəlla edir, amma sən onların heç birindən deyilsən.

B.885. Ayinə – Günəşə işarədir. Çərxi – gözəl üzlüyə, Günəşi isə aynaya təşbih etmişdir ki,həmişə çərxin əlindədir.

## ZALİM PADŞAHIN DASTANI

B.903. Yel ölçmək – insanın ağ cigərini hava ilə doldurub – doşaltmasına işarə olunur. (Ağ cigəri çanağa təşbih etmişdir). Sənin bu yel ölçməyinin nəticəsi və aqibəti ziyan və əziyyətdir.

B.905. Tərəzində daş və gövhər yoxdur. bu halda tərəzi işləməz və sənin ömrünün piyaləsi dolar, çanağın isə boş qalar; yə'ni heç nə hasil edə bilməzsən.

B.906. Daş – qiymətli daşlar; qızıl, gümüş və s. işarədir. Birinci misranın mə'nası: hər şeyi maddi dəyərlər ilə ölçmə! Yer daşı – qiymətli daşlara işarədir. Bazubənd – qolbağ, bilərzik; ziynət üçün. yaxud göz dəyməmək üçün qola bağlanır.

B.909. Bir gün – Qiyamət gününə işarədir. Ağzını boş , boynunu azad edir – yə'ni, cavabdehlikdən azad olursan, boynunda heç kəsin həqqi olmur.

B.911. Dağılmış kilim – köhnə fərş; maddi aləmə işarədir.

## İKİNCİ MƏQALƏ

## ƏDALƏT VƏ İNSAF HAQQINDA

B.913. Səni fikrin və tədbirin canlıların şahı etmişdir. Taclılar – tac sahibləri; mövcudata işarədir. Misranın məfhumu: yə'ni, «ey məxluqatın əşrəfi!»

B.914. Gövhər – pak ruha işarədir. Baba Əfzəl Kaşani deyir:

Can gövhəri bədən sədəfində peyvəstə olandan bəri,
Dirilik suyundan insan surəti nəqş etməyə başladı.

B.917-918. Sən çox qiymətlisən və dünyada olan mövcud imkanlar hamısı sənin üçündür. Bu əzəmətli şahlıq mülkü

sənindir, sən bununla fəxr et ki, hamısı sinəsini sənin üçün açıb nazlanır.

B.919. Sənin hərəkətin fələk dairəsindən kənara çıxır, yə'ni fələk dairəsinə sığmır və sən qədrdə iki aləmdən daha artıqsan.

B.920. Səhərin tutduğu ayinə – Günəşə işarədir.

B.921. Beşik – dünyaya işarədir.

B.922. Can quşu – əql və idraka işarədir.

B.926. Yel (külək) apardığı hər şeyi ətrafa səpələyir, yığıb özündə saxlamır və həmişə əliboş olur.

B.930. Mö'min və etiqadı olanların ürəkləri o biri aləmdən agah olur.

B.932. Dünyanı verib dini alsan, şeytanın vəsvəsəsindən uzaq olarsan.

B.933. Kəhrəba – dinə işarədir. Kimiya – misi və bəzi digər metalları qızıla çevirən maddə. Burada qiymətli maddə kimi nəzərdə tutulur.

B.934. Beytdə işlənən daş və torpaq – dünya və dünya ne'mətlərinə işarədir. Gövhər və zər – dinə işarədir.

B.935. İkinci misra Qur'ani-Kərimin 6-cı (Ən'am) surəsinin 160-cı ayəsinə işarədir: «Kim yaxşı bir iş görərsə, ona həmin işin on qat əvəzi [savabı] verilər. Kim pis bir iş görərsə, ona həmin işin misli qədər cəza verilər. Onlara haqsızlıq edilməz».

B.946. Zərdüştilər atəşi müqəddəs hesab edirlər; amma, bə'zi mətnlərdən onların atəşpərəst olduğunu təsəvvür edirlər.

B.947. Zərnix oyuncaq – Günəşə işarədir. İkinci misranın məzmunundan belə mə'lum olur ki, qadınlar heyz vaxtı oyuncaq ilə oynamağa meyl edirlər.

B.948. Pərdə – fələkə işarədir.

B.949. Dəm ver ona – yə'ni, zərnix oyuncağa (Günəşə) nəfəs ver. Nəfəs vermək – iki mə'na verir: şö'ləvər etmək və söndürmək. Məğzdən, yə'ni beyindən dəm vermək – asqırmağa işarədir.

Şərhi: Asqırmaq şəm' və çırağın sönməsinə səbəb olur. İsanın nəfəsi can bəxş edən olduğu halda, Nizami onunla çırağın sönməsini təsvir etmək istəyir və «məğzdən» ifadəsini işlədir. Nəticədə cümlənin mə'nası «can bəxş etmək» yox, «sönüb getmək» (ölüb getmək) olur.

B.951. Bu pərdəni – yə'ni, Günəş fələkini parələ və İsa kimi asimana qalxmaq imkanı tap.



B.952. Hər kəs İsa kimi ruha rəğbət etsə, yə'ni maddiyata arxa çevirib ruha üz tutsa, mə'naya üz çevirmiş olar. (Burada İsanın «Ruhullah» olmasına eyham vardır). İqlim – aləmə işarədir.

## NUŞİRƏVAN İLƏ VƏZİRİN DASTANI

B.957. Ənuşirəvan – birinci Xosrovun ləqəbi. Sasani şahlarının 21-cisidir (531-579).

B.960. Qafiyə üçün münasib söz seçmək lazımdır ki, sonradan qafiyədə işlənəcək həmahəng kəlmələr çox olsun və onları tapıb demək asan olsun. Əgər «qəlbi» sözünü qafiyə qərar versək, qafiyə təng olacaq, çünki bu qafiyədə uyğun kəlmələr çox azdır.

Beytin mə'nası: İki quş bir-birinə xeyli yaxın oturdu, amma qafiyələrində ixtilaf vardı; yə'ni bir o qədər uyğunlaşa bilmədilər.

B.969. Şah bu mətləbi eşidəndən sonra o qədər müztərib və biqərar oldu ki, nəfəsi atəş şö'ləsi kimi oldu. Belə ki, o hərarətin tə'sirindən atının nə'li yumşaldı. (Bu mətləbi eşitdikdən sonra atını sür'ətlə çapmasına eyham vardır).

B.983. Türktaz – ğarət və tarac.

B.987. Sam – Rüstəmin babası, Zalın atası. Nəriman – Samın atası, Zalın babası.

B.990. Qələm alıb xət çəkdi – yə'ni, bac-xərac almadı və zülm etməkdən əl çəkdi.

B.996. Günün altında işləyənlərin, əkinçilərin üstünə gün düşür.

B.999. Qur'ani-Kərimin 45-ci (Casiyə) surəsinin 15-ci ayəsinə işarədir: «Kim yaxşı bir iş görsə xeyri özünə, kim də bir pislik etsə, zərəri özünə olar!»

## ÜÇÜNCÜ MƏQALƏ

## DÜNYANIN HADİSƏLƏRİ HAQQINDA

B.1005. Ey ətəyindən yapışan – yə'ni, ey təkəbbür və ğürur ilə bu dünyada gəzən.

B.1009. Vamiq və Əzra – bir-birini sevən iki aşiqin adlarıdır. «Vamiq və Əzra» dastanı islamdan əvvəl ədəbiyyatda rəvac

tapmışdır və Ünsuri bu dastanı nəzmə çəkmişdir. Lamei həmin dastanı türk dilinə tərcümə etmişdir. Yəmən şahzadəsi Vamiq ilə Çin şahzadəsi Əzra arasında olan bu eşq dastanı indi' əlimizdə yoxdur, ondan bə'zi beytlər Əsədinin lüğətnaməsində nümunə kimi bizə gəlib çatmışdır.

B.1015. Vərəq – ağac yarpağı. Kasə – baş kasası mə'nasında işlənmişdir. Xaqani deyir:

Zəmin (torpaq) məstdir, çünki mey yerinə
Hörmüzün baş kasasında Nuşirəvanın ürək qanını içmişdir.

B.1016. Aləm bizim vücudumuzun əsəri (nişanəsi) ilə gəncdir, gəncliyi aləmə biz vermişik. Şərhi: Nizami bə'zən fəlsəfi fikirlərə nəzər yetirir. Cavanlıq və qocalıq nisbi bir əmrdir, əgər qocalıq olmasa, cavanlığın mə'nası olmayacaq. Buna görə də bizim qocalığımız aləmi cavan adlandırmağa səbəb olmuşdur. Bu məfhum 1671-ci beytdə də vardır:

Bağı-zaman ki, ona sənsən bahar,
Ğəm evi san ki, ona sənsən nigar.

B.1017. Simurğ, Samın oğlu Zala pasibanlıq edib bəslədi. Samın saçları qara olduğuna görə cavan görünürdü. Halbuki, onun oğlu Zalın saçları ağ idi və qoca görünürdü. Şair demək istəyir ki, biz dünyadan doğulmuşuq, dünya həmişə cavandır, biz qocalırıq və bu təəccüblü deyildir ki, ata cavan, oğul isə qoca olsun; necə ki, Sam və Zalda öz isbatını tapmışdır.

B.1020. İkirəng fərş – gecəli-gündüzlü dünyaya işarədir.

B.1022. Nə'li odda yanmaq – biqərar olmaq, müztərib olmaq.

B.1030. Əql-cavanlıq əyyamına işarədir. Qəflət – cavanlığa işarədir.

B.1031. Əqli nəzər artdı və bəsirət hasil oldu.

B.1032. «Cavanlıq cünunun bir şö'bəsidir» – hədisinə işarədir.

B.1033. Özün yazmasan da, yazan üçün qələm yon, ona kömək et.

B.1034. Pak ürəklər-ariflər, xəbərdar olanlar.

B.1035. Sünbül – xoş ətrli bir bitkidir. Deyilənə görə, əvvəlcə ətri çox olmur; onun ətrli olması üçün bir müddət tikan ilə bir yerdə saxlayırlar və ətri artır. Nizami bu işin səbəbini belə bəyan edir ki, gül tikan ilə bir müddət həmnişin olandan sonra onun bərəkətindən bu xasiyyəti tapmışdır.



B.1036-1037. Bərat – dövlətin xəzinəyə təhvil verdiyi kağız, təhvil qəbzi. Günahın bağışlanmasına dəlil olan kağız, bərat kağızı. Ərəsat – Qiyamət səhrası. Dilsizlər – dilsiz heyvanat. Mə'nası: Ey dilsiz heyvanların və insanların qanına aludə biyaban, sən məzlumların qanını içmisən! Başqa sözlə, hər iki dəstə susuzluqdan sənin üstündə can vermişlər və sənin zərrələrinə qarışmışlar.

B.1038. Qum abi – həyat çeşməsi verir, amma sənin qumun abi – həyat verən qum deyildir və səndə Fərat feyzi yoxdur. Sən insanların və heyvanların qanını içmisən və cəhənnəmliksən.

B.1039. Qum nalə edəcək və deyəcək: «Doğrudur ki, mən qan içmişəm, amma qan etməmişəm; yə'ni heç kəsi öldürməmişəm və mənim boynumu vurmaq üçün [süfrənin üstünə] qum tökməyin».

Qum tökmək – bir kəsin boynunu vurduqda dəri süfrə (nət') salardılar və üstünə qum tökərdilər ki, boynu vurulan adamın qanını cəzb etsin.

B.1040. Biyaban, əsasən şoranlıqdır və onda duz zərrələri vardır. Biyaban deyəcək: «Təşnələrin bədənindən süfrə salınmışdı, mən bu süfrəyə duz atdım və onların cigərinə qarışdım».

B.1041. Şübhəsiz ki, bu qədər qurbanların arasında ğeyrət çəkən və arif insan da var. Mən qarışdım ki, onunla həmdəm olum və Behiştdə ki, bu ğeyrət çəkənlər hurilərlə həmdəm olacaq, mən də onların səbəbi ilə Behişt gözəllərinin qolbağının məhrəmi olum.

B.1042. Tiynət – fitrət, maya. Xalxal–qadınların ziynət üçün topuqlarına saldığı qızıl, yaxıd gümüş halqə. Mütrib – şadlıq gətirən.

B.1044. Zənbur – sarı zənbur arı pətəyinə zərər yetirir.

B.1047. Süleyman peyğəmbərdən sonra pərilər gözə görünmədilər.

B.1049. Hüma – xoşbəxtlik quşudur ki, guya kölgəsi hər kəsin başına düşsə, onu xoşbəxt edər. Deyilənə görə, Hüma sümük yeyir və canlıların əti ilə qidalanmır. Sə'di deyir:

Hüma hamı quşlardan ona görə şərəflidir ki,
Sümük yeyir və canlılara əziyyət vermir.

## SÜLEYMAN VƏ QOCA ƏKİNÇİNİN DASTANI

B.1052. Süleyman ibn Davud yəhudi padşahlarındandır. İslamda Bəni-İsrail peyğəmbərlərindən hesab olunur. Həmnəfəs olmaq – burada, Süleymanın əkinçi ilə e'tirazına səbəb olan söhbətə işarədir. Çırağ – qoca əkinçi (istiarə kimi işləmişdir). Çırağ və nəfəs bir-biri ilə saziş etməyən şeylərdir. Nəfəs vasitəsilə çırağın şö'ləsi titrəyər və çırağ sönər.

B.1053. Məmləkət – burada məcazi mə'nadadır, səfərə çıxdığı bir neçə nəfər, yaxud dəstə nəzərdə tutulur. Təxteyi-mina – asimana işarədir.

B.1057. Quş dili – «məntiq-üt teyr»ə işarədir ki, Qur'ani-Kərimin 27-ci (Nəml) surəsinin 15-ci ayəsində deyilir: «Biz Davuda və Süleymana elm [insanlar arasında mübahisəli məsələləri həll edib ədalətli hökm çıxarmaq, quşların dilini bilmək və i.a] verdik. Onlar dedilər: «Bizi mö'min bəndələrinin çoxundan üstün tutan Allaha həmd olsun!»

Beytın mə'nası: Qoca əkinçi susuz çöldə toxum səpirdi və onun illəti Süleyman üçün gizli idi. İstəyirdi ki, qoca əkinçinin bu işə cəhd etməsinin səbəbini bilsin və həmin iş Süleymanın danışmasına səbəb oldu.

B.1058. Cavanmərd – qorxu bilməyən və bədgüman olmayan kəs. «Kəşf-ül əsrar»da deyilir: «Nə üzri-rüsxət onları aldadar, nə də vəhşət sultanı onların üstünə gedə bilər».

B.1059. Quş dili ilə çağırmaq – quşların səsini təqlid etmək və bu vasitə ilə onları tora tərəf gətirmək. Quş dili məcazən «aldatmaq» mə'nasında da işlədilir. Nizaminin müasiri Zəhir Faryabi də bu tərkibi işlətmişdir:

Sən Süleymansan və məndə bu quş dili ki var,
Sənin hüzurunda Ənqa qanadı olsa da qanad tökər.

B.1067. Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 261-ci ayəsinə işarədir: «Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi şəxs üçün bunu qat-qat artırır. Allahın lütfü genişdir. O, hər şeyi biləndir!»



B.1070. Nəzər – əmrlərə və mövcudatın həqiqətlərinə diqqət və meyl etmək; həmçinin, həqq yolunun yolçusuna ilahi lütf və bəndənin həqqə üz çevirməsidir. Ənsari deyir: «Nəzər ikidir– insani nəzər və rəhmani nəzər. İnsani nəzər odur ki, sən özünə nəzər edirsən; rəhmani nəzər odur ki, həqq sənə nəzər salır. İnsani nəzər səndən libasını soyundurmayınca rəhmani nəzər sənin ürəyinə nüzul etməyəcəkdir».

Rövşən nəzər – xudbinliyi tərk edən və Allahı görən nəzərdir.

Beytdən hasil olan budur ki, Allah hər kəsin ki, nəzərini rövşən edir, o kəsə onun mə'rifəti əndazəsində bəsirət verir. (Tənasübə riayət olunmuşdur və sonrakı beytlərdə mə'rifət və bəsirətin mütənasib olmasından söz gedir).

B.1071. Nizami bu beytdə «Məsiha» kəlməsi ilə ruhu, «xər» kəlməsi ilə bədəni nəzərdə tutmuşdur.

B.1072. Kərgədən ot yeyən heyvandır, filin boynunu yemir və şair də bunu nəzərə çatdırmaq istəyir.

B.1077. Demirəm ki, Nizami naz edəndir, çünki naz etmək mə'şuqun sifətlərindəndir və belə bir iddia xam kəslərə layiqdir. Bəlkə deyirəm ki, naz çəkmək Nizaminin işidir, çünki naz çəkmək möhtacların və aşiqlərin işidir və Nizami həqqin aşiqidir.

## DÖRDÜNCÜ MƏQALƏ

### RİAYƏTİN HÜSNÜ HAQQINDA

B.1078. Div – insanı yoldan azdıran (şeytan, ifritə və s.). Viranəlik – dünyaya işarədir. Beytin mə'nası: Ey insan, acizlik göstərmə, mətin ol, bu dünyaya aludə olma ki, səni div kimi yolundan azdırar.

B.1080. Bir udum mey üçün şərab içənlərin ayağına düşüb xar olursan və seyr edən fələkin əlində oyuncaq olursan.

B.1081. Müshəf – Qur'ani-Kərim. Müshəfi atmaq – ibadəti tərk etməyə işarədir. Şəmşiri atmaq – cihadı tərk etməyə işarədir. (Peyğəmbər əleyhissəlam bir əlində Qur'an dini təbliğ edirdi və o biri əlində qılınc dini düşmənlərdən mühafizə edirdi).

B.1083. Rabiə – çox pərhizkar və mö'min qadın olmuşdur. (Hicri, 2-ci əsr). Bir gün biyabanda təşnə bir itə rast gəlir, öz hörüklərini kəsib kəndir kimi istifadə edir və quyudan su çəkib itə

verir. Dördüncü – əshabi-kəhfin dördüncüsü. Qur'ani-Kərimin 18-ci (əl-Kəhf) surəsinin 22-ci ayəsinə işarədir: «[Kitab əhlindən əshabi-kəhfin sayı barəsində mübahisə edirlər] sanki qaranlıq yerə daş ataraq: «Onlar beşdir, altıncısı köpəkləridir!» – deyəcəklər. Digərləri [mö'minlər] isə: «Onlar yeddidir, səkkizincisi köpəkləridir!» – deyəcəklər. [Ya Məhəmməd!] de ki: «Onların sayını Rəbbim daha yaxşı bilir. [İnsanlardan isə] bunu bilən çox azdır!»

B.1084. Hünər – təqvaya işarədir.

B.1087. Hünər (təqva) əql boynunun ziyvəridir və ədalətdən yaxşı heç bir hünər yoxdur.

B.1089. Yaxşılar ilə həmdəm ol, sən fələk deyilsən ki, Qiyamətə qədər bir halda qalasan, fələkin səni zəif edib qocaldacağından qorx.

B.1095. Məhmud – Sultan Məhmud Ğəznəvi. Sultan Məhmud Hindistanda bir qalanı mühasirə edir. İki-üç nəfər bütpərəst bütxanəyə gedirlər, ibadət edirlər və Məhmud Ğəznəvinin ölməsi üçün dua edirlər. Məhmud xəstələnir. Bu əhvalatdan xəbər tutan Məhmudun yaxın adamları yalandan şadlıq təbli döyürlər ki, guya sultan sağalmışdır. O iki-üç nəfər Məhmudun şəfa tapmasını zənn edirdər, nəticədə onların himmətində şikəstlik yaranır, bütxanəni tərk edirlər və bu əməl Sultan Məhmudun səhhət tapmasına səbəb olur.

B.1096. Paknəfəs – müsəlmana işarədir.

B.1097. Tısbağa suyun kənarında yumurta qoyur və özü suya girir; suyun içindən başını çıxarıb onlara nəzər yetirir və himmətini bu işə mə'mur edir. Bir müddətdən sonra balalar yumurtadan çıxırlar.

B.1098. Zülm qılıncını pakqədəmlərin getdiyi yoldan kənar et ki, onların sübh oxuna (sübh vaxtının ah-naləsinə) düçar olmayasan.

## SULTAN SƏNCƏR VƏ QARI DASTANI

B.1115. Əbxaz – Qafqazın qərbində ərazidir. Oranın adamları zülm ilə məşhur olmuşlar. Beytin mə'nası: Sən ki, yətimlərin və kimsəsizlərin malını ğarət edirsən, Əbxazın zalim adamları da belə talançılıq etməmişlər və onlarda belə adət yoxdur. Yə'ni, sən abxazlılardan da zülmkarsan.



B.1121. Türk dövləti – Səlcuqilərə işarədir.

B.1134. Ənqa qanadında aşiyan etmək – ortadan getmək, yox olmağa işarədir.

## BEŞİNCİ MƏQALƏ

## ZƏİFLİK VƏ QOCALIQ HAQQINDA

B.1137. «Gecən xoş!» – gecən xeyrə qalsın; xudahafizləşəndə işlədilən cümlədir. Suyun odu ğərq etməsi – təravətin (cavanlığın) getməsinə işarədir. Küləkin torpağı ğərğ etməsi – zəiflik və natəvanlığa işarədir.

B.1138. Sübhün gəlməsi – saçların ağarmasına və qocalığa işarədir. Günəşin divar başından aşması – ğürubun yaxınlaşması; ömrün təmam olması və ölümün yaxınlaşmasına işarədir.

B.1143. Pak və aludə – ömrün müxtəlif dövrlərinə, uşaqlıqda pak və sonra günah ilə aludə olan əyyama işarədir. Asudəlik – xatircəm'lik. Asudədir – yə'ni, rahatlıqdır.

B.1144. Aylı bulaq – cavanlığa işarədir.

B.1145. Həbəş – qaralığa işarədir. Təraz – Şərqi Türküstanda gözəlləri ilə məşhur bir şəhərdir və burada ağlığa işarədir. Türktaz – ğarət. Beytin mə'nası: Zaman get-gedə sənin vücudunun bütün üzvlərini süst və xərab edir və çox şeyi səndən alır.

B.1146. Qara-ağ saçlı müəllim – saçlarına dən düşən qoca. Gecə və gündüzü bizə cavanlıq çağı tə'lim və nəsihət vermiş qara-ağ saçlı qocaya təşbih etmişdir. Yə'ni əgər cavanlıqda gecə və gündüzün biri digərini əvəz etməsi və aşkar etdyi nişanələrinə fikir versək görərik ki, zamanın gərdişi pir və natəvan olacaqlarını əsla təsəvvür etməyən bizdən də cavanları qocaltdı.

B.1148. Gülün yarpağı – gül rəngli çöhrəyə işarədir.

B.1150. Dövləti-Cəmşid – Cəmşidin dövləti üç yüz il müddətində xəstəliyi və ölümü olmaması ilə fərqlənmişdir.

B.1155. Cavanlıq atəşdir: «Xosrov və Şirin»də deyir:

Mən suyam, adım dirilik suyudur,
Sən atəşsən, o atəşin adı «cavanlıq»dır.

B.1158. Qara daş – məhək daşı.

B.1159. Gecə keçdi və səhər gəldi; yə'ni, qara saçların ağardı, ğəflətdən uzaqlaş.

B.1160. Təb'odu – şəhvət qüvvəsinə işarədir. Kafur yemək – cinsi qüvəvnin zayil olmasına işarədir. Çünki, kafur şəhvət qüvvəsini öldürür, yaxınlaşmaq imkanını yox edir və mizacı soyuqdur. Müşk – qara saçlara işarədir. Kafur kimi eyləyir – yə'ni, kafur kimi ağardır. (kafurun rəngi ağdır).

B.1162. Yumaq ilə boyaq – yumaq və boyamaq hər ikisi rəng ilə əlaqədar olduğundan bir-birindən uzaq deyildir. (biri rəngi aparır, digəri rəngli edir). Deyirlər ki, Günəş dördüncü asimandadır və İsa da oradadır. Günəşi – paltar yuyan, İsanı isə boyaqçı kimi təsvir etmişdir.

B.1163. Su – paltar yuyandır, çünki çirkləri yuyub aparır. Ayın nuru isə meyvələrin rəng almasına tə'sir edir. Ənvəri deyir:

Hər şeyi mənə ehtiyacım olan qədər verəcək,
Necə ki, Ay almadan xəbərsiz ona rəng verir.

B.1166. Rumu sifət – zahiri ağ. Zənci ürək – batini qara.

B.1168. Dağ – nişanə, əlamət. «Cəhuli» və «zəlumi» – Qur'ani-Kərimin 33-cü (Əhzab) surəsinin 72-ci ayəsinə işarədir: «Biz əmanəti [Allaha itaət və ibadəti, şər'i hökmləri yerinə yetirməyi] göylərə, yerə və dağlara təklif etdik. Onlar onu götürməkdən qorxub çəkindilər. Çox zalim və çox cahil olan insan isə onu götürdü».

B.1169. Ağac qızları – ağacın çiçəkləridir ki, əvvəldə libasları lətif və tünük olur, meyvə olduğu vaxt isə libasları cod olur.

B.1170-1171. İstidə geyinirsən, hava soyuyanda isə çılpaq olursan və bu sənin xilafkar olmağının nəticəsidir. Şir və pələng kimi öz geyiminə qane' ol və geyim üçün gədalıq etmə. «İqbalnamə»də deyir:

Heç kəsin kilimi [üstünə] başını əymə,
Öz kilimini şir kimi öz tükündən et.

Şir və pələng kimi öz yeməyini öz əlinlə hasil et, heç kəsin süfrəsi başında oturma və gədalıq edib heç kəsdən dilənmə.

«Leyli və Məcnun» məsnəvisində deyir:



Şikar yıxmaq (etmək) şirin işidir,
Tülkü şirin şikarından özünü doydurur.

B.1174. İsanın ulağı kimi otlamağın başqasının süfrəsində təam yeməyindən yaxşıdır. Nizami, ruhu – İsaya, bədəni isə İsanın ulağına təşbih etmişdir.

B.1175. Od – qədim yunan alimlərinin əqidəsinə görə, hava kürrəsinin üstündə yerləşən atəş kürrəsidir ki, ünsürlərə tə'sir edir. Torpaq küp – Yer. Külək – küp içində hərəkətdə olan külək. Su – həya, üz suyuna işarədir. (Bu beytdə dörd ünsürə diqqət yetirilməsi müşahidə olunur). Beytin mə'nası: Çörək bişirmək üçün təndir və od lazımdır və odu şö'ləlndirmək üçün külək lazımdır. Nizami demək istəyir ki, bu fələk bir kəsin abrını tökməyincə ona Yer təndirində (torpaq küpündə) bir çörək verməz.

B.1176. Daxma – ölülərin cəsədi qoyulan sərdabə; dünyaya işarədir. Zindanilər – dünya əhlinə, insanlara işarədir. Atəş – himmət atəşi. Ruhanilər – pərhizkarlar, mö'minlər. Şair demək istəyir ki, mö'minlərin himmət və duaları rövnəqdən düşmüş və soyuqdur.

B.1177. Can Yusifi – canı Yusifə təşbih etmişdir. Qurdnəfəs – nəfəsi qurd kimi, canavar xasiyyətli, yırtıcı. Şir kəs – salik və ariflərə işarədir. Beytin mə'nası: Zindanilər qəbristanı olan bu dünyada mö'minlərin himməti əsərsiz olmuşdur, əgər belə olmasaydı canavar Yusifin və pişik şirin yerində oturmazdı.

B.1178. Əgər ürək əhli və pərhizkar mö'minsənsə, cürbəcür xoşagələn ruzi dalınca getmə; çünki bu halda yeməkdən ləzzət alıb xoşlanarsan, amma ürəyi məhv edərsən və bir daha ürək əhli ola bilməzsən.

B.1179. Su kimi ol ki, onun çörəyi özündəndir və heç kəsdən minnət götürmür. Od kimi ol ki, kababı öz ürəyindən hazırlayır, yə'ni, heç bir şey aşkar etmədən özünü bişirir və yeyir. Sən də ürəyini özün üçün kabab qərar ver və özgələrdən minnət götürmə.

## KƏRPİCKƏSƏN QOCANIN DASTANI

B.1186. Əhli-qılınc – cəngavərlər. Qalxan atmaq – aciz olmaq, təslim olmaq; burada ölməyə işarədir.

B.1195. Cavanlıq – nadanlıq və cahilliyə işarədir.

B.1197. Mən bu sən'ətə əl uzatdım ki, sənə dilənmək üçün əl açmayım. Saib deyir:

Sən ki başqalarına gədalıq əli uzadırsan,
Öz üzünün suyunun korpüsündən keçmək ümidindəsən.

## ALTINCI MƏQALƏ

## MÖVCUDATA E'TİBAR HAQQINDA

B.1202. Lö'bətbaz – gecə oyunu çadırını idarə edən kəs. Gecə oyunu – Ay işığı vasitəsilə olurdu və çadırın pərdəsində müxtəlif kölgələr göstərirdilər. Lö'bət – gəlincik. Pərdə – asimana işarədir.

B.1204. Ğarətgər – ğarət edən, talançı; ulduzlara işarədir. (Ulduzlar öz gərdişləri ilə başqalarının ömrünü ğarət etməsi etibarı ilə ğarətçidirlər).

B.1205. Göz güհəri – gözü gövhərə təşbih etmişdir və gözdən məqsəd ulduzdur. Ürək – ulduzların hərəkət etdiyi dairənin mehvərinə işarədir. Beytin mə'nası: Bu pərdənin arxasında həddən artıq ğarətgər sitarələr vardır. Onlar hamı öz gövhərə bənzəyən gözlərini mehvər və mərkəzlərinə itaət və ehtiram səbəbindən həmin mehvərə xidmət üçün bağladıqları kəmərə tikiblər.

Nizami sitarəni nurani göz gövhərinə, onun hərəkət dairəsini kəmərə və bu hərəkətin mərkəzini ürəyə təşbih etmişdir.

B.1206. Nöqtə və pərgar – dolanan mühit və sabit mərkəz. Beytin mə'nası: Fələkdə bütün nöqtələr və pərgarlar bir işlə məşğuldurlar və heç biri fəaliyyətsiz və bu qanundan kənar deyildir, ya mərkəzdədirlər, ya mühitdə. Burada Qur'ani-Kərimin 38-ci (Sad) surəsinin 27-ci ayəsinə işarə olunur: «Biz göyü, yeri və onların arasında olanları [bütün məxluqatı] boş-boşuna yaratmadıq. Bu, kafirlərin zənnidir. Vay cəhənnəm odunda yanacaq kafirlərin halına!»

B.1207. İki-üç kəhər – Günəş, Ay və Yer.

B.1208. Tazələr – sitarələrə işarədir. Tazəsəfərlər və qədimavazələr – əslində qədim olub yeni zahir olanlar; asimani cismlərə işarədir.

B.1210. Eyb və hünəri hər iki aləmə nisbət verirlər ki, bu eyb və hünər sənin vücudunla əlaqədardır və hər ikisi sənin tərkində qərar tutmuşdur; başqa sözlə, hər ikisinə sahib olmaq qabiliyyətin vardır.



B.1211. Həmxanə – bir evdə yaşayan iki, yaxud bir neçə nəfər. Cahanı «böyük aləm», insanı isə «kiçik aləm» adlandırırlar. Böyük aləm və kiçik aləm «aləm» kələməsində şərik və həmxanədirlər. Yeri (torpağı) quşa, insanı isə danəyə ona görə təşbih etmişdir ki, insanlar torpağın yemi olur, torpaq tərəfindən bir-bir dənlənir və torpağın qarnında qərar tutur.

B.1212. Vücudu didən quş – yerə (torpağa) işarədir. Qaf quşu – Simurğ. Sən bu torpaq quşunun başı üstündə Simurğ ol, (Simurğ bütün quşların padşahıdır) bu quş sənin xidmətində olsun, yə'ni sən maddiyata hakim ol, maddiyat sənə hakim olmasın.

B.1213. Pəri (qanadı) qəfəs olan quş – ruh. (insan ölən vaxt ruh bədəni tərk edir və qəfəsdən uçur). Beytin mə'nası: Sən ruhun şəhpərinə süvar olmusan, (o, sənin altındadır) halbuki, onun rütbə və məqamı səndən yuxarıda (üstdədir) qərar tutur. Çünki, sən torpağa, (torpaq aləminə) o isə asimani aləmə mənsubdur.

B.1214. Birinci misra – «Ölməyinizdən əvvəl ölün!» – hədisinə işarədir. İkinci misrada deyir ki, ruhu bədənə hakim qərar ver.

B.1215. Vilayət – insanın əsli (əvvəl) mənzilinə işarədir.

B.1217. Ağ-qara xətmi – ikiliyin başa çatması.

B.1219. İki aləmin yolu iki mənzildir və ürək bu yolu bir nəfəsə başa vurur.

B.1221. Bədən toz-torpaqlı kilimə bənzədilmişdir ki, bu toz-torpaqdan bir şey hasil etmək mümkün deyildir. Rövşən ürək – agah ürək, arif.

B.1225. Əgər ürəyinin aram olmasını istəyirsənsə, ahu nafəsi kimi əziyyətə döz, yə'ni riyazətdən üz döndərmə. İki beytdən sonra bu məfhum təkrar olunur: Müşk cod dəridə aram olur. (Nafəni cod parçaya bükürlər ki, müşkün ətri getməsin).

B.1226. Şəriət baxımından ipək libas geyinmək haramdır və cayiz deyildir. Badamə – ipəkqurdu; burada ipəyə işarədir.

B.1227. Ahunun dərisini nazik edəndən sonra kağız kimi üstündə yazı yazardılar.

B.1229. Şəkəri çuvalda saxlayardılar, qarışqa və digər həşəratdan mühafizə etmək üçün ağzını möhkəm bağlayardılar. Burada çuvalın içində olan şəkərin «təngnəfəs» olmasına eyham vardır. İkinci misrada daşı sədəfə təşbih etmişdir; sədəfdə mirvari, daşda isə gövhər yaranır. Hər iki misra «təhəmmül et!» mə'nasını ifadə edir.

B.1230. Səhər nə'li – hilal. Ay, qəməri ayın axırlarında sübh vaxtı görünür. Səhəri – ata və Ayı onun nə'linə təşbih etmişdir. Birinci misranın mə'nası: Yə'ni, riyazət çək və əziyyətə təhəmmül et.

B.1234. Acı şərab şadlığa səbəb olduğu kimi, müsibət də insana xudbinlik bəlasından şəfa verir.

## OVÇU, İT VƏ TÜLKÜ DASTANI

B.1241. İt o qədər sür'ətlə qaçırdı ki, ahunun Günəşin nuru tə'sirindən peyda olan kölgəsini tuturdu. (İtin sür'ətlə qaçması və şikarı tutması tə'rifində «iğraq» sən'əti işlətmişdir; çünki, kölgə tutulmağa qabil deyildir).

B.1246. Qəza – təqdir, Allahın hökmü. Beytin mə'nası: Ovçu öz-özünə dedi: əgər itin itgin düşməsi Allahın hökmü ilə baş vermişdirsə, onun müqabilində mənə daha artıq və qiymətli mükafat yetəcəkdir.

B.1248. O, öz hövsələ və qüvvəsindən xaric olan bir səbr və dözüm göstərdi və nəticədə səbr ona fayda gətirdi.

B.1249. Tülkü məsxərə ilə deyir ki, itin bugün sənin üçün etdiyi ov o qədər böyük və ətlidir ki, sənin iki aylıq yeməyini tə'min edər.

B.1253. Dərviş – fəqir, yoxsul; tülkü özünü «dərviş» adlandırır.

B.1258. Gecə – işıqlı gündüz ilə hamilə olur.

B.1260. Bu qəlib içrə dolanar – yə'ni, bir haldan başqa hala düşər.

B.1263. Yusif gününə düşmək – itgin düşməyə işarədir. Köynəyi neyçün didim?! – yə'ni, səbrli olacağam, səbr edəcəyəm.

B.1268. Sənin e'tiqadın mənim boynuma çənbər oldu və məni sənə tərəf döndərdi.

B.1269. Yəqin – ürək kəşfi ilə ğeybi müşahidə. İradət – ixlas.

B.1271. Əgər ayaq yəqin yolunu tutub getsə, hikməti və fəhmi olan baş kimi olur. Yəqin zənn – ğeybi müşahidə ilə uyğun fikir. Beytin mə'nası: Əgər yəqin yolundan bir daşı qaş-daş (qızıl) təsəvvür etsən, həman daş sənin üçün qaş-daş (qızıl) xasiyyəti peyda edər və qızılın gördüyü işi görər.

B.1272. Əgər yəqin vasitəsi ilə getsən, sənin yolunda dərya – torpaq, atəş isə su olacaqdır. Həzrəti-Musanın Nil çayından keçməsinə və atəşin soyuq olub Həzrəti-İbrahimi yandırmamasına işarədir. Qur'ani-Kərimin 26-cı (Şüəra) surəisnin 63-cü ayəsində deyilir: «Onda Musaya belə vəhy etdik: «Əsanla dənizə vur!» [Musa əsasını dənizə vuran kimi] dərhal yarıldı [İsrail oğullarının soyuna müvafiq olaraq on iki hissəyə bölündü] və hər hissə böyük [uca] bir dağ kimi oldu». Həmçinin, 21-ci (Ənbiya) surəsinin 69-cu ayəsində deyilir: «Biz də: «Ey atəş! İbrahimə qarşı sərin və zərərsiz ol!» [Hətta soyuğun belə ona zərər yetirməsin!]» – deyə buyurduq».

B.1273. «Ər-rizqu əl-Əllah» – ruzi Allahdandır. Qur'ani-Kərimin 11-ci (Hud) surəsinin 6-cı ayəsinə işarədir: «Yer üzündə yaşayan elə bir canlı yoxdur ki, Allah onun ruzisini verməsin».

B.1278. Biz ayağıq – yə'ni, əgər bizi yəqin əhli ilə müqayisə etsələr, biz bədənin ayağı, onlar isə bədənin başı mənziləsində olacaqlar ki, fikir və düşüncələri vardır.

B.1279. Deyirlər, bə'ziləri irfanda elə bir məqama yetirlər ki, səccadəni (üstündə nəmaz qılınan fərş) suya sərib onun üstündə yol gedirlər, su onları ğərq etmir və əgər iradə (əzm) etsələr saf meyi bala döndərə bilirlər. Sə'di «Gülüstan»ın ikinci babında yazır: «Dedi: – Yadımdadır ki, şeyx Məğrib dəryasının üzərində yeriyir, ayağı da islanmırdı». («Gülüstan», səh.80. Səid Nəfisinin hazırladığı mətn).

Amma, Xacə Əbdullah Ənsari bu qəbildən olan əmrlərin əhəmiyyətsiz olduğunu e'tirazla bəyan edir: «Əgər havada uçsan milçək olursan, əgər su üzərində yerisən çör-çöp olursan, ürəyi ələ gətir ki, bir «kəs» olasan».

B.1280. Bir ömr ki, bir günlük səbatı yoxdur, yə'ni bu günün axırına qədər diri qalacağına arxayın deyilsənsə, nədən ötrü onun üçün on illik ruzi fikrindəsən?!

B.1284. «Nəhnu qəsəmna» – Qur'ani-Kərimin 43-cü (Zuxruf) surəsinin 32-ci ayəsinə işarədir: «[Ya Məhəmməd!] Məgər sənin Rəbbinin mərhəmətini [peyğəmbərliyi] onlarmı paylaşdırırlar?! Dünyada onların dolanacaqlarını öz aralarında Biz bölüşdürdük. Biri o birinə iş gördürsün deyə, birinin dərəcəsini digərindən üstün etdik. Sənin Rəbbinin mərhəməti onların yığdıqları dünya malından daha yaxşıdır!».

B.1285. Əhd – peyman; əhdi-ələstə işarədir.

## YEDDİNCİ MƏQALƏ

### İNSANIN BAŞQA CANLILARDAN FƏZİLƏTİ HAQQINDA

B.1289. Ordan – yə'ni, o yerdən, o yerin səbəbindən (yuxarı aləmə işarədir ki, ruh o yerdəndir). Beytin mə'nası: Ruhlar aləmindən olmağın və bədəndə məhbus olmadan əvvəl hər şeydən xəbərdar olmağın səbəbindən sənin işlərin güman etdiyindən daha artıq və ali məqama yetdi.

B.1290. Bəslədi şəkkərlə səni – əhdi-ələstə işarədir. Qur'ani-Kərimin 7-ci (Ə'raf) surəsinin 172-ci ayəsində deyilir: «[Ey peyğəmbərim!] Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən [gələcək] nəsillərini çıxardıb onları özlərinə [bir-birinə] şahid tutaraq: «Mən sizin Rəbbiniz deyiləmmi?» – soruşmuş, onlar da: «Bəli, Rəbbimizsən!» – deyə cavab vermişdilər. [Belə bir şahidliyin səbəbi] Qiyamət günü: «Biz bundan qafil idik».

B.1291. Yaxşılığın cəhd elə artsın hələ – yə'ni, əgər hal-hazırda yaxşısansa, bundan daha yaxşı olmağına sə'y et; çünki, sənin haqqında olunandan daha artıq bir yaxşılıq yoxdur.

B.1293. Canı telə (riştə, sap) təşbih etmişdir; çünki, bədənin cüz'lərini bir-birinə bağlayan candır. Can bədəni tərk etsə, bütün cüz'lər bir-birindən ayrılar. Qədim təbiblər cigəri qanın vaqe' olduğu yer, qanı isə ruhun vaqe' olduğu yer hesab edirdilər.

B.1295. Bütün canlılar ot-ələf yeyən quşlar kimi sənin toruna düşmüşlər və sən onları şikar edib öz xidmətində saxlamısan.

Şərhi: Quş dən yeyir və dəni ətə çevirir, yə'ni biz onun ətini yeyirik. Əti həlal olan heyvan ot yeyir və otu ətə çevirir. Bizim üçün ət hazırladıqlarına görə onları ot-ələf yeyən quşlar adlandırır.

B.1296. Əgər Hümasan (xoşbəxtlik quşu) şərəfli işlər gör və başqalarına əziyyət vermə. Sə'di deyir:

Hüma hamı quşlardan ona görə şərəflidir ki,
Sümük yeyir və canlılara əziyyət etmir.

B.1298. Xəzinə viranədə olur və bayquş da viranədə yaşayır. Ona görə də bayquşu xəzinə bülbülü adlandırır.

B.1299. Dünyanı gecə oyunu çadırının pərdəsi və mövcudatı həman pərdənin üstünə düşən kölgə kimi təsvir edir. Yə'ni, bu



mövcudat bihudə deyildir və onların canlarının cismlərinə münasib qiyməti var.

B.1300. Onların dəryasının gövhəri sənin dəryanın gövhəri kimi qiymətli deyildir, yə'ni sən onlardan şərafətlisən; amma onların da əsli vardır və bu aləmin gövhəridir.

B.1301. Hesaba çəkmək – hesab ayağına çəkmək. Beytin mə'nası: Az və çoxu (böyük və kiçiyi) hesaba çəkdikdə onlara vurduğun zərərin cəriməsi əndazəsində əziyyət və narahatlığa müntəzir ol.

B.1304. Sübhün işığında hər şey görünür, amma gecə vaxtı heç bir şey görünmür. Ona görə də gecəni «pərdə tutan», səhəri isə «pərdə atan» vəsf etmişdir.

B.1305. Bu arı pərdəsi – asiman öz ulduzları ilə şəbəkəli və arı pətəyi kimi görünür.

B.1307. Pərdə tutanlar – fələklərə və göy cismlərinə işarədir.

B.1308. Pərdə – ahəng. Yol – nəva. Beytin mə'nası: Sənin avazın (nəva) bu pərdənin ahəngindən artıq (yuxarı) idi, məxluqatın əşrəfi olduğun üçün naçar bu pərdədən xaric oldun. Başqa sözlə, ruh nöqteyi-nəzərindən ülvi aləmdənsən və maddi aləmlə münasibətin yoxdur.

B.1309. İkinci misrada pərdə – asimana işarədir.

B.1313. Bir guşəyə çəkilib qırx gün riyazət və ibadətlə məşğul olmaq və dünyəvi ləzzətləri tərk etmək nəzərdə tutulur.

B.1316. Dörd gövhərin simi – dörd ünsür: qan, bəlğəm, səfra, sövda. Dörd ünsürü gümüşə təşbih etmişdir. Təbiət zəri – təbiəti (təb') zərə təşbih etmişdir. Beytin mə'nası: dörd ünsür gümüş kimidir, əgər onları riyazət əlinə versən (tapşırsan) islah olunarlar (tərbiyə olunar və pakizə olarlar) və nəticədə səndə zər təbiəti (mizacı) peyda olar (gümüş qızıla çevrilər).

B.1319. Əql – əttara, təb' (nəfs) isə dəmirçiyə təşbih olunmuşdur. Əttar dükanında xoş ətr, dəmirçi dükanında isə tüstü və toz-torpaq olur. Əmir Xosrov Dəhləvi deyir:

Nə qədər dəmirçi kürəsi kimi,
Hər tərəfdən od tüstüsü verəcəksən?
Əttar kimi ol ki, onun yanında
Libasın onun nəfəsindən müəttər olar.

B.1320. Dəmirçi dükanı dəmirdən çıxan qığılcımlarla üzünü çopur-çopur edər, əttar dükanı isə öz nəfəsindən sənə ətr saçar.

B.1327. Əbutalib – Rəsuli-Əkrəmin (s) əmisidir və uşaq vaxtı Peyğəmbər əleyhissəlamı öz qucağında böyütmüşdür. Bu səbəbdən Əbutalibdə o Cənabın ətri vardı. Əbutalib zahirən islamı qəbul etməmişdi (təqiyyə etmişdi) və deyirlər ki, onda Peyğəmbər əleyhissəlamın ətri olduğuna görə atəş onu yandırmayacaq.

## FİRİDUN VƏ AHU DASTANI

B.1331. Boynu və gözləri onun diri qalmasını himayət edirdi; başqa sözlə, onun boynunu və gözlərini görən hər bir kəsin ürəyi gəlmirdi ki, onu şikar etsin.

B.1334. Bağrı kimi – yə'ni, ahunun bağrı kimi. Qarnı kimi - yə'ni ahunun qarnı kimi. Yə'ni, atı cövlana gətirdi, yayı çəkdi və oxu atdı.

B.1336. Oxun havada yaxşı uçması üçün ona kərkəs (qaraquş) yaxud qartal lələyi bərkidərdilər. Həkim Nasir Xosrov ox ilə vurulmuş qartaldan bəhs edərək deyir:

Diqqətlə baxıb onda (oxda) öz lələyini gördü,
Dedi: – Kimdən şikayət edək ki, bizə [dəyən] özümüzdəndir.

B.1340. Böyüklərin nəzərində xoşa gəlməz ki, bu ahunun nazik dərisi dəfə çəkilsin və mütriblərin (xanəndələrin) əlində döyülsün.

B.1345. Onu sanma gəda – yə'ni, onu yoxsul güman etmə, dövlətlidir. Beytin mənası: Əjdəha o səbəbdən xəzinə sahibi olmuşdur ki, başdan-ayağa qədər kəmərdir və kəmər xidmət nişanəsidir.

B.1346. Başda qoyulmuşdur – yuxarıda qərar tutmağa işarədir. Beytin mə'nası: Fələk bütün vücudu ilə xidmət kəməri olmuşdur. (Fələk və fələkin hərəkəti xidmət etmək üçündür). Bu səbəbdən ucalıq tapmışdır və ona yuxarıda olmaq qərar verilmişdir.

B.1348. Şəm'– mum. Xacəlik – ağalıq, böyüklük. Beytin mə'nası: Şəm' ona görə nur sahibi olmuşdur ki, bir müddət arıya xidmət etmişdir, yuva düzəltməkdə ona fayda vermişdir. Burada arının nazik belinə və belində kəmərə bənzər həlqələrin olmasına eyham vardır.

B.1349. Bağlı deyilsən – yə'ni, daş deyilsən, (cəmad) cansız deyilsən. Beytin mə'nası: Nizami, qalx! Çünki, sən Allaha və xəlqə xidmət etmək üçün kəmərbəstəsən; sən dirisən, cəmad deyilsən ki, bir küncdə hərəkətsiz qalasan.



## SƏKKİZİNCİ MƏQALƏ

## XİLQƏTİN GÖZƏLLİYİ HAQQINDA

B.1350. Ən əvvəlki vücudlar – Fələklər. Su içən bir gilə – yə'ni, mövcudat vücud dəryasından su içmədiyi vaxt; başqa sözlə, mövcudatın vücuda gəlməsindən əvvəl.

B.1352. Və'deyi-tarix – tarixin müjdəsi, tarixdən xoş xəbər. (tarix xilqətdən sonra yaranmışdır). Burada həmçinin, Kainatın altı gündə yaranmasına işarə olunur: «And olsun ki, Biz göyləri, yeri və onların arasında olanları altı gündə yaratdıq və [bundan] bizə heç bir yorğunluq da üz vermədi». (Qur'ani-Kərim, 50-ci (Qaf) surəsi, 38-ci ayə). Deyirlər ki, bu altı gündən hər biri min ilə bərabər olmuşdur.

B.1354. Cəng – çəkişmə, cəncəl. «Et!», «Etmə!» – əmr və nəhy.

B.1355. Burada Nizami aşkar şəkildə deyir ki, Allah bütün maddi aləmi «öz feyzindən atdığı bir qətrədən» yaradıb. Mə'lum olur ki, bu «qətrə» ğeyri-maddi olan «Feyz»dən yaranıb, yə'ni maddi varlıqlar Allahın əmri ilə yoxluqdan yaranıb.

B.1358. Tor – maddi aləm. Kəm olur bir ğübar – yə'ni, qiymətsiz bir şey aradan gedir.

B.1360. Fələk gözləri – ulduzlar. Yer eşitməzdi – yə'ni, yerdə yaşayanlar eşitməzdi. Adəmdən əvvəl yer üzü cin tayfasının ixtiyarında idi. Onda ki insan xilqətindən söhbət oldu və Allah-Təala buyurdu: – «Mən yer üzündə bir xəlifə [canişin] yaradacağam», – (Qur'ani-Kərim, 2-ci (Bəqərə) surəsi, 30-cu ayə.) – söz-söhbət qalxdı.

B.1361. Varlıq ədəmə şükr edirdi. Onda ki sən yarandın və varlığın narahatlığının mayəsi oldun, varlıq ədəmdən narazı oldu ki, nə üçün səni meydana gətirdi.

B.1362. Xar və sərsəm ğübar – hər ikisi insana işarədir.

B.1363. Bitki – nəbatat xədim idi, toxum və meyvə vermək qabiliyyəti yox idi. Dul – arvadı olmayan kişi.

B.1364. Belə təsəvvür edirdilər ki, hər kəs Cövza tale'ində (Günəş Cövza bürcünə may ayının 22-də daxil olur) qan

aldırsaydı, vərəm ilə nəticələnərdi. Beytdə deyilir: Onda ki sən vücuda gəldin, qan almaq vərəmini Cövzaya nisbət verdin. Halbuki, səndən əvvəl xidmət kəməri bağlamışdı və səninlə bağlı olan şeylər ona nisbət verilməmişdi.

B.1365. Üzü qarə olan Ay – Ayın tutulması. (xüsuf). Teştin ilə... – əvamlar Ay tutulduqda mis teşt döyərdilər və bu əqidədə idilər ki, teştin səsi Ayı tutmuş Əjdəhanın qorxub qaçmasına səbəb olur.

B.1366. Deyilənə görə, öz nalayiq əməllərinə görə Allah-Təala Zöhrəni ulduza döndərdi, Harut və Marutu isə Babildə bir quyuda başı aşağı vəziyyətdə məhbus etdi; onlar Qiyamətə qədər bu vəziyyətdə qalacaqlar. Salmadı Harut qanadın Babilə – yə'ni, Harut (və Marut) pərvaz etmək qüdrətini əldən verdi. (bunlara səbəb insan oldu).

B.1367. Sən kənar idin – yə'ni, sən yox idin, amma sənin xilqətinin iradəsi arada idi.

B.1369. Sənin gözün yaxşını görmür, amma gözündə olan hər naqisliyi ulduzlara nisbət verirsən: «sabit» və «səyyar». Ütarid, Zöhrə, Mirrix, Müştəri və Zühəli – «xəmseyi-mütəhəyyirə» – yə'ni, beş biçarə və sərgərdan sitarə adlandırdın; halbuki, sənin gözün belə təsəvvür edir. Kövkəbə – bayrağın başında bərkidilmiş parlaq, qübbə şəklində olan yarımdairə. Yə'ni, Ay dairəvi olduğu halda sənin gözün onu yarımdairə (hilal) şəklində görür.

Burada Ayın dörd vəziyyətindən – bədr, tərbi', (səyyarələr arasındakı bucaq 90 dərəcə olanda, bu vəziyyətə «tərbi» deyilir; çünki bu halda onların arasındakı bucaqlar Zodiak dairəsinin dörddəbirini təşkil edirlər. Tərbi'– dörddəbirlik deməkdir.) hilal və mihaq (mihaq – qəməri ayın axırıncı üç gecəsi – 27-ci (ya 28-ci) gecəsindən 29-cu (ya 30-cu) gecəsinə qədər Ay görünmür.) – söhbət gedir ki, bu adları Aya insan vermişdir.

B.1370. Ay ilə il dövrdən azad idi – yə'ni, hələ tarix yaranmamışdı.

B.1371. Adəmdən əvvəl yer üzü ayna kimi pak idi, bir dəstə adam onu eybli etdi, qaraltdı. Şərhi: Qədimdə aynanı dəmirdən düzəldərdilər. İnsanın nəfəsində su buxarı vardır və insan aynaya yaxınlaşdıqda ayna soyuq olduğundan nəfəs çox xırda su qətrələri şəklində aynaya oturur və onu qaraldır. Əgər nəfəslər çox olsa, ayna dəmirdən olduğu üçün cəng (pas) atır.

B.1372. Məş'əli-sübh – Günəş. Şama aparmaq – ğürub nisbət vermək. Sadiqu kazib – sübhi-kazibə (yalançı sübhə) işarədir.



Sübhi-kazib, sübhi-sadiqdən (doğru sübhdən) əvvəl baş vurur, ala-toranlıq olur və hava yenidən qaralır. Beytin mənası: Sən sübh çırağının (Günəşin) tülu' və ğürub etməsinə qail oldun və sübhə sən «sadiq» və «kazib» adını qoydun.

B.1373. Göylərin ağzına yerin torpağı olsun ki, sənin kimisinin xidmətində olmaq üçün belinə qurşaq (kəmər) bağlamışdır.

B.1374. Şərhlərdə varid olmuşdur ki, mələklər insan barəsində – «İnsan ruhların meyvəsidir» – demişlər. Yaxşı eşit – yə'ni, eşit, amma inanma, doğru hesab etmə. Dil ilə söylədi – yə'ni, ürəkdən və əqidə saflığı ilə demədi; bəlkə: – «Biz sənə şükr etdiyimiz, şə'ninə tə'riflər dediyimiz və səni müqəddəs tutduğumuz halda, sən yer üzündə fəsad törədəcək və qan tökəcək bir kəsmi yaratmaq istəyirsən?» – söylədilər. (Qur'ani-Kərim, 2-ci (Bəqərə) surəsi, 30-cu ayə).

B.1375. Tacın – mələklərin insana verdiyi «can meyvəsi» ləqəbinə işarədir. Şərhi: Başın qiyməti tacdan artıqdır, çünki tac baş üçün ziynətdir. Nizami deyir: Sənin qiymətin o ləqəbdən də əskikdir!

B.1376. Sənin tə'rifində laf və iddia çox olmuşdur. Bu də'va yeri – dünyaya işarədir. Beytin mənası: Laf olanlardan biri bu olmuşdur ki, dünya sənin üçün bir arpa qiymətindədir. Amma, əməldə bir ovuc torpağı bir can qiymətinə verirsən və torpaq-saman içində çürüyən bir arpanı bir cahan qiymətinə satırsan. Şərhi: Torpağı saman ilə qarışdırıb damların üstünü örtürdülər; nadir hallarda samanın içində dən qalır və üstü torpaqla örtülü olduğundan və su içməməsi səbəbindən arpa bir müddətdən sonra çürüyüb məhv olur.

B.1379. Simab – civə; gümüş rəngində olan maye'dir, müəyyən temperaturda parçalanır və müxtəlif istiqamətlərə hərəkət edir. Sincabi fındıq – sincab rəngli fındıq; asimana, fələkə işarədir. Beytin mənası: Sənin əqlinin yağı mütəhərrikdir, amma bu sincab rəngli fələk buz kimi soyuq gərdiş edir, sənin əqlinin ona tə'sir etmək qüvvəsi yoxdur.

B.1380. Nə qədər ki, xanəni darısqal etməyib (qəbrə göndərməyib) cahanı tərk et və onunla əlaqəni kəs.

B.1381. Qaqum – qiymətli ağ dərisi olan heyvandır və ədəbiyyatda gündüz rəmzi kimi işlənir. Qunduz – qiymətli qara dərili bir heyvandır və gecəyə işarədir. Beytin mənası: Gecə və gündüzü qaqum və qunduz ilə müqayisə etmə, bunlar bir-

birindən xeyli fərqlidir. Bu dələ – yə'ni, fələk bəbir kimi (bəbir iki rəngli, ala-bula olduğundan gecə və gündüzə işarədir) ·yırtıcı xasiyyətlidir və əjdəha kimi adamı udandır.

B.1382. Deyilənə görə, vəhşi pişik dələnin qabağından yeməyini götürdükdə dələ ona qarşı bir hərəkət etmir. Dələ – fələkə işarədir.

B.1383. Şir heyvanatı ovlamaq üçün suyun bir kənarına ağzının suyunu tökür, digər kənarında isə pusquda durur. Heyvanat həmin iydən xətəri hiss edib suyun o biri kənarına üz qoyurlar və bu halda şir pusqudan qalxıb şikarı ələ keçirir.

B.1386. Təbaşir – qamışın bir növ'ündən hazırlanan dərmandır ki, təşnəliyin (susuzluq yanğısının) aradan qaldırılması üçün işlədilir. Beytin mənası: Təşnə olmamaq və sənə su göstərənlərə və ilğım görünənlərə tərəf getməmək üçün yaxşısı odur ki, vaqiənin əlacını vaqiə baş vermədən əvvəl edəsən. Öz vücudunu yandırıb külə döndərən və riyazət vasitəsilə təşnəliyə ğələbə çalan təbaşir kimi olasan ki, heç vaxt təşnə olmur, bəlkə təşnələrə nicat verir.

B.1387. Yusif – ruha işarədir. Quyu – maddi aləmə işarədir. Misri-ilahi – ilahi məmləkət; ülvi aləmə işarədir. Beytin mənası: Onda ki sənin ruhun bu dünya quyusunda əsir deyildi və ülvi aləmdə idi, tamaşa etdiyi – ülvi aləm, arzu etdiyi – ruhlar Misrində qalmaq və oradan uzaq düşməmək idi. Onda ki bu quyuya düşdü, dünyaya hərislik və məhəbbət tə'sirindən rəngi saraldı.

B.1389. Səfra – sarılıq, sarılıq xəstəliyi. Qədim təbabətdə sarılıq xəstəliyinin müalicəsində sirkədən istifadə edirdilər və hesab edirdilər ki, sirkə səfranı aradan qaldırır. Qaşlarının sirkəsi – üz turşutmağa işarədir.

B.1390. Yağlı yeməklər və ağır yağlardan istifadə etmək səfranı artırır. Deyilənə görə, sirkə nə qədər köhnə olsa, bir o qədər tünd və tə'sirli olur. Beytin mənası: Sən çox ağır və köhnə yağ yemisən və onu müalicə etmək üçün on illik sirkə fayda verməz. Burada eyham vardır ki, tamah yüz ildir ki sənin damarlarında tə'sir edir və ömrünün axır on ilində ondan üz döndərməyin fayda verməz. Zira ona görə üz döndərmisən ki, artıq mə'dən onu həzm etmək qüdrətində deyildir.

B.1391. Bu yeddi süfrə (həft xan) atanın qanını tökdü, yə'ni Həzrəti-Adəm buğda yeməsi səbəbindən Behiştdən xaric oldu, sən yeddi qürs çörək üçün öz üzünün suyunu tökmə. Həft xan – yeddi səyyarə və ya yeddi iqlim (təbəqə) hesab olunan Yerə işarədir. Yeddi kökə – həftəlik ruzi və xərcə işarədir. Şərhi: Həyatın təkrarı həftənin günləridir və buna görə də ömrün illərinin azuqəsi «yeddi kökə» – yə'ni, həftənin azuqəsi kimi işlənmişdir.

B.1392. Od – tamah və dünyapərəstlik. Dövlətə təpik atmaq – nadanlıqdan öz mənfəət və qazancını əldən vermək.

B.1393. Sə'y et ki, sənin üçün geniş imkanlar var və dövran sənindir.

B.1395. Sən ixtiyar sahibi olduğun üçün ovsarını üstünə atıb bu torpağa buraxıblar və sənin haqqında zülm ediblər.

B.1396. Qocalığın tə'sirindən ayaqların hərəkətdən qalıb və belin bükülmüşdür, şişdə kabab olan yağlı qoyun əti kimi öz yağın ilə yanırsan. Saib deyir:

Zalimlərin önündə acizlik göstərmək xətadır,
Kababın göz yaşı atəşin tüğyanına bais olur.

B.1397. Mətbəx – dünyaya işarədir. Duzəxin ələfi – Qur'anın 3-cü (Ali-İmran) surəsinin 10-cu ayəsinə işarədir: «Haqqı inkar edənlərin nə malları, nə də övladları onları Allah yanında [axirətdə] heç bir şeydən qurtara bilməz. Əlbəttə, onlar cəhənnəm odunun yanacağıdırlar!».

B.1406. İnsanın yediyi hər bir şey onu həzm etdikdən sonra ə'zada rəng qəbul edir, hər üzvdə həmin üzvün rəngini alır.

## DOQQUZUNCU MƏQALƏ

## ALİCƏNABLIQ VƏ ALİ HİMMƏT HAQQINDA

B.1415. Ey vüsal axşamından daha əziz və ömrü sübh bayrağından daha kəm və tez ötüb keçən insan! Sübh ələmi – sübhün ağlığına işarədir ki, Günəşin çıxması ilə yox olur.

B.1424. İnsandan başqa bütün mövcudat hamı ani və müvəqqəti mənfəət ardınca gedənlərdir. Bu, insandır ki, gələcək zaman üçün əvvəlcədən fikirləşir və azuqə hazır edir.

B.1425. İnsandan başqa heç kəsin aqibət haqqında düşünməyə sə'yi (himməti) yoxdur; digər mövcudatın bəsirəti bir nəfəsdən artıq deyildir.

B.1431. Doqquz vərəq əbcəd – doqquz fələkə işarədir. Beytin mənası: İnsan öz mütəfəkkir ruhunun feyzi vasitəsilə doqquz fələkin əlifbasını torpaq lövhədən oxudu.

B.1432. Dağ – nişan; burada doqquz fələkin əlifbasını oxumağa işarədir. Bağ – bu dünyaya işarədir.

B.1433. O gün ki Adəmin torpağını xəlq etmək üçün ələkdən keçirtdilər, məqsəd onu ürək ilə qarışdırıb yoğurmaq və «ürək mə'cunu» vücuda gətirmək idi.

B.1439. Günəş Həməl bürcünə daxil olanda bahar fəsli başlanır. Beytin mənası: Sən bu dünyaya gəlməmişdən əvvəl yuxarı aləmdə idin və əzəmətin torpaq üstündə olan bütün mövcudata həyat bəxş edən ilk bahar Günəşi kimi idi, yüksəklərə pərvazın nəhayətsiz idi.

B.1441. Su və torpaq – insanın xəmirinə işarədir; insanın bədəni.

B.1442. Tağ – günbəz, eyvan; bədənə işarədir. (yerə, torpağa işarə olması da mümkündür). Gün ətəyi üstə alırsan ayaq – yə'ni, Günəşdən də yuxarı və yüksəklərə uçacaqsan.

B.1443. Əgər bir müddət hər şeydən ayrılsan da, (yə'ni, mücərrəd olsan da) onda da (yə'ni, «mücərrəd olmaqda»da) çox davam etməyəcəksən.

B.1444. Tərəddüd – biqərar olmaq, səbatsız olmaq; burada kəmali-seyrə işarədir.

B.1445. Müflis – ruhun mücərrəd olmasına işarədir (ruh mücərrəd olmasına baxmayaraq, həyat bəxş edəndir). Köhnə olan tazə – ruh cəsəddən əvvəl olması nöqteyi-nəzərindən köhnədir. (Allah-Təala ruhları cəsədlərdən əvvəl xəlq etmişdir). Həmçinin, ruh heç vaxt köhnəlmədiyinə görə Nizami onu «tazə» adlandırır. Əsədi Tusi sözü vəsf edərkən ruhun köhnəlməməsinə işarə edir və deyir:

Söz can kimidir, ona görə də köhnəlmir,
Çünki, şirin söz canın fərzəndidir.

B.1446. Oğluna qatil ana – dünyaya işarədir.

B.1447. Ata – Həzrəti-Adəmə işarədir. Adəm Behiştdən xaric olandan sonra tövbə etdi, ağladı və günahının bağışlanması üçün tövbəsinin qəbul olunmasını istədi.

B.1452. Zəhmət – Qur'ani-Kərimin 90-cı (Bələd) surəsinin 4-cü ayəsinə işarədir: «Biz insanı məşəqqətlə yaratdıq! [İnsan doğulduğu gündən qəbr evinə gedənə qədər əzab-əziyyət içində çalışıb çabalayar, həyat boyu müxtəlif çətinliklərlə üzləşər. Bu ilahi bir hikmətdir, həyatın qanunudur!]».

B.1453. Cahanın alveri – həyat və ölümdür.

B.1456. Ədəmin yoxluğunda şəkk-şübhə yoxdur, şəkk-şübhə varlığın olub-olmamasındadır ki, görəsən var ya yoxdur. Mövləvi deyir:

Biz varlıqları göstərən yoxluqlarıq,
Sən fənanı göstərən mütləq bir vücudsan.

B.1458. Köçaköç dəmi – dünya evindən köçməyə, ölməyə işarədir. Tazə olur... – ruhun cəsədlər aləmindən ruhlar aləminə köçməsinə işarədir.

B.1459. Tazə olur həm bu atılmış ğübar – Qiyamət gününə işarədir ki, Allah-Təalanın əmri ilə çürümüş sümüklər yenidən cana gələcəklər. Pərakəndə – torpaq və zərrələr şəklində dağılmış insan bədəni.

B.1463. Süstgüman olma – yə'ni, e'tiqadını möhkəm et.

## ZAHİD DASTANI

B.1468. Mürği-həva – həva və həvəs quşu.

B.1469. Yol bağlayan ovqat – ömrü zay (puç) edən.

B.1471. Örtdü ədəb gözləri məndən niqab – yə'ni, ədəbi tərk etdim və ədəbsizlik etdim.

B.1472. Getsə ətəkdən bu ğübarım mənim – yə'ni, mən ölməyə layiqəm və yeri var ki, mən ölüm. (özünə qarğış edir).

B.1474-1475. Himmət o məscid əhlinə inayət etdi və sahibnəzərlər cərgəsində olan bir cavan ona dedi: – Qəza və qədər üçün yüz min sənin kimisinin bir arpa qədər qiyməti yoxdur.

B.1479. Ondan – yə'ni, otlamaqdan. (Şərhi: çox yemək ağır yuxuya səbəb olur).

B.1480. İnsan həddən artıq yatdıqda yuxudan durarkən gözləri qan çəkir və qızarır. Ölmüş ilə sağ... – yə'ni, ölü ilə dirinin bir yuxuda olması yaxşı deyil; başqa sözlə, adamlar əbədi yuxuya getmişlər, yaxşı deyil ki, dirilər də sağ ola-ola yuxuya getsinlər.

B.1482. Məlik – Sultan; ömr və cavanlığa işarədir. Burda xətər var – yə'ni, əgər burada qalsan oğrular qətl və ğarət edərlər.

## ONUNCU MƏQALƏ

## AXİRƏZZAMAN ƏLAMƏTİ HAQQINDA

B.1485. «Zəlzələt-əs saəti şəy'un əzim» – «Qiyamət zəlzələsi çox böyük şeydir». Qur'ani-Kərimin 22-ci (Həcc) surəsinin əvvəlinci ayəsindən iqtibas olunmuşdur: «Ey insanlar! Rəbbinizdən qorxun [Allahın əzabından qorxub pis əməllərdən çəkinin, yalnız Ona ibadət və itaət edin]. Həqiqətən Qiyamət gününün [axır saatın] zəlzələsi dəhşətli şeydir!».

B.1489. Sübhün ətri – məcazən, badi-səba mə'nasındadır.

B.1492. Gil möhrə – Yerə işarədir. (Yer kürrə şəklindədir).

B.1494. İnsanı fələkin və yerin yolu üstündə oturmuş toz hesab edir və insanın dünyadan getməsi ilə bu toz yoldan qalxır. (burada insanın zəhmətdən qurtarmasına işarə vardır).

B.1496. Bir ovuc torpaq – Yer kürrəsinə və yer üzərində olan, torpaqdan yaranmış insana işarədir. Şərhi: Çərxin pərəstişi (taəti) onun Yer ətrafında dövr etməsidir ki, qədimdə Yeri aləmin mərkəzi və sabit hesab edirdilər.

B.1499. Ğəm küpü – fələk, matəm – asimanın göy rənginə işarədir. Beytin mənası: Küp şərabın olduğu yerdir, torpaq tökülən yer deyildir. Küpə torpaq tökmək şadlığın köçüb getməsi (ölməsi) nişanəsidir və asimanın göy rəngli libas geyinməsi (matəm libası) onda şadlıq olmamasına dəlildir.

B.1501. Ətəyin pak olması – çirk və murdarlıqdan yuyulub təmizlənməsi. Yeddi su və torpaqla yuyulması – yə'ni, diqqətlə yuyulması, yeddi dəfə suya çəkilməsi və yuyulması. Sə'di deyir:

İt yeddi [dəfə] dəryada yuyulsa da,
Elə ki yaş oldu, daha da murdar olur.

Şərhi: İtin dəmlədiyi bə'zi şeyləri (məsələn, qabları) əvvəlcə torpaqla sürtüb pak edirlər, sonra su ilə yuyurlar. Bu səbəbdən, bu tə'kid və diqqət üçün Nizami «yeddi su və torpaq» deyir. Yeddi su – yeddi dərya. Yeddi torpaq – yeddi iqlim, yaxud torpağın yeddi qatı.

B.1503. Qur'ani-Kərimin 56-cı (Vaqiə) surəsinin 1-2-ci ayələrinə işarə olunur: «Qiyamət vaqe' olacağı [qopacağı] vaxt. Onun vaqe' olmasını heç kəs dana bilməz!».

B.1505. Baş uçunar – baş damarlarının qıc olmasını başın zədələnməsi və şikəst olması hesab edirdilər. Bu uçunmaq – burada «Məxzənül-əsrar» əsərini yazdığı vaxt Gəncədə və digər məmləkətlərdə vaqe' olan zəlzələyə işarə olunur.

B.1506. Müşksədəf – müşk rəngli sədəf; fələkə, asimana işarədir. Gözləri gövhər – ulduzlara işarədir. İçi – yə'ni, asimanın içi. Asimanı içində timsah (nəhəng) olan gövhərlə dolu dəryaya təşbih etmişdir.

B.1507. Bu müşk rəngli sədəf mirvari sədəfi və dərya sədəfi deyil, bəlkə gözü mirvari edən bir sədəfdir. (yə'ni, gözü kor edər). Nəzər cövhəri – göz nuru, göz bəbəyi.

B.1508. Əf'i gözü – belə təsəvvür edirdilər ki, zümrüdə baxdıqda əf'i gözü kor olur.

B.1509. Sanma ki, çemində onun nur olur – onun, yə'ni, müşk rəngli sədəfin gözündə nur görmək və bəsirət yoxdur. Min göz – ulduzlara işarədir.

B.1513. Bu qapı – qəbrə işarədir. Bu baca – fələkə işarədir.

B.1523. Bir bayraq qaldırmaq üçün (yə'ni, şöhrətə yetmək üçün) çox zillət və xarlıq intizarında olmaq lazımdır və bir rütbəyə yetmək üçün («kəmər sahibi» olmaq üçün) çox bəndəliyə təhəmmül etmək lazımdır.

B.1525. Sübh ataşi – Günəşə işarədir. Mətbəx – aləmə işarədir.

B.1527. Solğunluq mərhəmi – can dərmanı, ruh verən, su. Qur'ani-Kərimin 21-ci (Ənbiya) surəsinin 30-cu ayəsinə işarədir: «Məgər kafir olanlar göylə yer bitişik ikən Bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?!»..

Pəjmürdəlik bəlğəmi – suyun az bir miqdarı bəlğəmin artmasına səbəb ola bilir, yə'ni ziyan gətirir. Şairin «əbr» (bulud) sözündən məqsədi sudur.

B.1528. Sor gəmilərdən: – Mövləvi deyir:

Su gəminin içində [olsa] gəmi məhv olar,
Su gəminin altında [olsa] onu himayə edər.

B.1531. Qədimdə aynanı dəmirdən (poladdan) hazırlayardılar; belə aynalar su buxarının tə'sirindən cəng (pas) tutardılar.

B.1532. Yaxandan hünər aşkar elə – yə'ni, hünərli olmağını göstər. Burada «yədi-beyza»ya (ağ əl) eyham vardır. Həzrəti-Musa əlini qoltuğuna salıb çıxardıqda ovcunda nur parlar idi və bu onun mö'cüzələrindən biri idi. Öz eyb ayinəni parılə – yə'ni, eyb görmək və eyb axtarmağı tərk et.

B.1535. Qarğa qara olduğuna görə gecə onu çırağ ilə də görmək mümkün deyildir. Gündüz qəfəsi – gündüzü Günəşin şüaları ilə toxunmuş qəfəs kimi təsvir etmişdir.

## İSANIN (Ə) DASTANI

B.1539. Yusif – ruha işarədir. Quyu – cismə işarədir.

B.1545. Eyvan – cism. Bu kitabın 443-cü beytində deyir:

Eşq dili şərh verir «can» bizə,
Biz – sözük, uçmuş saray – eyvan bizə.

B.1546. Yanmış sədəf – cəsədə işarədir. Diş ağartmaq – dişləri yuyub ağartmaq; burada istehzalı təbəssümə işarədir. Şərhi: Qədim təbabətdə yanmış sədəfdən dişləri ağartmaq üçün istifadə edirdilər.

B.1550. Doqquz tutuq – doqquz pərdə; doqquz fələkə işarədir.

B.1551. Üzük həlqəsi – fələkin hərəkət dairəsi; cahana işarədir. Tövq – gərdənbənd; burada boyunda olan yük, çətinlik və əzab mə'nasındadır.

B.1552. İt – məqsəd Böyük Köpək (Kəlbi-Əkbər) bürcüdür. Sürəyyanı onun boyunbağısı (gərdənbənd) təsəvvür etmişdir və demək istəyir ki, əgər heyvan deyilsənsə, heç kəsin minnəti ilə məmnun olma.

## ON BİRİNCİ MƏQALƏ DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA

B.1556. Nərdtaxta – asimana işarədir. (Ulduzları onun daşları fərz etmək e'tibarı ilə).

B.1560. Ğəm gəmisi – dünyaya işarədir. Öz malının boynuna salma qanın – yə'ni, sənin məhv olmağına məs'ul sənin malındır; çünki, gəminin yükü həddən artıq olduqda gəminin ğərq olmasına səbəb olur.

B.1561. At bu yükü – gəmiçilər tufan vaxtı gəminin yükünü yüngül edirlər və bə'zən gəminin və gəmidəki adamların salamət qalması üçün yükdən müəyyən qədər dəryaya atırlar.

B.1564. Ne'mətlə dolu hücrə – dünya ne'mətlərinə işarədir.



B.1567. Barmağı öz baş kasasında qalır – yə'ni, öz ölümünə səbəb olur.

B.1570. Tüstüyə tapşır... – yə'ni, qoy tüstü bu evin bacasından yuxarı qalxsın; başqa sözlə, bu evə od vur. Çör-çöpə təslim elə... – yə'ni, bu evi çör-çöp qiymətinə sat və tərk elə.

B.1571. Cahana əl açmaq – dilənmək və gədalığa işarədir. Yoxsa ki qarnından o çıxmış belə? – bu, o deyildir ki, əlini qarnından çıxartmısan?! Yə'ni, həmişə qarnını yeməklə doldurmaq arzusundasan.

B.1575. Mövcudatın cigər qanı bu çöl üçün dirilik suyu mənziləsindədir və onun həyatını tə'min edir. Bu bir biyabandır ki, Günəşin hərarəti tə'sirindən təşnə olur və yanğısını söndürmək üçün mövcudatın qanını içir.

B.1576. O biyabanın şorluğu (şoranlığı) ali insani ruhu olmayan kəslər (duzsuzlar) üçün şərabdır və o çölün şor (duzlu) və duzlanmış təamı onlar üçün kababdır. Duzsuzlar – ruhu olmayanlar.

Nizami başqa yerdə də (bu kitabın 62-ci beytində) ruhu duza təşbih etmişdir:

Əyri Sən etdin fələkə dövranı,
Cism qazanında duz etdin canı.

Beytin mənası: O şərab ki, onun ardınca gedirlər, sərabdan (ilğım) başqa bir şey deyildir və o kabab ki, onun ardınca gedirlər, duzlanmış ət kimi bir şeydir ki, nə qədər çox yeyirlər bir o qədər artıq təşnə olurlar.

B.1577. Duz rəngli su – sərab, ilğım. Qəlb ödü su oldu – yə'ni, ürək ödü tərk etdi, ödünü uddu. Öd qəlbi qan oldu – qorxmağa və cür'ətli olmamağa işarədir; yə'ni, öd bu biyabanı görməkdən vahiməyə düşdü.

B.1578. Təb'in qafiləsi – dörd ünsür; insanın bədəninə işarədir.

B.1580. Şairin əqidəsinə görə, cigər donmuş (laxtalanmış) qandır. Öd – içərisində sarı-yaşıl rəngli maye olan öd (səfra) kisəsi.

B.1581. Cəhənnəm mayalı türbət – insan bədəninə, cismə işarədir. Keç bu cəhənnəmdən – yə'ni, bədəni tərk et və ruhun xidmətində ol.

B.1585. Heç kəsi öz ayağının altına salıb əzmə, çünki o çox sənin kimiləri ayağı altına salıb əzmişdir, indi torpaq olmuşdur və sənin ayağın altında qərar tutmuşdur.

## MÖ'BİD VƏ BOSTAN DASTANI

B.1591. Ribat – məcazən xanəgah, saray mə'nasındadır.

B.1600. Qeysər – Rum imperatorlarının ləqəbi; bülbül nəzərdə tutulur.

B.1603. Zaman tabeliyində olan şeylər müəyyən vaxtda zahir olur və özlərini nişan verirlər. Onlar əbədi yaşamaq fikrinə və imkanına malik deyildir.

B.1606. İkinci misra – «Kim özünü tanısa Allahını da tanıyar» – hədisinə işarədir.

B.1608. Sən müsəlmansan, gəbr (atəşpərəst) deyilsən, sən çeşməsən, amma bir qətrə göz yaşın və mütəəssir olan ürəyin yoxdur.

B.1610. Tac və kəmər – rütbə və məqama işarədir.

B.1613. Onda, yə'ni tacda bədən ağalığı, cismani sərvərlik var və bunda, yə'ni kəmərdə ürəyə bəndə olmaq var, yə'ni həva və həvəs ardınca getmək vardır.

B.1614. Xacə-ğulami – zahirən xacə, həqiqətdə ğulam olmaq.

## ON İKİNCİ MƏQALƏ

## BU MƏNZİLLƏ VİDALAŞMAQ HAQQINDA

B.1618. Bu gil – insanın bədəninə işarədir.

B.1619. Fil ayağına dəbə atmaq – inək dərisini saman ilə doldurub adam mücəssəməsi şəklinə salardılar və filin ayağı altına atardılar. Filbanın işarəsi və əmri ilə Fil onu ayağı ilə tapdalayıb əzərdi. Sonra bu fildən adam öldürməkdə və e'dam etməkdə istifadə edərdilər. Beytin mənası: Əgər dəvə kimi deyilsənsə və taqətin və təmkinin yoxdursa, filin ayağına dəbə atma; yə'ni özünü zəhmətə və məhvə düçar etmə.

B.1624. Ayrı düşən yol – ölməyə və ruhun bədəndən ayrılmasına işarədir.

B.1629. Çox nöqtəli çərx – ulduzları sabit olan səkkizinci fələkə işarədir. Xəttindən – yə'ni gərdişindən, tə'sirindən.

B.1634. Sel axıdan eyvan – dünyaya işarədir.



B.1635. Tülkü öz yuvasını iki-üç bacalı düzəldir ki, birindən həmlə olduqda digərindən çıxıb qaçsın. Amma ovçular bu hiyləni bilirlər və bacanın birinin ağzında iti gözətçi qoyurlar, digər tərəfdən yuvaya tüstü verirlər və tülkü naçar qalıb yuvadan çıxdıqda it onu tutur. Şair ardınca gələn beytdə bu mətləbi təsvir edir.

B.1636. Bu bacadan tülkü tutan tüstü – fələkə işarədir.

B.1637. Ğəflət edirsən – yə'ni, sən öz ğafil olmağından ğafilsən.

B.1639. İlahi ilə peyman – Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 27-ci ayəsinə işarədir: «O kəslər ki Allahla [Ona iman gətirmək və itaət etmək barəsində] əhd bağladıqdan sonra onu pozur, Allahın birləşdirilməsini buyurduğu şeyləri parçalayır [mö'minlərlə dostluğu, qohum-əqrəba ilə əlaqələri kəsir] və yer üzündə fitnə-fəsad törədirlər. Məhz belələri [dünyada və axirətdə] ziyana uğrayanlardır».

B.1643. Pak gövhər – ruha işarədir. Gil – bədənə işarədir.

B.1647. Həlqə bu kəndir... – fələk dairələrinə işarədir.

B.1648. Şişə – fələkə işarədir.

B.1649. Sim verənlər – bu ifadə mətndə «simkoşan» kimi getmişdir; mal və sərvətini ona-buna paylayanlar mə'nasındadır. Zərdən od almaq – qızılın atəşini söndürmək, atəşə bənzər qızılı söndürmək (öldürmək). Yə'ni, qızıla olan hərislik və tamahı öz nəfsində öldürmək.

## İKİ HƏKİMİN DASTANI

B.1651. Həmxanəlik – həmxanə olmaq; burada həmpeşə olmağa işarədir. Beytin mənası: İki həkim (təbib) arasında həmkar olmaq cəhətindən elmdə birinin digərindən artıq olması mövzusunda mübahisə düşdü.

B.1652. Laf – iddia. «Mən» – «mən-mən» demək. «Sən» – başqasını hesaba almaq, saymaq. Mülk – məmləkət. «İkilik» – iki olmaq (iki əmir olmaq). Beytin mənası: Hər biri iddia edirdi ki, təbib fəqət mənəm; heç biri demirdi ki, sən də təbibsən. Bu da səbəbsiz deyildi, çünki bir məmləkətdə iki əmir bir-birinə təhəmmül edə bilməz.

B.1653. Baş – əmir, sərdar.

B.1655. Mülk – hakimiyyət, hökmranlıq. Beytin mənası: İki hikmətin hökmranlığı o iki həkimdən birinin olsun və bir can ki,

iki surət onun iddiasındadır bir bədənə versinlər. Başqa sözlə, iki iddiaçıdan birinin haqlı olduğunu təcrübə etsinlər.

B.1672. Bağ layları – yerin təbəqələri. Qədimlərin əqidəsinə görə. yer yeddi təbəqədir. Mayallaq su – asimana işarədir.

B.1675. Burada Qur'ani-Kərimin 6-cı (Ən'am) surəsinin 77-ci ayəsinə işarə olunur: [Sonra] doğan ayı görüb: «Bu mənim Rəbbimdir!» – dedi. Ay batdıqda isə: «Doğrudan da, əgər Rəbbim məni doğru yola yönəltməsəydi, mən zəlalətə düşənlərdən olardım», – söylədi».

B.1676. Gündüzünü dağladı – yə'ni, gündüzünü gecə etdi. Beytin mənası: Səyyarələrin gərdişi sənin gündüzünü gecəyə döndərdi və o ruzigardan bu günə giriftar etdi. Başqa sözlə, ruhlar aləmindən (o gündən) maddi və cismani aləmə (bu günə) çəkdi.

B.1677. Əgər ürəyini Günəşdən də rövşən edə bilsən, gecəni başa vurarsan və gündüzə yetərsən.

B.1678. Qara-ağ lövhə – dünyaya işarədir. (gecə-gündüzlü olması e'tibarı ilə).

B.1680. Bütün işlərində sənin qollarına qüvvət verən dindir. Sən öz əməllərini çəkəndə çəkinin dürüst olmasına din səbəb olur. Başqa sözlə, sən öz əməllərini çəkdikdə bir me'yar lazımdır və bunun üçün din ən yaxşı me'yardır.

B.1681. Cavanmərd və pərhizkar olan kəslər dünya əndişəsində dünya (maddiyat) ğəmi çəkmirlər.

## ON ÜÇÜNCÜ MƏQALƏ

## DÜNYANIN MƏZƏMMƏTİ HAQQINDA

B.1683. Təngdir– əzablı və sıxıntılıdır. (Dünya mö'minin zindanıdır). Uyma cavan rənginə – yə'ni, zahiri bəzəyinə və gözəlliyinə aldanma.

B.1685. Dünyanın sənə çeşmə kimi göstərdiyi sərabdır (ilğımdır) və dünyanın sənə nişan verdiyi qiblə səlibdir (xaçdır), həqiqi qiblə deyildir.

B.1687. Dünya evindən bu yerə özünlə gətirdiyin şeyi aparacaqsan; başqa sözlə, bu evə gələndə əliboş gəlmişik, əliboş (maddiyatdan) da gedəcəyik.



B.1688. Həşr ümmanı – Qiyamət ümmana təşbih olunmuşdur. Yoxsul – dərviş; şərhi: Gəminin yükü nə qədər ağır olsa, ğərq olmaq ehtimalı artıq olur.

B.1692. Şəm'elə – yə'ni, yandır və nurundan istifadə et. Cə'fəri – sarı rəngli güldür; həmçinin «cə'fəri» adı ilə məşhur olan sikkəli xalis (saf) qızıldır; qızıl sikkəsi, dinar. Çırağın gülü – çırağın nuru.

B.1693. Doqquz qapılı peykər – bədəni iki qulaq, iki göz, iki burun deşiyi, ağız və s. e'tibarı ilə doqquz qapılı adlandırmışlar. Altı başlı zər – üzündə və arxasında altı nəfərin nəqşi olan bir qızıl olmuşdur. Bu sikkə Bizans dövründə (1067-1072) Qüstəntəniyyədə vurulmuşdur və xalis (saf) qızıldan (diametri 27 mm-dir) olmuşdur.

B.1694. Zərə əl qoymaq – qızılı yığmaq. Zərə ayaq qoymaq – qızılı həqir hesab etmək və xərc etmək. Zər tək olur bütpərəst – qızıla ona görə «bütpərəst» deyir ki, yuxarıda şərh etdiyimiz kimi «altı başlı» zərin hər üzündə üç nəqş olmuşdur və həmçinin dinarların əksəriyyətinin bir üzündə insan nəqşi zərb olunmuşdur.

B.1695. Zər ki, murad sikkəsi... – yə'ni, bir qızıl ki yaxşı işlərə himayədar və müşkülləri həll edən deyil, onun qiyməti sarı rəngli zərnix daşı ilə birdir. Sə'di deyir:

Ey oğul, qızıl sərf etmək üçündür,<br>
Yığmaq üçün nə daş, nə qızıl!

B.1696. Əgər qızılın gözəlliyi onun parlaqlığında və bərq vurmasındadırsa, həmin xasiyyət tavusun quyruğunda da vardır; başqa sözlə, qızıl ehtiyacları aradan qaldırmaq üçündür, parlaqlığına və rövnəqinə tamaşa etmək üçün deyildir.

B.1697. Sikkəni poladdan və dəmirdən düzəldirdilər; buna görə də sikkə vuranlar dəmirçidirlər, çünki sikkə vuranlar sikkə vurmaq vəzifəsini yerinə yetirir, sikkəni özünə məsrəf etmək, yaxud yığıb toplamaq onun vəzifəsi deyildir. Burada Nizami sikkələrdən xəzinə toplayan şahlara «dəmirçi» damğası vurur. Çünki, qızıl pullar şahların əli və fərmanı ilə dəmir qəliblərdə sikkələnir.

B.1698. Qarun sikkə vurmaq üsuluna riayət etmədi və onu yığıb topladı, özü üçün qüdrət vasitəsi (papaq, tac) qərar verdi. Bu səbəbdən işləri pozuldu və Həzrəti-Musanın qarğışı nəticəsində torpaq onu və sərvətini uddu.

B.1699. Başda yer edən – tacdır. Salsan ayaq alta – yə'ni, xərcləsən.

B.1700. Can vermək – ruh bəxş etmək. Yə'ni, əgər bir kəsə qızıl əvəzinə can verib onu diriltsək, o şəxs bunu bizdən qəbul etməsə, onun əməli bizim əməlimizdən daha artıq olacaqdır.

B.1704. Zər – Günəşə işarədir. «Məğribi» – «Məğribi» adı ilə məşhur yüksək əyarı olan xalis (saf) qızıldır. Beytin mənası: Məşriqdən doğan zərrin Günəş qiymətlidir, çünki öz nur və şüalarını hər yerə saçır; amma, bixəbərlər «məğribi» qızılı yaxşı hesab edirlər. Halbuki, Günəş ğürub vaxtı aşağı enir və torpağa gedən qızıl kimi olur ki, heç kəsə fayda vermir.

B.1707. Vali – bir vilayətin hakimi, əmr sahibi. Naib – canişin. (Quşlarda qanad əl yerindədir).

B.1708. Rumi zər – ağ qızıl. Səngi-Dəməşq – məhək daşı. Düz çəkər ağuşə – yə'ni, çox sevər.

## HACI İLƏ SUFİNİN DASTANI

B.1719. «Yarəb, aman!» – Yarəb, səndən aman istəyirəm; yə'ni, neçə müddət idi ki, sufi belə bir ruzinin həsrətini çəkirdi, xəyalında bu idi ki, əlinə pul düşsün.

B.1725. Çəkdi böyük üzrə görə ğüssəni – yə'ni, zər sahibi ilə üzbəüz olmaq ğəmini çəkdi.

B.1726. Dağ – nişan. Adətən, heyvanları dağlayardılar və onların dərisində həmin dağın tə'sirindən əlamət qalardı.

Beytin mənası: Şikarı elə yedi ki, ondan (əmanət qızıldan) bir əsər-əlamət qalmadı. Şərhi: Adətən, ov ətini yeyərdilər və onun yağından çırağı yandırmaqda tədricən istifadə etmək üçün yığıb saxlayardılar. İkinci misrada birinci misranın mə'nasına tə'kid edir və deyir ki: – Şikarı elə yedi ki, çırağ üçün yağ da saxlamadı.

B.1727. Hindu – məcazən, oğru mə'nasındadır. Türktaz etmək – türklər kimi hücum etmək, qəflətən hücum etmək.

B.1732. Rukn – Rukn-üd Dövlə Deyləminin fərmanı ilə zərb olunmuş qızıl sikkələr. Ürək rüknü – ürək payəsi, ürəyin əsası.

B.1736. Ta kərəmi... – Bu vaxt zər sahibi olan cavanmərd öz ürəyində ona nəsihət etdi və öz-özünə dedi ki, bu malı sufiyə bağışla və tələb etməkdən keç, çünki dərviş üzrxahlıq məqamında dayanmışdır.

B.1741. Bəs bu həramı... – yə'ni, yediyin qızıllar ki sənə həram idi, həlal edirəm və bağışlayıram.



B.1742. Qısa qolçaqlı – Sufiyə xitab edərək deyir: Zahirən dərviş görünürsən, fələk kimi göy cübbəli və qısa qolçaqlısan; amma əlini xalqın malına uzadırsan, bu riyakarlıqdan əl çək. (Şərhi: sufilər qısa qolçaqlı cübbə geyinərdilər). Sə'di deyir:

Dünya üçün [uzanan] əli qısaltmaq lazımdır,
Qolçağın uzun, yaxud qısa olmasının nə fərqi?!

B.1744. Fəğfur – Çin padşahlarının ləqəbi.

B.1746. Eyb evidir bu... – yə'ni, bu dünya evi eyblidir. Hünəri tuşə et – yə'ni, təqvanı özün üçün azuqə et, təqvalı ol.

B.1749. Dünyanı görmək sifəti olan bəsirət nəzəri ilə baxıb mülahizə etdim ki, arı öz balı olduğuna görə afət görür. Çünki, balı aparmaq üçün tüstü verirlər və arının yığdığı balı aparırlar; beləliklə, arının həm canı, həm də balı gedir. Mövləvi deyir:

Tavusun qanadı öz düşməni olmuşdur,
Çox şahlar öz fərri [ucundan] öldürülmüşdür.

B.1750. Deyilənə görə, şir əti acıdır və heç bir heyvan onu yeməyir.

B.1752. Qurd sülhü – məkr və hiylə ilə olan sülh. Boş əl – əliboşluq (külək əliboşdur). Külək həmişə torpağı təbiətdə özü ilə hər tərəfə aparır, amma torpaq küləkdən heç bir şey alıb apara bilmir, çünki külək əliboşdur.

B.1753. Su quşu – balıq ovlayıb yeyən quş. Balığın pulları, üstünə Günəş şüası düşdükdə parıldayır, bu səbəbdən balığın yeri mə'lum olur və su quşu onu şikar edir.

B.1754-1755. Sən qızılı niyaz və biniyazlıq (ehtiyac və ehtiyacsızlıq) me'yarı qərar vermisən və beş növbət namaz kimi yadından çıxmır. Əgər sən Nizami kimi pərhizkar olmasan bu niyazdan (qızılı sevməkdən) asudə ola bilməyəcəksən.

## ON DÖRDÜNCÜ MƏQALƏ

## HUŞYARLIĞIN VACİBLİYİ HAQQINDA

B.1757. Gün dolanan mərkəz – Yer kürrəsinə işarədir. Qədimdə Yeri sabit və aləmin mərkəzi hesab edirdilər və güman edirdilər ki, Günəş Yerin dövrəsinə dolanır. Göy dairə – fələk.

B.1764. Məsiha – Həzrəti-İsanın ləqəbidir; burada həyat bəxş edən mə'nasındadır.

B.1768. Cam – insan vücuduna, bədənə işarədir.

B.1769. Onu bərbad edir – yə'ni, əqli bərbad edir.

B.1773. Öz xəyalpərəst gözünü kor et və meyxanəyə gedən ayağına kündə vur.

B.1774. «Əlif» – əlifbanın əvvəlinci hərfidir, şaquli düz xətt şəklində yazılır və ədəbiyyatda düz qaməti ona təşbih edirlər. Sevda – xam xəyal, həva və həvəs. Beytin mənası: Əlif qamətinə və cavanlığına uyub, xam xəyallarına yetmək arzusu ilə ğəmgin olub ğüssə ilə ülfət etmə.

B.1775. Şəhpər tökmək – aciz olmaq, heç bir şeyi olmamaq, mücərrəd olmaq. «Fa» – başı aşağı əyilmiş hərfdir.

B.1776. «Əlif» hərflər içərisində heç bir şeyi olmaması ilə məşhurdur. Məhəmməd Övfi «Lübab-ül Əlbab»da misal gətirir:

Hərçənd ki, sənin işinin bu dolanan günbəzdə
«Əlif» qəddi kimi əyriliyə və kəcliyə tabı yoxdur,
Bu gün bu hərfə təkyə etmə ki, sabah
Sənə mə'lum olacaq ki, «əlif»in heç nəyi yoxdur.

B.1778. Ömr – həyat. Şərhi: İnsan ömr deyildir, bəlkə ömrü olan bir kəsdir; çünki həyat əbədidir, amma ömrü olan əbədi deyildir.

B.1779. Gün – ömrün illərinə işarədir.

B.1782. Kölgədən ətək çəkmək – təkəbbür və məniyyəti özündən uzaq etmək. Şərhi: «Mən» – «Öz»ün kölgəsidir.

B.1783. Kölgədə olmaq – guşənişinliyə işarədir. Kölgə – ikinci misrada «zülmət» mə'nasındadır və dirilik suyu da zülmətdədir.

B.1785. Qızıl teşt – gündüzə (Günəşə) işarədir. Özündən əl yumaq – təkəbbür və xudbinliyi tərk etmək. (bu mə'nada ki, insanların başını teştdə bədənlərindən ayırardılar). Burada «Ölməyinizdən əvvəl ölün!» hədisinə eyham vardır.

B.1786. Gün bulağından rəvan et teştə su – yə'ni, su yerinə Günəşdən istifadə et ki, o da pak olan şeylərdəndir və ardınca gələn beytdə aşkar bəyan edir ki, Günəş sənin libasının qan və çirkini yuyub pak edən sabun qürsü kimidir.

B.1791. İnsanın doğruluğu zireh kimidir və bu zireh bizi fəqət cəhənnəm atəşindən qorumur, bəlkə hadisələrlə dolu olan ruzigarın isti-soyuğundan da mühafizə edir.

B.1793. Doğru ürək – batinin doğruluğu; yə'ni, zahiri və batini doğruluğun bərabər olsun.



## ZALİM PADŞAH İLƏ DÜZDANIŞAN KİŞİNİN DASTANI

B.1800. Həccac – Həccac ibn Yusif; İraq və Bəsrənin padşahı olmuşdur, zalimliyi və qaniçənliyi ilə məşhurdur.

B.1802. Sirr açan – sübh və Ay sirr açandırlar, gecə isə sirr gizlədəndir; çünki gecənin qaranlığında heç bir şey görünmür və qaranlıq hər şeyi öz pərdəsində saxlayır. Amma, sübh və Ay qaranlıq pərdəsini yırtır və hər şey görünür.

B.1803. Pərdədə kölgə oyunu – bir oyundur ki, gecə pərdənin üstündə (Ay işığı vasitəsilə oyun çadırının pərdəsində) kölgələr zahir edərdilər.

B.1806. Nət' – dəri süfrədir ki, sərib üstünə qum tökərdilər və məhkumun boynunu onun üstündə vurardılar.

B.1820. Kafur – meyyitə ğüsl verdikdən sonra onun cəsədinə vurulan ətrli maddədir.

B.1824. «Əlhəqqü mürr» – «Həqiqət acıdır». (Ərəb xalq məsəlidir).

## ON BEŞİNCİ MƏQALƏ

## HƏSƏD HAQQINDA

B.1830. Əgər Cəbrəil ilə həmdəm olsan, qəzavü qədər bu işə paxıllıq etməz.

B.1831. Var – mal, azuqə. Beytin mənası: O, qurtaran azuqə deyildir; sən ondan nə qədər aparsan, yenə yerində qalacaq, çünki onun gəliri sənin xərcindən artıqdır.

B.1834. Qələm qırmaq – qələm sındırmaq; (farsca – qələm şekəstən) qələmi başqasına vermək (həvalə etmək) mə'nasındadır.

B.1837. Bir-birinin ardınca gələn nəsllər biri digərindən zirək və fərasətlidir.

B.1838. Əql mə'nanı şərəfləndirir, zahiri sürətlə əlaqəsi yoxdur və qoca ilə cavanı (qocalıqla cavanlığı) qiymətləndirmir; yə'ni, hər dəstə ki mə'nəviyyatdır, əql onu şərəfli hesab edir.

B.1839. Belə təsəvvür edirdilər ki, zaman keçdikcə bə'zi daşların daxilində Günəş şüalarının tə'sirindən lə'l vücuda gəlir. Beytin mənası: Deyirlər ki, daş köhnə olduqda lə'l olur. Amma,

bu söz mənim bədxahlarım barəsində doğru deyildir, onlar qocaldıqca daha da yaman olurlar.

B.1844. Tutiya – qədimdə göz müalicəsində dərman kimi, həmçinin gözün nurunu artırmaq üçün işlənərdi. Üzüm qorasını qurutduqdan sonra onu toz halına salardılar və tutiya kimi istifadə edərdilər. Burada şair «tazə üzümlər» deməklə «qora»nı nəzərdə tutur.

B.1845. Köhnə olan məğz – insanın qocaldıqda xərifləməsinə işarədir.

B.1849. Pirin o çəngi – yə'ni, pirin mizrab vurub çaldığı çəng.

B.1850. İkinci misra – «Cavanlıq cünunun bir şö'bəsidir» – hədisinə işarədir.

B.1851. Söyüdlük etmək – iddia etmək, özünü göstərmək. Məhəmməd Baqir Xəlxali deyir:

Ağaclar tovlayanda baş çəməndə,
Söyüdlər söyləyirdi: – Mən də, mən də!

Hindu kimi ağlıqdan dəm vurmaq – qocalıqda cavanlıq iddiası etmək.

B.1853. Özünün düşməni olmaq – nəfs ilə müxalifətdə olmaq.

B.1855. Tərbiyət vermək – bu ifadə mətndə «dəst kəşidən» kimi getmişdir və müxtəlif mə'naları vardır; o cümlədən «bəhər vermək» (heyvana, ata) mə'nası da vardır. Bu ifadə o at barəsində işlənir ki, onun atası və anası öz sahibinin əlində tərbiyət alır və bəhər yeyir. Başqa sözlə, həmin atın zatı (əsli) barədə şəkk-şübhə olmur. Firdovsi deyir:

Elə ki Rüstəm şirin yuxudan oyandı,
Tərbiyət görmüş atı ona lazım oldu.

B.1858. Gecənin gözü – ulduzlara işarədir. Gündüzün gözü – Günəşə işarədir.

B.1861. Belə təsəvvür edirdilər ki, bahar yağışının (neysan) bir qətrəsi sədəfə daxil olur və bir müddətdən sonra mirvari əmələ gəlir.

B.1863. Ələmin (bayrağın) təzə olması – yenidən şərəf, rövnəq və qüdrət tapmağa işarədir.

B.1865. Ta sənə İblis kimi şallaq yetə – şeytanın Allahın fərmanından çıxıb Adəmə səcdə etməməsinə və Behiştdən qovulmasına işarədir. Xudavənd Qur'ani-Kərimin 38-ci (Sad) surəsinin 77-ci ayəsində buyurur: «Çıx oradan [Cənnətdən]. Sən, həqiqətən, [Mənim rəhmətimdən, dərgahımdan] qovulmusan!».



## MƏRV MƏLİKZADƏSİNİN ƏMİRLƏR İLƏ DASTANI

B.1871. Köhnə bürc və köhnə şaxə – qoca düşmənlərə işarədir.

B.1877. Suyu axdığı səthdən yuxarı aparmaq üçün arxın axarını (ağzını) bağlayardılar, su yuxarı qalxardı və arxın kənarında olan ağaclar su içərdi. Bu vasitə ilə çinar dava (iddia) edənlər kimi pəncə açardı və təravət tapardı. Burada, həmçinin, təcavüzkar müxaliflərin e'tiraz ağzının bağlanmasının zəruri olmasına eyham edir.

B.1880. Qında olan qılınc – batini nəsihət verənin əmrinə işarədir.

B.1881. Nəfəs – burada söz nəzərdə tutulur. Həmnəfəs haqqında – yə'ni, layiq deyil ki, sən batini həmnəfəsin nəsihətinə müxalif iş tutasan.

B.1882. Bu kəs – batini həmnəfəsə işarədir.

## ON ALTINCI MƏQALƏ

## ÇEVİK OLMAQ HAQQINDA

B.1886. Ələm qaldırmaq – vücud izhar etmək, özünü göstərmək. Bir toz olur səndən ələm saldıran – yə'ni, bir toz önündə təslim olursan.

B.1889. Təbil qarnı tək boş olmaq – qənaət və şadlığa işarədir.

B.1890. Div – şeytan, nəfs. Əl vermək – bey'ət etmək, təslim olmaq.

B.1891. Əlin olmuş səlib – yə'ni, əlini sinənə qoymusan. Xətiblər xütbə oxuduğu vaxt bellərinə qılınc bağlayardılar. Bu qılınc döyüş üçün deyil, fəqət böyüklük və möhtərəmlik qismindən olan nişanə idi. Xətibin bağladığı qılınc – burada bir şeyin zahiri sifətlərinə sahib olmaq, amma onun mə'nəviyyatına malik olmamaq mə'nasındadır. Xaqani deyir:

Dilini ağzında saxla ki, xətibin qılıncı
Onun belində döyüş üçün yox, şöhrət üçündür.

B.1892. Bəlxinin şərhində deyilir: «Elə ki ruh Adəm əleyhissəlamın pak qəlibinə daxil oldu, qalxıb oturdu, asqırdı və həmd etdi. Bu vaxt Cəbrail əleyhissəlama əmr olundu, həman asqırtını (ətsə) götürüb Zəkəriyyə peyğəmbərin zamanına qədər

ovcunun içində saxladı. Sonra o asqırtını Məryəmin paltarının qoluna üfürdü, Məryəm hamilə oldu və İsa (ə) dünyaya gəldi».

B.1896. Təlq – atəşin yandıra bilmədiyi bir məlhəmdir.

B.1897. Qəlb – qəlb pul, əyarı aşağı olan qızıl və gümüş. Əyarı aşağı olan qızıl və gümüşü od ilə yoxlayardılar; əgər əyarı aşağı olsaydı rəng və rövnəqdən düşüb qaralardı.

B.1898. İkinci misradakı mən – çəki vahididir və müxtəlif yerlərdə bir-birindən fərqli olmuşdur. Məsələn, Səmərqənd məni – 8 pud, Təbriz məni – 3 kq-a yaxın olmuşdur. Şəriət istilahında bir mən (şər'i mən) 180 misqaldır. (846 qr).

B.1903. Türrə – alın ətrafında olan tüklər.

B.1904. Uçmaq üçün canə gərəkməz bədən – yə'ni, bədəni tərk et.

B.1907. Dünyanı məzəmmət edib onda eyb və nöqsan axtarma; o bizim eybli və nöqsanlı olmağımızı istəmir, əksinə, bizdən ötrü zəhmət çəkir. Həkim Nasir Xosrov deyir:

Nilufər rəngli çərxi məzəmmət etmə,
Nadanlıq havasını başından çıxart.

B.1912. Xarü səmən – beytdə «cəm' və təfriq» sən'əti işlədilmişdir.

B.1913. Xarə səmən tək... – su təravətin səbəbidir və əgər gül arxın suyundan mədəd tapmasa ətr və rəngini itirər, amma su xarı səmən edə bilməz. Başqa sözlə, iste'dadlı olmaq da şərtdir.

B.1922. Cövza – uğurlu və xoşbəxt tale' hesab olunur. Cövz – qoz. (Cövza və cövz beytdə cinas kimi işlənmişdir). Sadə adamlar qoz ilə fala baxarmışlar. Müəyyən miqdarda qoz qoyardılar və onların içindən bir qoz götürüb sındırardılar. Qozun dolu və boş çıxmasını yaxşılığa və pisliyə yozardılar.

B.1929. Mavi tağ – asimana, fələkə işarədir. Mavi tağın mərkəzi – Yer kürrəsinə işarədir.

B.1932. İki hünərnamə – gecə və gündüzə işarədir. Doqquz dəbir – doqquz fələkə işarədir.

## YARALANMIŞ UŞAĞIN DASTANI

B.1937. Sındı ürək mehri, ayaq möhrəsi – yə'ni, ayağı oynaqdan sındı və ürəyində olan oynamaq həvəsi söndü.

B.1938. Burda mənəm çünki onun düşməni – yə'ni, mən onun düşməni deyiləm, amma başqaları məni onun düşməni bilirlər.



## ON YEDDİNCİ MƏQALƏ

## NƏFSİ QORUMAQ HAQQINDA

B.1953. Riza ilə çəkilmiş kəmər – razılıq ixtiyar edən kəs.

B.1954. Hirs – hərislik, tamah. Riba – çox mənfəət və fayda. Riza tacı – riza taca təşbih olunmuşdur. Beytin mənası: Məhrumun ribaya hərisliyi riza dövləti üçündür. Qəzaya razı olan və özünü qəzaya məhkum hesab edən kəs riza tacına sahib olur.

B.1959. Ulağından yükünü aldılar – yə'ni, sənə bir şeyi vermədilərsə, bunu sənin xeyrin üçün belə etdilər, məsləhət bilmədilər.

B.1965. Zağ – qarğa. Burada Nizami qara qarğanı nəzərdə tutur ki, adətən əkin yerlərində yaşayır, dən yeyir və ayaqları qırmızıdır.

B.1968. Qanın cərəyanı şiddətləndikdə damardan neştərlə (dəmir) qan alardılar.

B.1969. Nəqd – burada ömr nəqdinə işarə olunur.

B.1971. Kökə ilə şad olan gündüz – burada kökə, Günəşə işarədir.

B.1974. Tilism – dəfinələrin üstündə nəqş və nəsb olunan əcayib surət və şəkillərdir; deyilənə görə, onun tə'sirini aradan qaldırmayınca xəzinəni ələ gətirmək mümkün olmur.

B.1977. Etməz ğəmini kəm sənin – yə'ni, torpaq sənin ğəmini kəm etməz.

B.1979. Ağarsın dişi – yə'ni, üzü gülər olsun.

B.1981. Bu şəhər – bu dünyaya işarədir.

B.1982. Tutinin gülüşü mülayim və çox xoşa gələndir; belə ki, şirinlikdə şəkəri qiymətdən salır. Kəkliyin qəhqəhəsi isə onun xamuş və şikar olmasına səbəb olur.

B.1995. Bu yolda ruzigarın hadisələrinə müqavimət göstərə bilən kəslər sabitqədəm və sadiq olanlardır. İkinci misrada Xizr ilə Musa (ə) dastanına işarə olunur.

B.1997. Burada «Kəlilə və Dimnə»də olan «Alabaxta göyərçin və dostları» dastanına işarə olunur: «Alabaxta və dostları tora düşürlər. Alabaxtanın əmri ilə hamısı birdən güc vurub toru yerdən qaldırırlar və Alabaxtanın dostu kəsəyənin məskənində aşağı enirlər. Kəsəyən göyərçinlərin ilişdiyi ipləri kəsir və onları xilas edir.

## MÜRŞİD VƏ MÜRİDLƏRİ DASTANI

B.2009. Təqlid xətti – başqasının xəttini təqlid edib yazan kəs. Olsa da göz nəm – yə'ni, həqiqi zöhd onun sahibinin gözünü Allah xovfundan yaşlı edər, o zahidi pis əməl sahibi etməz.

B.2010. Həzrəti-Süleyman, peyğəmbər və padşah olmasına baxmayaraq, zənbil toxuyub satardı və onun gəliri ilə dolanardı.

B.2011. Gizliqəba – qəbanı libasının altında gizlədən kəs. Şəm'in fitilini gizli qəbaya təşbih etmişdir.

B.2012. Əgər zöhd meyxanədə olsa, ğəribə və nəsirsiz olur; çünki, burada vəsilələr mövcud, maniələr ğaibdir. Belə bir yerdə zahid olan kəs cəlbedici və bənzərsiz olur.

B.2013. Zər ələm altında səfabəxşdir – yə'ni, Nizami mal və xoş güzəran keçirmək imkanına malikdir. Buna baxmayaraq o, pərhizkar bir zahiddir və nəfsani həva və həvəsə tabe' deyildir.

## ON SƏKKİZİNCİ MƏQALƏ

## RUZİGAR ƏHLİNİN VƏFASIZLIĞI HAQQINDA

B.2014. Qəlb vuranlar – qəlb sikkə zərb edən kəslər.

B.2015. Bellərinin yoxdu qarın tək üzü – yə'ni, onların arxasının qarın kimi üzü yoxdur və bayırdadır. Bel – burada məxrəcə işarədir. (Biz bu sözü (bel) mə'nanı tam sərrast ifadə edə bilən başqa kəlmə ilə əvəz edə bilərdik. Amma, oxucu bizi başa düşər.

Nizami deyir ki, onlar həyasızdır və arxalarının qarın kimi üzü yoxdur. Şərhi: Əgər diqqət etsək mülahizə edərik ki, qarın başdan-başa arxadır və qarının üzü daxildə qərar tutmuşdur və görünmür. Bu nöqteyi-nəzərdən qarın üzsüzdür. Burada «üzsüz» tərkibi qarın və arxa bəhsində «üzsüz olmaq» və «həyasızlıq» mə'nasındadır. «Lübab-ül Əlbab»da oxuyuruq:

Hər kəsin üzü qarnının arxasından asudə olsa,
Onun arxası bütün qarınların yatağı olar.
Onun gözündə heç vaxt su cəm' olmaz,
Sən ondan həya gözləyirsən? – Bu bihudədir.

B.2016. Münafiq – ikiüzlü; (sayə iki üzlüdür).



B.2017. Ud ağacı çox dügünlü olur.

B.2018. Onlar etdikləri cövr və sitəmi məqbul və inayət hesab edir, özləri eyb axtaran olduqları halda onların haqqında olan şikayətləri özlərinə tutmurlar və buna göz yumurlar.

B.2019. Onların məhəbbəti dillərindədir, öz adlarına deyilən eybləri eşitsələr də əməl etmirlər, ürəkləri başqalarına qarşı kin ilə doludur.

B.2020. İstidir... – zahirən istiqanlı və mehribandırlar, amma cigər kimi donuqdurlar; yə'ni, məhəbbətləri quru və cansızdır.

B.2021. Onların dostluğunun əyarını öz ürəyinlə ölçmə, çünki saf olmadıqları mə'lum olar və sən bu işdən peşman olarsan.

B.2022. Xəzinədar dağ kimidir, ona hər nə versən onu da sənə qaytaracaqdır. Şair əks-sədanı nəzərdə tutur və deyir ki, əgər sirrini onlara desən dağ kimi əks-səda verəcəklər və hamıya deyəcəklər. Mövləvi deyir:

Bu cahan dağ, bizim əməlimiz səsdir,
Səslərin əks-sədası bizə tərəf gəlir.

B.2023. Onlar yalandan iddia edirlər ki, səndən mə'nəvi fayda kəsb etmək və hörmət qazanmaq istəyirlər, amma əməldə maddi fayda görmək üçün cəhd edirlər.

B.2025. Ğərəz – burada məqsəd mə'nasındadır. Beytin mənası: Məqsəd güdən dostluqdan düşmənçilik doğular və bu dostluq ədavət ilə əvəz olunar. Bu məzmunda Mövləvi necə də gözəl deyir:

Ğərəzlər dostluq [binasını] xərab edir,
Ğərəzlərin nə üçün ürəyimizdən qovmuruq?!

B.2033. Əgər ürəyin bir kəsin dostluğunu inkar edirsə, zahirən o şəxsin pisliyinə bir dəlili olmasa da ürəyinin hökmünü qəbul et və o dostunu düşmən bil.

B.2035. Bir ürəyin var... – şair ürəyi duyğu və hisslərin mərkəzi hesab edir.

B.2036. Firidun – Pişdadilər sülaləsi şahlarındandır; burada ürək nəzərdə tutulur. Ğaliyə – müşk, ənbər və s. qarışığından hazırlanan ətrli maddədir; burada mehribanlığa və xoşluğa işarədir.

B.2046. Xəznəni etdi cavana e'tibar – yə'ni, öz sirlərini cavana e'tibar etdi.

B.2052. Xeyri– sarı rəngli bir güldür. Ərğəvan – qırmızı rəngli çiçəkləri olan bitkidir; çiçəklərindən hazırlanan şərbət xumarı rəf' edir, çubuqlarını yandırıb qaşları qaraltmaq üçün istifadə edirlər.

B.2060. Xəndə qapısı – ağız və dodaqlara işarədir.

B.2061. Razıyam ki, ürəyim qan olsun, amma bu sirr bayıra çıxmasın.

B.2062. Əgər sultanın sirrini aşkar etsəm, bəxt əhd-peymanı başımda sındıracaq və başımın bədənimdən ayrılmasına səbəb olacaqdır.

B.2071. Bu teşt – torpağa, yerə işarədir. «İskəndərnamə»də deyir:

Fələk yuxarıda, torpaq aşağıda,
Biri qan teşti, biri torpaq teştidir.

B.2076. Pis yuxular gördükdə suya danışardılar və güman edərdilər ki, su bu yuxuları yuyacaq və tə'sirsiz edəcəkdir.

B.2077. Sə'y eləyənlər – saliklər, gecələr Allah-Təala ilə razu niyaz edənlər.

B.2081. Şimşəkayaqlar – saliklər, ariflər.

B.2082. Onlar öz daxilini saflaşdırdı (nəfs ilə mücahidə etdi) və onun tə'sirindən ərşdən də yuxarı qalxdılar.

B.2084. Eşq nə qədər ki, pərdədə olur kəramat (kəramət, mö'cüzə) surətində təcəlla edir; elə ki pərdədən xaricə çıxır, xərabatda təcəlla edir.

B.2085. Sap – vəhdət, dügün – kəsrət rəmzidir. Əgər sapa yüz dügün vursaq şəkli və adı mə'lum olacaq, amma dügün sapdan başqa bir şey deyildir. Buna görə də eşq din sapına vurulmuş bir dügündür. Mənsur Həllac bunu faş etdi və dedi ki, dügün də sapdır; amma müxalifləri dügünü sapdan ayrı hesab edirdilər. Onun dediyini dinə zidd hesab etdilər və dara çəkdilər.

B.2086. Gönçə öz canını pərdə qərar verdi ki, eşq bayıra çıxmasın. Amma, ağzını açıb sirri demək istədiyi vaxt ağzını yaralayıb qan ilə doldurdular ki: – Sus!

B.2087. Ağız heç vaxt eşq sirrini deməyə layiq deyil, bəlkə ürək ağzı eşq qissəsini deyə bilər.

B.2088. Eşq dastanı təam kimidir, onda ki ürək kasasında olur xoş olur; amma bu qissə dilə gəldikdə atəş olur.



B.2089. Ağız bağlamaq ən yaxşı fəsahət və ayaq saxlamaq (ahəstəlik) ən yaxşı tələsməkdir.

B.2090. Özgələrə ağzını vermiş özü – yə'ni, sözü demək üçün başqalarının ixtiyarına vermişdir.

## ON DOQQUZUNCU MƏQALƏ

## AXİRƏTİ QARŞILAMAQ HAQQINDA

B.2096. Sirrlər – mürüvvət və ədalətə işarədir.

B.2097. Göz görə atəş – dünyaya işarədir. Açdılar aləm sənə, göz açmadın – sənin haqqında göz yummurlar, yə'ni səni gözdən salıb tərk etmirlər, sən özün həqdən göz yummusan.

B.2099. Kükürd atəşi – üfunətli və şö'lə çəkən cəhənnəmə işarədir. Bu zirzəmi – bu dünyaya işarədir.

B.2100. Ağızda suyu ədəblə yığmaq – ağız suyunu məharət və dəqiqliklə ağızda yığmaq. Şərhi: Ağız suyunu (tüpürcək) əvvəlcə ağızda yığırlar, sonra istənilən nöqtəyə tüpürürlər. Kükürd çeşməsi – Günəşə işarədir. Yə'ni, sən bu kükürd çeşməsinin hərarətini tüpürcəyinlə tə'sirsiz et. Bir şeyə tüpürmək həman şeyi təhqir əlaməti hesab olunur. Burada Nizami dilimizdə olan – «Bir şeyə tüpürdükdən sonra onu yalamırlar» – zərbülməsəlini də xatırladır.

B.2101. Sütunsuz tağ – fələk. Sütunsuz tağın verdiyi borc – nəfs və maddi bağlılığa işarədir. Torpağın torpağı – torpaqdan yaranmış bədən qəlbinə işarədir.

Bizim istifadə etdiyimiz mətndə «fələkin verdiyi borc» – «nəfs və maddi bağlılığa işarə» kimi şərh olunmuşdur və yuxarıda biz də olduğu kimi qeyd etdik. Amma, bizim fikrimizcə, «fələkin verdiyi borc» – insanın bədəninə, vücuda işarədir. İkinci misradakı «torpağın torpağı» ifadəsi də fikrimizi təsdiq edir. Nizami «İskəndərnamə»də deyir:

Cahan torunda vücud onun borclarındandır,
Onun torundan qurtarmaq üçün borcunu ver.

Hər halda biz qət'i e'tiraz etmirik və öz səmimi mövqeimizi bildiririk.

B.2104. Əqrəb – nəfsə işarədir ki, bizim daxilimizdədir və münasib mövqe' olmayınca özünü göstərmir və gizlində olur.

Əjdəha – insanın digər düşmənlərinə işarədir ki, ondan xaricdə göz qabağında olur və insan onlardan əsasən ğafil deyildir.

B.2108. Mənzilin ağzında kəsirlər yolu – yə'ni, insanın ölümü yaxınlaşdıqda ürək ğarətgərləri onun yolunu kəsirlər. Başqa sözlə, qocaldıqda xətər daha çoxdur; çünki, əgər cavanlıqda yolunu kəssələr pis əməlləri tərk edib yaxşı əməllər etməyə fürsət olur, amma qocaldıqda fürsət olmadığından bu mümkün olmur.

B.2110. Qorx o gecə – yə'ni, mənzilin yaxınlığına çatdığın gecə, qocaldığın vaxt.

B.2111. Karvan ğarət edildikdə mənzilə yüksüz və boş yetər; həmçinin, gəmi (qədimdə yelkənli gəmi) dəryada fırtınaya düşdükdə dönsə (yə'ni, əyilsə) içindəki yük suya tökülər və sahilə yüksüz, şikəst vəziyyətdə çıxar. Başqa sözlə, o dünyaya əliboş gedərsən.

B.2127. Cam – eşq badəsi.

B.2128. İki papaqlıq – yə'ni, iki papaq ölçüsündə; Günəşə və Aya işarədir. Yə'ni, dünya həmişə naqis və nöqsan yetirəndir; necə ki, gecə və gündüzün qəbasını ağ və qaradan biçmişdir və hər birindən bir papaqlıq kəsib götürmüşdür.

B.2139. Səmənd – əbləq at; gecə və gündüzə işarədir.

B.2141. Sən çək ələm (bayraq) – yə'ni, sən böyüklük arzusunda ol.

B.2145. Xəznələr üstündə fələk tək mənəm – fələk kimi ayağım xəzinə üstündədir. (Fələk, dinar mənziləsində olan ulduzları olması səbəbindən ayağı xəzinə üstündədir).

## HARUNƏRRƏŞİD VƏ DƏLLƏK DASTANI

B.2146. Çəkdi baş Əbbasilərin bayrağı – yə'ni, bəni-Əbbasi dövləti son dərəcə qüdrətləndi.

B.2147. Tutdu üzün... – istirahət və ğüsl üçün isti suya (həmmamə) getdi.

B.2152. Harun öz-özünə dedi ki, yəqin həmmamın hərarətindən və mənim qorxumdan belə çaşmış və danışığını bilmir.

B.2154. Gördü həmin sikkə, həmin qəlb dirəm – yə'ni, sözlərində dəyişiklik yoxdur.

B.2160. Xəncər – dəlləyin xatirə dəyən sözlərinə işarədir.



## İYİRMİNCİ MƏQALƏ

## MÜASİRLƏRİN HƏYASIZLIĞI HAQQINDA

B.2174. Qafiləmiz həşrə qədər ləngdir – fars zərbülməsəlidir; işlərdə müxtəlif müşküllərin qarşıya çıxmasına işarədir.

B.2175. Bir cüt mələk – insanın çiyinlərində qərar tutan və onun səvab və günahını yazan iki mələk (kiramülkatibin).

B.2176. Odluyeriş – iti yerişli; təkəbbürlü olmağa işarədir. Kül tək od ardınca soyuq bir şeyik – istiliyin ardınca soyuqluq zahir edirik (bu hal küldə də vardır; əvvəlcə isti olur, sonra soyuq olur).

B.2178. Qaragün sübh – Qiyamətin başlanğıcında Günəş nurunu itirəcək və qaralacaqdır: «Allah-Təala istəyəcək ki [Günəş] məğribdən tülu' etsin və aləm dağılsın. Günəş [tülu' etmək üçün] icazə istəyəcək [rüxsət] olmayacaq və üç gün belə qalacaq. Sonra, dördüncü gün [Xudavənd] ona fərman verəcək ki, ğürub etdiyin yerdən tülu' et; o yerdə ona Ərşin nurundan verməyəcəklər və onun nuru olmayacaqdır. Sonra Məğrib tərəfdən tülu' edəcək, dördüncü gün sübh üzü qaralmış halda...» (Tarixi-Bəl'əmi, c.1, səh.47). Sübhün ələmi – Günəşə işarədir.

B.2179. Ğəflət gülüşü – insanın bixəbərlik ucundan mə'nasız gülüşü. Qalmadı canda həvəsi işrətin – yə'ni həyat ümidi qalmadı və ölüm yaxınlaşdı.

B.2186. Əgər bir kəs hünər sahibi olsa və sən o hünəri pəsənd etməsən, o hünər tezliklə aradan gedəcək və itib-batacaqdır. Çünki, hünər təşviq və rəğbət vasitəsilə kəmala doğru gedir; əgər təşviq və rəğbət olmasa get-gedə tərk olur. Amma, pəsənd etsən o çeşmənin suyu ikiqat artar; yə'ni, başqa bir kəs də o hünərə rəğbət edər.

B.2189. Hünər – təqva və pərhizkarlıq; burada həmnişin olmamaq və ülfət etməmək mə'nasındadır. İkinci misrada isə fəzilət və təqva mə'nasındadır.

B.2192. Görsə riyazətdə – yə'ni, riyazəti təmaşa (məşğuliyyət və xoşlanmaq) tə'bir edərlər və hünər sahibinin əndişəsini sövdaya (sərsəmliyə) nisbət verərlər.

B.2194. Gah üfunət deyilir gövhərə – yə'ni, müxaliflər gövhər kimi sözə üfunət deyirlər.

B.2195. Gah vəfa nəqşi vururlar buza – yə'ni, onların vəfası buz üstündə olan nəqş kimidir ki, davamiyyətsiz və əriyib suya dönəndir.

B.2197. Əl uzadar – yə'ni, irad tutmaq üçün əlini uzadar, əli ilə bir şeyin eybini göstərər. Beytin mənası: Əgər bir dodaqdan şirin söz eşitsə, ondan razı və məmnun olmaq əvəzinə irad tutur; bu asimanda olan Ülkərin civzəsinə irad tutmağa bənzəyir. Ülkərin civzəsi – Ülkərin topa ulduzları. Nizami Ülkərin topa şəklində olan ulduzlarını asimanın üzünə düşən civzəyə təşbih etmişdir. Civzə – başda və üzdə əmələ gələn sızanaq və ləkələr.

B.2198. Püxtə bir əncir... – Hər kəs ki təcrübəli və yetişmiş əncir kimi şirin və faydalıdır, ona xam üzüm (qora) kimi üz turşudurlar.

B.2206. Əhd – peyman; Qur'ani-Kərimin 2-ci (Bəqərə) surəsinin 27-ci ayəsinə işarədir: «O kəslər ki, Allahla [Ona iman gətirmək və itaət etmək barəsində] əhd bağladıqdan sonra onu pozur...».

B.2207. Mən sınmaram, əgər sınsam da get-gedə bədr olan təzə ay kimiyəm.

B.2208. Eyb tutmağa nə qədər cəhd etsələr də fələk ilə şahmat səhifəsini necə başa vuracaqlar?! Yə'ni, təqdir ilə qarşı-qarşıya dura bilməyəcəklər və məğlub olacaqlar.

B.2209. Ruh bağından – ruh bağa təşbih edilmişdir. Nuh dananlar – Nuhun qövmüdür ki, Nuh onları nə qədər də'vət etsə də iman gətirmədilər: «O, xəlqi doqquz yüz əlli il Allah-Təalaya tərəf də'vət etdi və az bir qismdən başqa heç kəs ona e'tiqad etmədi». (Tarixi-Bəl'əmi, c.1, səh.134).

B.2210. Zikr elə, ey Nuh dəmi – Qur'ani-Kərimin 71-ci (Nuh) surəsinin 26-cı ayəsinə işarədir: «Nuh dedi: «Ey Rəbbim! Yer üzündə bir nəfər belə kafir qoyma!». Həzrəti-Nuh öz qövmünə qarğış (bəd dua) etdi və Xudavənd onun duasını qəbul etdi.

B.2212. Müxaliflərin pisliyinin həddi və əndazəsi yoxdur; onların pisliyinin müqabilində mən susmaq ixtiyar etdim və mənim susmağım onların pisliyinə qarşı şiddətli e'tirazdır.



## BÜLBÜL VƏ ŞAHİN DASTANI

B.2226. Təbl sədasına qoşar kimsə baş? – yə'ni, təkcə səs salmaq böyüklük və qüdrət üçün şərt deyildir.

B.2227. Xoruzun banından sonra zahir olan sübh, istehzalı gülüşdən başqa bir şey deyildir, yə'ni tez ötüb keçəndir. (Sübhün açılmasını istehza üzündən olan gülüşə təşbih etmişdir).

B.2228. Fələk çərxinin öz hərəkət ahəngi olsa da səs-sədası yoxdur və bu səbəbdən heç bir baş onun həlqəsindən azad deyildir və hamını əsir etmişdir.

## KİTABIN XƏTMİ HAQQINDA

B.2230. Səbbəhəkəllah – səbbəhəkəllah bilxeyr; dua cümləsidir: «Allah gününü xoş etsin». Düşdü əlimdən qələm – yə'ni, ey dəbir, qələm əlimdən düşdü, əlimdən tut (kömək et). Başqa sözlə, ey dəbir, qələm ixtiyarımı əlimdən aldı, mənə kömək et ki, əvvəlki halətimə qayıdım. Dəbir – mirzə, katib.

B.2231. Buqələmunluq etmək – rəngbərəng olmaq, rəngdən-rəngə düşmək. Yə'ni, mənim şe'rlərimin mərtəbəsi çərxdən yuxarıdır və bu səbəbdən çərx mənim şe'rlərimi gördüyü vaxt öz rəngini dəyişir və rəngdən-rəngə düşür.

B.2233. Daşda qılınca dəmirim var idi – yə'ni, qılınc düzəltmək üçün dəmirim daşda (mə'dəndə) idi, hələ çıxarmamışdım. Həmçinin, dəmirçi kürəmin ağzı da kiçik idi və qılınc düzəltmək imkanı yox idi. Başqa sözlə, bu kitab müfəssəl mövzu' üçün münasib deyildi.

B.2236. Bu çadırın gərdəyi... – «Məxzənül-əsrar» kitabına işarədir. Bir neçə sübh etdi onu cilvəkar – sübh vaxtı oyaq olmaq tə'sirindən şairə yetən ilhamatdır. Şair öz sübh çağı iradətini Günəşin doğması ilə batan sübh sitarələrinə təşbih edir.

B.2238. Öndə get – yə'ni, bu kitabı əvvəlcə sən mütaliə et. Ahəstəliyi vərdiş et – yə'ni, tələsmədən, mülahizə ilə mütaliə et.

B.2241. Sözün haqqını vermək – yüksək bəlağət və fəsahətlə söz demək.

B.2243. Yer ki deyilsən – Yer aləmin mərkəzi və sakin hesab olunurdu.

B.2244. Bikr sözüm – öz sözlərini bakirə qıza təşbih etmişdir.

B.2245. Nimtənə – qısa, üst qadın paltarı. Beytin mənası: Mənim bakirə mə'nalarım (sözlərim) gözəllikdə nəzirsizdir, amma fəqir və yoxsuldur; bir nimtənəsi vardır ki, bədənini dizinə qədər örtür. Ayaqlarının açıq qalan yerlərinə naməhrəm nəzəri dəyməmək üçün dizi üstə oturmağa məcbur olmuşdur. İndi ona paltar tikib geyindirmək lazımdır ki, narahat olmadan və utanmadan ayağa dura bilsin.



## NAŞİRDƏN

Adətən hər hansı bir əsərin nəşri zamanı kitabın içində onun müəllifinin həyat və yaradıcılığı haqqında mə'lumat verilir və bu bir adət halını almışdır. Lakin Nizami Gəncəvinin bütün dünya ölkələrində, o cümlədən vətəni Azərbaycanda kifayət qədər məşhur olduğunu, həyat və yaradıcılığı haqqında yüzlərlə monoqrafiya, elmi əsər yazıldığını nəzərə alaraq bu ənənəni pozduq və əvəzində onun «Məxzənül-əsrar» (Sirrlər xəzinəsi) məsnəvisini azəri türkcəsinin bütün imkan və xüsusiyyətlərini səfərbər etməklə nəzmlə (şe'rlə) birbaşa fars dilindən tərcümə edən, bununla da bədii tərcümə ədəbiyyatımızda yeni cığır açan istedadlı tərcüməçi-şair Mircəlal Ağa haqqında oxucularımıza bir qədər mə'lumat verməyi vacib bildik.

Mircəlal Zəkiyev 1945-ci ildə Maştağa qəsəbəsində, kəndli ailəsində anadan olub. İlk təhsilini qəsəbədəki 128 saylı məktəbdə alıb. 1962-ci ildə bu təhsil ocağını bitirdikdən sonra, bir müddət ailəyə kömək məqsədi ilə işləmiş, 1966-1972-ci illərdə isə Azərbaycan Politexnik İnstitunun mexanika fakültəsində (avtomobil nəqliyyatı üzrə) ali təhsil alaraq mühəndislik ixtisasına yiyələnmişdir.

Uzun müddət öz ixtisası üzrə müxtəlif yerlərdə işləsə də, ədəbiyyata, şe'rə maraq onu o zamanlar yenicə nəşr olunmağa başlayan «Şəhriyar» qəzeti ilə əməkdaşlığa gətirib çıxardı. Hələ gənc yaşlarından həmkəndlisi, zəmanəmizin böyük alimi, bir çox dini və elmi əsərlərin müəllifi Əhmədağa Əhmədovla, məşhur şərqşünas, «Şəhriyar» qəzetinin rəhbəri Rüstəm Əliyevlə dostluq və əməkdaşlıq, yaxın münasibət və geniş mütaliə onun istedadlı ədəbiyyatşünas və şair-mütərcim kimi yetişməsində xüsusi rol oynadı.

«Şəhriyar» qəzetində çalışdığı müddətdə və sonralar mütəmadi olaraq mətbuatda elmi-tənqidi məqalələrlə çıxış edən Mircəlal Ağanın klassik şe'rə, xüsusilə, fars dilində yaranmış ədəbiyyata

dərin marağı, şəxsi sə'yi nəticəsində bu təvazö'kar mühəndisin poetik mütərcim kimi püxtələşməsinə səbəb oldu.

Onun fars dilli ədəbiyyatın böyük nümayəndələrinin (Ömər Xəyyam Nişaburi, Hafiz Şirazi, Qətran Təbrizi, Şəhriyar və b.) əsərlərindən etdiyi tərcümələr müxtəlif illərdə mətbuat səhifələrində çap olunub və bu tərcümələr poetik tərcümə ədəbiyyatımızın nəzirsiz nümunələridir.

Mircəlal Ağa hal-hazırda Seyyid Əzim Şirvaninin müasiri və yaxın dostu, əbədi ictimaiyyətə az tanış olan Mirzə Nəsrullah Bəhar Şirvaninin fars dilində qələmə aldığı «Divan»ını tərcümə edir və inşallah yaxın gələcəkdə geniş oxucu kütləsinə təqdim olunacaqdır. Bundan başqa o, «Xosrov və Şirin»dən də 1500 beytə yaxın tərcümə edib. Lakin «Məxzən»in çapının bu qədər ləngiməsi onu bir qədər ruhdan salsa da, bu xeyirxah niyyətdən əl çəkmək fikrində deyil. Əcəl aman versə Şeyx Nizaminin bütün «Xəmsə»sini tərcümə etmək əzmindədir.

Mütərcimin həyat və yaradıcılığı haqqında bu qısa məlumatla kifayətlənib, bir qədər də bu yazının əsas səbəbkarı «Məxzən», Nizaminin müasirləri və ondan sonrakı dövrlərdəki «Xəmsə» müəllifləri, Şeyxin həsudları və məddahları barəsində bəzi məqamlarla hörmətli oxucuları tanış etmək istərdim.

Əvvəlcə onu qeyd edək ki, bu günə qədər mövcud olan tərcümələrdə Nizami «Xəmsə»sinə daxil olan əsərlərin yalnız ikisinin, yəni «Məxzənül-əsrar» və «Həft peykər» məsnəvilərinin adları müvafiq olaraq «Sirrlər Xəzinəsi» və «Yeddi gözəl» kimi tərcümə olunmuşdur. Digər poemaları isə – yə'ni «Xosrov və Şirin», «Leyli və Məcnun» və «İskəndərnamə»nin adları məzmunu ilə müvafiq gəldiyi üçün olduğu kimi saxlanılmışdır. Mircəlal Ağanın tərcüməsində məsnəvinin adının orijinalda olduğu kimi saxlanılması bə'zi oxucuların iradına səbəb ola bilər. Zənnimizcə, hər hansı elmi, tarixi və bədii əsərin adının tərcümə olunması doğru deyildir və artıq elmi ictimaiyyət bu barədə demək olar ki,



yekdil fikirdədir. Bundan başqa tərcümə zamanı mütərcim seçim qarşısında qalır. Məsələn, «Həft peykər» heç də təkcə «Yeddi gözəl» mə'nasını vermir və peykər sözünün müxtəlif lüğəti mənaları – bədən, cəsəd, şəkil, surət, möhrə, büt, sənəm, sitarə (ulduz) və s. vardır.

Mütərcim bu səbəbdən tərcümə etdiyi bu əsərin («Məxzənül-əsrar»ın) adını haqlı olaraq tərcümə etməmişdir.

Nizami dühasının adı və şöhrəti şe'r və şairlik hüdudundan daha ucadır, qədr və mərtəbəsi isə bütün bəşəriyyətin qərinələrindən doğan aşiqanə hüsn-rəğbəti ilə ehtiram və müqəddəslik haləsi içərisindədir. Elə buna görə də, böyük şairin müasirləri demək olar ki, hamısı ona həsəd aparmışlar. Nizami bu məsələyə əsərlərində dəfələrlə açıq və üstüörtülü münasibət bildirmişdir. «Məxzən»in 15-ci məqaləsində bu məsələdən bəhs olunub. Bu səbəbdən şərq ədəbiyyatında onlarla «Xəmsə»lər yaranmışdır.

Şeyxin «Xəmsə»sinə ilk cavab «Xəmsə»si yazan Əmir Xosrov Dəhləvi olmuşdur. Onun ardınca Xacu Kirmani fars, Əlişir Nəvai özbək – cığatay dilində «Xəmsə»lər yazmışlar. Əbdi bəy Şirazi isə üç «Xəmsə» müəllifidir. Bu şairlər Şərq ədəbiyyatının korifeyləri olmasına baxmayaraq heç biri ayrı-ayrılıqda Nizami «Xəmsə»si səviyyəsinə qalxa bilməmişlər.

Nizami poeziyasına məxsus yüksək sənətkarlıq, az sözlə çox fikir ifadə etmək, lakoniklik, ağır tərkiblər, istər məzmun, istər mə'na e'tibarilə sərrast deyim tərzi çoxlarını heyran qoymuşdur. Təsadüfi deyildir ki, Nizami «Xəmsə»sinin ən çətin, elmi-fəlsəfi tərkiblərlə zəngin məsnəvisi olan «Məxzənül-əsrar»da olan beytlərə müxtəlif cür şərhlər verilir.

Şeyx özü bu barədə belə deyir:

Hər çe ne del bixəbər əst əz soxən
Şərhe soxən biştər əst əz soxən

Sözdən ürək tək olan agah yox,
Şərhi özündən də sözün çoxdu, çox!

Məşhur fars-tacik şairi, 99 nəsr və nəzmlə yazılmış əsərin müəllifi, o cümlədən, dünya şe'r xəzinəsinə «Həft övrəng» (Yeddi təxt) kimi bir inci bəxş etmiş «Xəmsə» müəllifi Əbdürrəhman Cami (1414-1494) əsərlərinin birində yazır ki, Nizaminin «Məxzənül-əsrar» məsnəvisindən 500 beyti başa düşmədim. Axirətdə (o dünyada) Şeyxin ətəyindən tutub həmin beytləri şərh və bəyan etməyi ondan iltimas edəcəyəm.

Başqa bir «Xəmsə» müəllifi Məktəbi Şirazi öz «Leyli və Məcnun»unda Nizaminin mədhində deyir:

Dər qoftən-e «Xəmse»əm ke namist
Məqsud setayeşe Nizamist

«Xəmsə» deməyimdə – ki, məşhurdur,
Məqsədim Nizamiyə sitayiş [etməkdir]

Yuxarıda deyilənlərdən mə'lum olur ki, Mircəlal Zəkiyev necə ağır və çətin bir tərcümə yükünü çiyinlərinə götürmüş və fikrimizcə bu işin öhdəsindən məharətlə gəlmişdir.

Yazının sonunda bəlkə də ona həsəd aparmayan yeganə şair, Şeyxin müasiri olan Əsirəddin Əxsikəti tərəfindən Nizaminin mədhində deyilmiş iyirmi bir beytdən ibarət bir qəsidəni veririk.

Mircəlal Ağa fars dilində olan bu qəsidəni öz bəhrində–həzəci-müsəddəsi-əxrəbi-məqbuz-məhzuf (məf' Ulu məf Ailün fə Ulun) – qafiyə və rədifi saxlamaqla tərcümə etmişdir ki, onu ilk dəfə olaraq burada nəşr etməyi münasib bildik.



## BÖYÜK VƏ NƏZİRSİZ SÖZ USTASI NİZAMİ GƏNCƏVİNİN MƏDHİ

Ey türfə laçın balası elmin,
Pərvaz yerin fəzası elmin!
Bəsləndi Hüma qanadı üzrə,
Söz mülkün üçün ziyası elmin.
Söz çətr tək aləmi açandan,
Mövkib sənədir livası elmin.
Zehninlə sənin yarandı nurdan,
Zənn tacı, güman qəbası elmin.
Əqlin gözü həm sənin qapında,
Sürmə diləyən gədası elmin.
Tapdı atının tozu ləqəb həm,
Sorsan ki, nə? – Kimyası elmin.
Ayinə götür ki, ta nədir gör,
Nuru əqlin, səfası elmin.
Çərxin bu yamaqlı paltarın yırt,
Çiynində ikən əbası elmin!
Təb'in mehi məcməri ucundan,
Olmuş xürrəm həvası elmin.
İnlərdi, şəkər pay etməsəydin,
Tutisi sözün, nəvası elmin.
Ğeyb hüdhüdünə sən, ey Süleyman,
Söylə necədir Səbası elmin?!
Həmsüfrə mələklər ilə zehnin,
Ey zehninə «mərhəba!»sı elmin!
Görmədi qonaqsevən sənin tək,
Ev sahibi bu sərası elmin.
Elm ilə bir addım oldu,

Varlıq büsatı, fəzası elmin.
Söz şirləri təmam itindir,
Ey ahuyi-xoşədası elmin!
Sən tacına elmin əzm qıldın,
Layiq sənədir binası elmin.
Ləfzindən söz, hünər bağından,
Mişkindir əsən səbası elmin.
Bülbüllərin öz vücud bağın,
Lal eylədin, ey nəvası elmin!
Guya ki, gedir bu gün Məlikşəh!
Çətridir onun səması elmin!
Yəni kim? – O binəzir Nizami,
O payədə padişası elmin!
Ey zatı olan bilik vücudu!
Daim yaşa, ey bəqası elmin!

**Hacı Kaman NOVRUZ**
**15 mart 2006-cı il**



## MÜNDƏRİCAT

